*Bu kitab “**Əlişir Nəvai**. Fərhad və Şirin” (Bakı, Azərnəşr, 1968*) və *“**Əlişir Nəvai**. Yeddi səyyarə” (Bakı, Yazıçı, 1979) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərcümə edənlər: **Əlağa Vahid**
**Mirvarid Dilbazi**
**Məmməd Rahim**
**Nigar Rəfibəyli**
**Ələkbər Ziyatay**

Ön söz, şərhlər və lüğətin müəllifi: **Həmid Araslı**

**894.325 - dc 21**
**AZE**
**Əlişir Nəvai. Seçilmiş əsərləri**. Bakı, “Öndər nəşriyyat”, 2004, 424 səh.

Ümumtürk ədəbiyyatının Xoca Əhməd Yəsəvi, İmadəddin Nəsimi, Məhəmməd Füzuli kimi qüdrətli söz ustaları sırasında klassik özbək ədəbiyyatının banisi, dahi şair və mütəfəkkir Əlişir Nəvainin adı ehtiramla çəkilir. Dostu şair Əbdürrəhman Caminin məsləhəti ilə Nizami mövzularından ibarət yazdığı “Xəmsə”dən başqa çağatay türkcəsində müəllifin özünün “Xəzayinül-məani” adını verdiyi dörd divan, farsca divan və s. yaradan mütəfəkkir şairin əsərləri öz bədii-estetik keyfiyyətlərinə görə bütün Yaxın və Orta Şərqdə yayılmış, türk xalqlarının şairləri üçün uzun əsrlər boyu sənətkarlıq örnəyinə çevrilmişdir.

Bir dövlət xadimi kimi də böyük nüfuza malik olan Nəvai sənəti sevdiyi və yüksək dəyərləndirdiyi üçün bir çox sənətkarlara hamilik etmiş, mədəniyyətin hərtərəfli inkişafına çalışmışdır.

Azərbaycan xalqının görkəmli şəxsiyyətləri Nəvaiyə yüksək qiymət vermiş, onu öz doğma sənətkarları hesab etmişlər.

Bu kitaba böyük özbək şairinin “Xəmsə”sindən üçüncü poema – məşhur “Fərhad və Şirin” əsəri ilə yanaşı dördüncü – “Yeddi səyyarə” poemasından parçalar daxil edilmişdir.

**ISBN 9952-416-46-5**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## BÖYÜK ŞAİR

Əlişir Nəvai böyük özbək xalqının XV əsrdə yetirdiyi sənətkarlar içərisində şöhrət qazanıb, bütün Yaxın Şərq xalqları tərəfindən sevilən şair, alim, mütəfəkkir, bacarıqlı dövlət xadimi və mədəniyyət hamisi kimi təqdir edilən görkəmli şəxsiyyətdir

Həyatını xalqın səadəti uğrunda mübarizəyə sərf edib, yorulmaq bilmədən çalışan Əlişir Nəvai (1441–1501) XV əsrdə çiçəklənməkdə olan özbək mədəniyyətinin ən mühüm ədəbi abidələrini yaradan qüdrətli bir sənətkardır.

Hələ kiçik yaşlarından bir çox mühüm siyasi hadisələrin şahidi olan şair, məktəb yoldaşı Hüseyn Bayqaranın hakimiyyəti zamanı, dövlət vəzifəsində olduğu illərdə bütün imkanlardan istifadə edərək xalqın mənafeyi və mədəniyyətin inkişafı üçün çalışmışdır. Zəngin bir irsə malik olan Nəvai tamam gəlirini elm və mədəniyyətin inkişafına, məktəb və mədrəsələrin tikilməsinə və ehtiyacına sərf etmiş, bir sıra elmi əsərlərin yaranmasına imkan yaratmışdır. Öz xeyirxah məsləhətlərilə ölkənin siyasi qüdrətini möhkəmləndirməyə çalışan Nəvai, həyatı dəfələrlə təhlükədə olsa belə, yenə də əzmindən dönməyən bu alovlu vətənpərvər xüsusən özbək ədəbi dilinin əsaslanıb təkmilləşməsi uğrunda daha ciddi mübarizə aparıb, bu dili Yaxın Şərqdə ən görkəmli dillər səviyyəsində şöhrətləndirmişdir.

Nəvai sonsuz bir məhəbbətlə sevdiyi ana dilini himayə edib, bu dilin üstünlüklərini özünün "Mühakimətül-lüğəteyn" adlı kitabında elmi dəlillərlə sübut etdiyi kimi, həmin dildə cahanşümul əsərlər də yaratıışdır.

Nəvai Şərqin ən məşhur lirik şairlərinin əsərləri səviyyəsində duran qəzəlləri ilə bütün sələflərindən fərqlənmişdir. Onun "Xəzanül-məani" adlandırdığı, özbək dilində yaratdığı dörd divan bütün türk xalqlarının ədəbiyyatına qüvvətli təsir göstərmişdir. Təsadüfi deyildir ki, şair öz sənətkarlıq qüdrətini dərk edərək yazmışdır:

İstərsə ola bir, istərsə min bir,
Bütün türk elləri ancaq mənimdir.
Xətadən başlayıb Xorasanadək,
Ellər fərmanımla ömür sürəcək.
Şiraz da, Təbriz də mənim yerimdir,
Orda şöhrətlənən söz səngərimdir...
Hansı bir diyara fərman apardım,
Onu almaq üçün "divan" apardım.

Şairin ürəklər fəth edən söz orduları dahi sənətkarın xatirəsini də diri saxlamışdır. Nəvainin fars dilində yazdığı qəzəllər "Divani-Fani" adlı əsərində toplanmışdır.

Nəvai özünün "Məhbubil-qülub" adlı əsərilə özbək bədii nəsrinin əsasını qoymuşdur. "Məcalisün-nəfais" adlı təzkirəsində dövrünün şairləri haqqında qiymətli məlumat vermişdir. Dahi sənətkar "Xəmsə" müəllifləri sırasında hörmətli bir yer tuta bilmişdir.

Dahi sənətkar "Heyrətül-əbrar", "Fərhad və Şirin", "Leyli və Məcnun", "Səbeyi-səyyar" və "Səddi-İskəndəri" adlı görkəmli poemalarında özünün dərin siyasi, ictimai, fəlsəfi, əxlaqi fikirlərini canlandırmış, dövrünün qabaqcıl ideyalarını bu mənalı əsərlərdə əks etdirib özbək xalqının mənəvi qüdrətini tərənnüm edə bilmişdir. Bir sıra elmi əsərlər, tərcümələr müəllifi olan Nəvai, xüsusən "Xəmsə"yə daxil olan poemaları ilə özbək ədəbiyyatının ölməz abidələrini yaratmışdır.

Nəvai yaradıcılığında "Xəmsə" mühüm yer tutursa, "Xəmsə"yə daxil olan poemalar içərisində də "Fərhad və Şirin" mərkəzi əhəmiyyətə malik bir sənət əsəri olaraq nəzər-diqqəti cəlb edir.

Poemanın əsil qəhrəmanı Fərhaddır. Şair, bütün arzularını bu surətin mübarizəsində əks etdirib, bu ideal insanın faciəsində göstərir.

Fərhad surəti ədəbiyyatda Nəvai ilə başlamır. Hələ Nəvaidən üç əsr əvvəl yaşamış dahi Azərbaycan şairi Nizami Gəncəvi "Xosrov və Şirin" adlı poemasında əsərin əsas qəhrəmanı olan Xosrova qarşı duran əməkçi insan surəti olaraq Fərhadı seçmiş, ondan sonra Əmir Xosrov Dəhləvi, Arif Ərdəbili və Marağalı Əşrəf bu surəti dəfələrlə işləmişlər. Xüsusən XIV əsr Azərbaycan şairi Arif özünün "Fərhadnamə" adlı poemasında Fərhadı əvəzsiz bir sənətkar kimi təsvir etmişdir.

Lakin Nəvai bu surəti əsərin qəhrəmanı seçdiyi zaman bütün sələflərindən fərqlənir. Bu isə şairə öz zəngin fikirlərini ətraflı göstərmək üçün imkan yaratmışdır.

Nizaminin əməkçi insanlar sırasından seçib, sadə bir daşyonan olaraq göstərdiyi Fərhad əsərdə ikinci dərəcəli surətlərdən biridir. O, əsərə gec daxil olub, tez də məhv olur. Oxucu Fərhadı çox görmür, ancaq bu qısa tanışlıqla da Fərhad surəti əbədiləşdirilir. Şair onu unudulmaz mərkəzi surətlər səviyyəsinə qaldırır.

Nəvai isə Fərhadı bir şahzadə kimi göstərib onu naz-nemətlər içində böyütsə də şahlara, şahzadələrə xas səciyyəli şəxsiyyət kimi deyil, bəlkə, öz arzularını ifadə edən ideal bir insan kimi canlandırır. Şair, özünün bu ideal surətində bütün müsbət xüsusiyyətləri toplayır. Fərhad, hər şeydən əvvəl

əməyi sevir, ona hörmət bəsləyir. Onun ilk mühüm məziyyəti tişə və gülüng işlətməyi sevməsində və bacarmasında görülür, Fərhadın əməyə olan məhəbbəti onun əməkçi insanlara olan məhəbbətinin əsasını təşkil edir. O həmişə əməkçi xalqı düşünür, onun ağır həyatına ürəyi yanır. Öz məharətilə xalqının əməyini yüngülləşdirməyə çalışır və müvəffəq də olur.

Fərhad ağır zəhmət ilə arx qazıyıb sərt qayalar döşündən yol açmaq istəyən çamaatı gördükdə kədərlənir:

Fərhad bu zəhməti, bu əziyyəti
Görüncə kəsildi səbri, taqəti.
Qəm, kədər yağaraq baxışlarından
Bu dəstə içinə qarışdı haman.
Dedi: – Ey mən kimi bəla çəkənlər,
Fələkdən qəlbiniz olmuş mükəddər...
Görüb halınızı qəlbim alışdı.
Alovu, tüstüsü başımdan aşdı.

O, xalqı əzabdan qurtarıb arxı təkbaşına çəkir. Nəticə etibarilə bu arx yanıq çöllərə can verir:

Bu zaman çağladı sel kimi gur su,
Baş alıb yeridi saraya doğru...
Sarayın başına vuraraq dövrə,
Axdı can verməyə yanıq çöllərə.

Fərhad eyni zamanda cəsur bir igid, səadət düşməni olan əjdahalar və əhrimənlərlə vuruşan bir mübarizdir.

Nəvai, qəhrəmanının döyüş səhnələrini təsvir edəndə, onun ox atmaqdakı məharətini, qılınc vurmaqdakı şücaətini göstərəndə ürəkdən sevinir. Xüsusən Xosrov orduları qarşısında əyilməz dağ vüqarı ilə dayanan dağçapanı qalibiyyət rəmzi kimi dalğalandırır. Bu qüdrət, qüvvət və cəsarət ilə şöhrətlənən qəhrəman həm də saf məhəbbətlə sevən sadiq və fədakar bir aşiqdir.

Lakin Fərhad bütün bu qüdrət və əzəmətilə bərabər sadədildir, həddindən artıq insanpərvərdir. Əhrimənlərə qalib gəlib, əjdahalar öldürən qəhrəman öz sadəliyi üzündən aciz bir hiyləgərin əlində məğlub olur, Fərhad imkan olduğu halda, öz düşməni Xosrovu öldürmür. Zindandan qaça bilmək imka-

nına malik olduğu halda, qaçmır, gözətçilərin cəzalanacağını nəzərə alır, öz xeyri üçün bir çox günahsızların məhv olmasına razı olmur. O, həddindən artıq şikayətlənir, hər zaman özünə cəfa verir.

Bütün bunlar onun məhv olmasına səbəb olur.

Nəvai Şirin surətini də maraqlı işləmişdir. Nizamidə Şirin qiyabi bir məhəbbətə tutulur, ölənə qədər Xosrova sadiq bir məşuqə olmaqla bərabər, ədalətli bir şah, bir hökmdar kimi də göstərilir. Nəvai Şirini tam mənası ilə Fərhadı sevən bir məşuqə, sadiq, vəfalı və fədakar bir məşuqə olaraq tərənnüm edir.

Şirin, hünərini gördüyü Fərhadı sevdikdən sonra bu məhəbbəti həyatı bahasına qoruyur. Adsız, sansız, lakin qüdrətli bir sevgilini hamıya tərcih edir. Böyük bir ölkənin hökmdarı olan Xosrovun məhəbbətini rədd edir. O, var-dövlət, şan-şövkət istəmir, həqiqi məhəbbəti hər şeydən üstün tutub, bu məhəbbət uğrunda da intihar edir.

Nəvai, dərin bir məhəbbətlə sevdiyi Şirinin daxili iztirablarını bacarıqla təsvir edib, bu vəfalı məşuqənin xarici gözəlliyi ilə mənəvi yüksəkliyini eyni səviyyədə göstərir. Xüsusən intihar fəslində Şirin tədbirli bir qadın kimi nəzər, diqqəti cəlb edir.

Əsərdə Şapur və Bəhram surətləri bir-birlərini tamamlayan yaxşı dost, vəfalı sirdaş olaraq göstərilir. Bu həqiqi dostlar qəhrəmana qardaşdan da yaxındırlar.

Fərhadın atası öldükdən sonra xaqan olan qardaşı Fərhadı axtarmır, bəlkə, öz şahlığından nigaran olub, onun gəlib taxt və tacı alacağı haqqında fikirləşir. Bəhramdan da ehtiyat etdiyi üçün onun getməsinə icazə verir. Lakin Şapur Fərhada təsadüf etdiyi ilk gündən etibarən ölənə qədər ona kömək edir. Onun şad günündə sevinir, qəmli dəqiqələrində kədərlənir. Heç bir təmənnası olmadan Fərhadın yolunda olmazın əziyyətlər çəkir. Dəfələrlə həyatını təhlükəyə atır.

Bəhram da eyni yolla hərəkət edir. O, uşaqlıq dostu Fərhadın Məğrib-Zəmində fəlakətə düşdüyünü eşidən kimi, ordu toplayıb onun köməyinə gəlir. Dostunun faciəsini eşidib müqəssirlərə divan tutmaq istəyir. Hər işi öz yoluna qoyduqdan sonra dostunun qəbri üzərində qalıb, geri qayıtmır.

"Fərhad və Şirin" əsərində müsbət surətlərə qarşı qoyulan əsas mənfi şəxsiyyət Xosrovdur.

Xosrov Pərviz əsərdə yeganə tarixi simadır. Nizami poemasının əsas qəhrəmanı olub, əsər boyu məhəbbətin təsiri ilə tərbiyə edilən bu surət Nəvai tərəfindən məhəbbətə yabançı, şöhrət və şəhvət düşkünü, azğın bir istilaçı kimi göstərilir. Nəvai, Xosrov simasında zülmkar bir şah surəti yara-

dıb, şahlığın mənfi xüsusiyyətlərini onun şəxsiyyətində göstərməyə çalışmışdır.

Hələ ilk tanışlıqda Xosrovu:

Bu məlumdur eşqə tutulanlara,
Tacidarlıq hara, məhəbbət hara?

– deyə oxuculara təqdim edən şair onun yürüş bəhsini saqiyə müraciətlə belə bitirir:

Saqi, piyalə tut, məst olaq, inan,
Bir içim mey xoşdur padşahlıqdan.
Ver içim gəlməsin şahlıq gözümə,
Xalqa zülm edincə, edim özümə.

Elə təkcə bu misralar şairin zülmkar şahlara olan münasibətini müəyyənləşdirir.

Nəvai, Xosrovu dəfələrlə Fərhadla qarşılaşdırır, oxucu bu müqayisədə Xosrovun mənəvi düşkünlüyü ilə tanış olur.

Fərhad şücaəti, mənəvi qüdrəti, hətta xarici görkəmi ilə Xosrovdan qat-qat üstün göstərilir. Xosrov onu vuruş meydanında mərd-mərdana məğlub etməkdən aciz qalıb, hiyləyə müraciət edir. Hiylə ilə əsir aldığı Fərhadın kəskin cavabları və haqlı tələbləri önündə özünü itirir, onu dar ağacı ilə susdurmaq istəyir.

Özünün haqsız olduğunu dəfələrlə dərk edən Xosrov, şöhrət və şəhvət təhrikilə öz cinayətlərini dərinləşdirməyə çalışır. Fərhadı ortadan götürmək üçün tədbirlər görür.

Şair yeri gəldikcə şahlığın mənfi xüsusiyyətlərini Xosrova münasibətində göstərir. O, bütün şər qüvvələri Xosrovun xidmətinə verir. Büzürgümmid və satqın, xain, tamahkar, hiyləgər qarı ona kömək edib, Fərhadı məhv edirlər.

Nəvai göstərir ki, əjdahalarla vuruşub əhrimənləri məhv edən, tilsimlər açıb səadət və xoşbəxtlik yollarını aydınlaşdıran Fərhad, öz əməyi ilə dağlara lərzə salan qəhrəman, hiylə və haqsızlıq əlində məhv olur.

O eyni zamanda Xosrovun aqibəti ilə zülmün və haqsızlığın mükafatını da göstərir. Fərhadın intiqamını zaman alır, Xosrov öz doğma oğlunun əlində həlak olur.

"Fərhad və Şirin" əsərinin fəlsəfi mənası daha dərindir. Əsərdə Fərhad surəti həqiqi insan timsalıdır. İnsan bütün varlığın əşrəfi, hökmdarı doğul-

muşdur. Onda tükənməz energi, sonsuz bir maraq, dərin məhəbbət, bacarıq, qüvvət və qüdrət vardır.

O, sadəcə elmləri bilmək, ox atmaq və qılınc oynatmaqla kifayətlənmir, bəlkə, yer üzündə fəsilləri təmsil edən qəsrlər, bağlar yaradır, daşa-torpağa can verir.

Mənəviyyatı etibarilə yüksək olan bu insan, əhrimənlərlə vuruşub qələbə çalır, bilik rəmzi olan Xızrın təlimilə tilsimlər açıb, hikmət atası Sokratın təlimi ilə dünya rəmzi olan qəribə güzgünün sirlərini öyrənə bilir. O, adi mənasından çox yüksəkdə duran bir məhəbbətin gücü ilə dağlara lərzə salır, su görməz quru torpaqlara həyat suyu kimi can verən arx çəkir, adi qayadan xəyali cənnət qəsri qədər gözəl qəsr yaradır. Lakin o öz məqsədlərinə nail ola bilmir.

Belə bir qüdrəti, əhrimənlərə qələbə çalıb, ordulara müqavimət göstərəcək insanı ən kiçik bir hiylə məhv edir.

"Fərhad və Şirin" əsərinin sonunda nəsihət bəhsində Nəvai yalnız şahzadəyə deyil, bütün gəncliyə müraciət edir, onları elm və maarifə çağırır. Zəmanəsinin ayrı-ayrı elmləri haqqında söhbət açan sənətkar, xüsusən tarixdən ibrət almağı lazım bilir. O, "günəş olmaq üçün kəsb kamal et", "təlim görməkdən, öyrənməkdən yorulma!" deyir. Şair göstərir ki:

Hər kim ki, təlimdən məlalət tapar,
Alimlər yanında xəcalət tapar,
Bilik qazanmaqda qane olma sən,
Öyrəndikcə oxu, yenə də öyrən!

Nəvai göstərir ki, təlim heyvanı belə həmçinslərindən fərqləndirir. Tutuquşu nöqtədən xəbər tutduğu üçün "şah tuti" adlanır. Ancaq tovuz quşunun hətta başında cığası da var, lakin ona şah demirlər.

O, tarixdən misal gətirir. Özbək hökmdarlarından məşhur münəccim Uluğbəyi nümunə göstərir. "O nəsildən nə qədər hökmdar gəlib-gedibdirsə də, heç kəs onları xatırlamır, lakin Uluğbəyi "eyni zamanda alim olduqundan tikdirdiyi rəsədxana, elmi-nücuma dair yazdığı "Zeyc-Gürkani" adlı əsər dünya durduqca yaşadacaqdır", deyir.

Şairin bu nəsihətləri də əsərin əsas ideyası ilə bağlıdır. Onun qəhrəmanı hələ uşaqlıqdan hər şeyi bilməyə həvəsli olub, bütün elmləri inadla öyrəndiyi üçün zəhmətə qatlanıb qələm, külüng və qılınc işlətməyi, ox atmağı, at oynatmağı bacardığı üçün bütün müasirlərindən seçilib hamının hüsn-rəğbətini qazanır.

Bilik ona qüdrət və əzəmət verdiyi kimi həqiqi insan sifətləri ilə də şöhrətlənməsinə səbəb olur.

Əsərin sənətkarlıq xüsusiyyətləri də ayrıca tədqiqə möhtacdır. Nəvai hər hadisəni yeni bir sərlövhə altında verir və onu, klassik üsluba riayət edərək bəhs olunacaq hadisəyə uyğun bədii ifadələr seçərək başlayır. Müəyyən əhvalatı söylədikdən sonra şair, bəhsi saqiyə müraciətlə bitirir. Lakin bu müraciət həmin bəhsi gələcək bəhslə bağlamağa yardım edir. Nəvaiyə qədər poema yazan şairlər hər bəhsi saqiyə müraciətlə başladıqları zaman, bəhsin əsas ruhunu bu saqinamədə canlandırırdılar. Nəvai isə bu müraciəti hər bəhsin sonuna salmaqla bəhsləri ustalıqla əlaqələndirir. Bu müraciət birinci bəhsin yekunu, gələcək bəhsin isə müqəddiməsi olur.

Əsərdə təbiət təsvirləri də nəzəri cəlb edir. Nəvai tez-tez səhərin açılmasını, günəşin çıxmasını, yazda təbiətin oyanmasını, demək olar, bütün fəsilləri təsvir edir. Xüsusən əsərdə axşam və səhərin təsvirinə daha çox təsadüf olunur. Ancaq şair bu təsvirləri hər zaman bəhs etdiyi hadisəyə uyğun bədii ifadələr taparaq canlandırır.

O bəzən insan vəziyyətini təsvir edəndə onun daxili aləmi ilə həmahəng məna verəcək sözlər seçir. Məsələn: Şirinin Fərhada yazdığı məktub tutulub Xosrova verilərkən onun məktub oxuması belə təsvir olunur.

Məktubu hökmdar əlinə aldı,
Qələm tək başını aşağı saldı.

Burada məktub oxuyanın, eyni zamanda xəcalətli adamın vəziyyəti çox məharətlə göstərilir.

Poemanın bütün səhifələrində təsadüf olunan bu xüsusiyyət onun ümümi gözəlliyi ilə həmahəng olduğundan, əsər bütünlüklə bir sənət nümunəsi olaraq oxucunu heyran edir.

"Yeddi səyyarə" (Səbeyi-səyyar) poeması Nəvainin Nizami mövzusunda yazdığı dördüncü əsərdir. Əsər 1484-cü ildə tamamlanmışdır. Bu əsər Nizaminin "Həft peykər" ("Yeddi gözəl") poeması mövzusundadır.

Əsərin kompozisiyası və mövzusu "Həft peykər" təsirində olsa da, süjeti tam mənası ilə ayrı bir xətt ilə inkişaf edir.

Hər iki əsər əruzun xəfif bəhrində yazılmışdır.

Nəvai əsərin müqəddiməsində Nizamidən danışıb onun qüdrətini alqışlayır.

Nəvai bu poemasında Bəhramı bir qəhrəman olaraq qələmə alır. O, əsərin müqəddiməsində Nizami "Həft peykər"inin qısaca məzmununu verib öz hekayəsinə keçir.

Nizami bütün poemalarda olduğu kimi burada da öz qəhrəmanının anadan olduğu gündən ölən günə qədərki həyatını təsvir edirsə Nəvai onun şahlıq dövründən başlayır.

Nizamidə təsvir edilən ov səhnələri Bəhramın şahlığı əldə etmək üçün göstərdiyi qəhrəmanlıqlar, onun şahlıq günləri, Simnarın faciəsi, Rast-Rovşən obrazı, zindan, çobanla görüş və s. hissələri Nəvaidə yoxdur.

Nəvai Nizamidə olan Fitnə hadisəsini genişləndirib Bəhramı bir şah obrazı kimi təqdim edir. Mani vasitəsilə şəklini görüb sevdiyi Dilaramı gətirən Bəhram bu Çin gözəlinin musiqisinə uyub ölkə işini unudur. O, bir gün ovda Dilaramın onun məharətini qiymətləndirməyib "adətdir" dediyi üçün ona qəzəb edir (Fitnə – Bəhram hadisəsi kimi).

Lakin sonra onun eşqilə dərdə düşüb ölkəni idarə edə bilməz vəziyyətə gəlir. Xəstəliyinə müalicə üçün yeddi qəsr tikdirib onu yeddi ölkənin gözəl şahzadələri ilə evləndirirlər. Bu saraylara gedərkən hər sarayda olan qızın ölkəsindən gəlmiş səyyah Bəhrama bir nağıl söyləyir. Son nağılda şah özünün Dilaramla olan macərasını dinləyir və sevgilisinin Xarəzmdə olduğunu bilib onunla evlənir.

Burada bir süjetin eşq ətrafında qurulduğunu və obrazlara qarşı münasibətin dəyişildiyini də görürük.

Nizaminin Fitnə obrazı, özünün haqlı olduğunu sübut edir.

Fitnənin məharətini "adətdir" deyə qiymətləndirməyən şah – "ov vurmaq adət deyil, öküz qaldırmaq adətdir" cavabını alırsa, Nəvaidə belə maraqlı qarşılaşma yoxdur.

Nizamidə nağıllar qızlar tərəfindən söylənilir, Nəvaidə isə səyyahlar tərəfindən. Nizami nağılları Azərbaycan həyatından alındığı kimi Nəvai nağılları da özbək xalqının həyatından alınmış orijinal süjetli şirin novellalardır. Nizamidə olduğu kimi Nəvai əsərindəki nağıllarda da mərdlik, cəsarət və sədaqət kimi bəşəri arzular ifadə edilir.

Nəvai irsi Azərbaycan xalqı tərəfindən hələ XV əsrdən etibarən oxunur, sevilir. Əsrlərdən bəri xalqımız Nəvaini öz şairləri sırasında bilir. Hələ onun müasiri Kişvəri, Xülqi kimi lirik şairlər Nəvainin təsiri altında əsərlər yazmışlar. Böyük Füzuli də öz "Leyli və Məcnun" əsərinin müqəddiməsində onun adını Nizami və Əbunüvas kimi Şərqin dahi sənətkarları sırasında çəkmişdir. M.F.Axundov məqalələrində Nəvaini ağıllı dövlət xadimi kimi xatırlamışdır.

Azərbaycan təzkirəçilərindən Sadiq bəy Əfşar öz "Məcməül-xəvas" adlı əsərini Nəvainin tərifi ilə başlayıb, onun əsəri üslubunda qurmuşdur.

Nəvainin anadan olmasının hicri tarixdə 500 illiyi hələ 1926-cı ildə Bakıda təntənə ilə keçirilmişdir. Şairin haqqında məqalələr yazılmış, "Müntəat" və

“Vəqfiyyə” adlı əsərləri ilk dəfə Bakıda çap olunmuşdur. Bu zaman Hüseyn Bayqara “Divan”ı da ilk dəfə nəşr edilmişdir.

Azərnəşr hələ 1948-ci ildə şairin “Fərhad və Şirin” poemasının (minacat və nət hissələri ixtisarla) Azərbaycan dilində çap etmiş, Uşaqgəncnəşr onun “Sabeyi-səyyar” əsərindən parçaları oxuculara çatdırmışdır.

Biz Azərbaycan dilində yazılan ilk dərsliklərdən Nəvai şerlərinin çap olunub onun tərcümeyi-halının öyrənildiyini görürük. Azərbaycan xalqı qardaş özbək xalqının dahi oğlu Nəvainin qiymətli irsini öz doğma sənətkarlarının irsi kimi hörmətlə öyrənir.

***Həmid Araslı***

## QƏLƏMİN TƏRİFİ, NİZAMİ VƏ XOSROV DƏHLƏVİNİN XATIRLANMASI

Qələmdir yel kimi sürətlə gedən,
Əzəldən yüksəkdir yeri fələkdən,
Vəhmin ədhəmindən daha tez çapar,
Onun Şəbdiz kimi bir sürəti var.
Minmişdir üstünə şahanə barmaq,
Buğum belbağıdır, üzüdür dırnaq,
Quyruğunu edər çapanda ələm,
Ayağından etmiş başını qələm.
Şəbdiz demə, o bir quşdur xoşavaz.
Qanadsız eyləyər hər yana pərvaz.
Şəvədir dimdiyi, hər yerdə zahir,
Saçar o şəvədən daim cavahir.
Quşda ola bilməz o gözəl cisim;
Yaratmışdır tanrı onu bir tilsim.
Xəstəlik çəkməmiş o zəif bədən,
Yüz-yüz məna saçar xəznəsi birdən.
Yalnız bu xəznədən almışdır kami,
O Gəncədə yatan böyük Nizami.
Gəncədə olsa da aramı onun,
Xəznələr üstədir məqamı onun.
Ağız qapıları səs eyləmədən
Könül xəznəsini eylədi mədən.
O mədənə qapı-iki dodağı,
Bir kəsin dəyməsin ora ayağı.
O hikmət memarı söz yaradırkən,
Daş atan yaratmış onu əzəldən.
Kimin oğurluğu edilərsə faş,
Fələklərdən yağar başına min daş.
Yağdırar daşları hər yan aşkara,
Dostu gövhər tapar, düşməni xara!
O, daş atmaq üçün xəznəni açmaz,
Açsa xəznəsini nə gövhər saçmaz!
Tutub gövhərləri bütün cahanı,
Necə ki, ulduzlar bu asimanı.
Bu qiymətli gövhər enməz torpağa,

Əskilməz şöhrəti düşməz ayağa.
Elə inci hanı, saçarkən işıq,
Bütün qulaqlara versin yaraşıq?
Yox! Onu sadəcə bir zinət sanma.
Qulaqdan kənarda qalsın-inanma.
Qulaqda bu dürrlər edərsə məskən,
Könüllər dürcünü eyləyər məxzən.
Könül dürcü dolsa, bu dürdən nolar.
Dəryalara töksən, dəryalar dolar.
Bu kandan daşısan əgər qış və yaz,
Yenə də gövhəri, dürrü qurtarmaz.
Kimsə onun kimi saçmamış gövhər,
Yalnız bir hind oğlu saçmışdır şəkər.
Hindli yox, tutidən dili şirindir,
Tuti nə, bülbüldən eşqi dərindir.
Sözləri tuti tək tutmuş dünyanı.
Bülbül tək göylərə yetmiş fəğanı.
Ona yaşıl paltar geydirmiş sözü,
Tuti yox, bəlkə də, Xızrdır özü,
Hindistan olmuşdur onun zülmatı,
Axıçı sözlərdir abi-həyatı.
Əgər bülbül desən-yeri Hindistan.
Zülmət gecə desən-bir ənbərfəşan.
Bu gecə yatmayan, nalan bülbüldür,
Şəbistanda fəryad salan bülbüldür.
Ona bülbül demə, qəqnusdur ol zar,
Səsindən qəqnuslar durmadan ağlar,
Qəqnuslar çəksə də yüz nalə hər an,
Onda min nalə var könül yandıran.
Ahına ox demə, şimşək tək çaxar.
Balıqdan aya tək yandırıb yaxar.
Hər dəm şölə salar can xərməninə,
Özü yox, aləm də yanar qəminə.
Məna dəryasında saçar dalğalar,
Doqquz fələk onun altında qalar.
Şeri söz sapına inci tək düzər.
O dürrlər fələkin bəhri öyünər.
Yaz buludu kimi o xətt, o əşar.

Ellərin başına gövhərlər saçar.
Bir dürrdür o bulud gövhərlər ara,
Neysan buludu da onun tək qara.
Ona qara demə, müşkü ənbərdir,
Hər bir qətrə saçar ondan təzə dürr.
O dürrün tərifi sığmaz heç sözə,
O qədər zərifdir, görünməz gözə,
Dili dürrlər saçan gövhərlər tacı,
Qarşısında heçdir ölkə xəracı.
Gövhər yox, mədəndir o fəzlə, elmə,
Mənalar dağına sən mədən demə.
Buluddan qorxmayan dağ deyilsə gər,
Bəs nədən qaldırmış fələyə xəncər?
Bu meydanda sanma asandır durmaq,
Nizamilə pəncə-pəncəyə vurmaq.
Nizamiyə pəncə uzatsa hər kəs,
Qırılar pəncəsi, murada yetməz.
Şir pəncəsi gərək şirlə edə cəng,
Bari şir olmasa, qoy olsun pələng.
Yığılsa bir yerə çaqqalın yüzü,
Tüpürcəyə layiq onların üzü.
Qorxmazsa küləkdən dərin dəryalar,
Yel onun bağrını min yerdən yarar.
Şiddətli küləkdən coşar dənizlər,
Hər külək dənizə eyləməz əsər.
Nizami bir fildir, yox bərabəri,
Söz incisi ondan aldı dəyəri.
Fil olmaq gərəkdir, şübhə yox buna,
Fil salar xortumu fil xortumuna.
Xortumlu olsa da ağcaqanadlar,
Xalqa nəştər ilə verər min azar.
Fil öz xortumunu sürtəndə hər dəm,
Olur yarasına yüz minin mərhəm.
Ulu filə olub hindli müqabil,
Kiçik də olsa o, fil adlanır, fil.
Kiçik görünsə də xalqa nişanı,
Hind meşəsi olmuş onun məkanı.
Neysan buludundan bu fil qorunar.

Əyninə geymişdir göy rəngli paltar
Gəl, bu iki fili, allahpərəst et,
Rəhmət şərabından onları məst et.
Nəvaiyə dəxi şövkət əta qıl.
İki fildən ona qüvvət əta qıl.
İki fil tək onda məharət olsun,
Bəlkə, qızmış fil tək cəsarət olsun.
Tapsın sərxoş olmaq peşəsini o,
Ələ alsın sözün meşəsini o.
Gəl, ey saqi, canım gəlibdir coşa,
Bu iki xatirə qədəh ver qoşa!
Onların eşqilə içim iki cam,
Caminin mədhinə başlayım kəlam.

## DASTANIN YAZILMASI SƏBƏBLƏRİ

Sehr yaradarkən hoqqabaz fələk,
Hər vücuda verər min cürə bəzək,
Biri gözəl olar, biri eybəcər,
Biri sevilməyib, biri sevilər.
Başlanğıc işini tapmaqdır mahal,
Könül dəftərinə girməz bu xəyal.
İbtidayə çatmaq deyildir mümkün,
Bu söz gizlin deyil yanında əqlin.
Hər şey səbəblidir, düşünsən bir az,
Dünyada səbəbsiz bir iş yaranmaz
Məndə bu təmənna olanda peyda,
Onun şövqi etdi könlümü şeyda.
Canımı incilər xəyalı aldı,
Sahili olmayan dəryaya saldı.
Əmr etdi hörümçək toru yumaxla,
Onunla fələyin bürcünü bağla.
Bu bəla dağına girişəm gərək,
Qaqumla sərt dağı mən eşəm gərək.
Nəsrin yarpağına qələm çəkərək,
Fərhadla Şirini əks edəm gərək.

Geniş bir təfəkkür lazımdır, inan,
Yüzlərcə gül dərsin quru tikandan.
Vermək lazım idi bu işə təğyir
Ki, ürəklər açsın çəkdiyim təsvir.
Bir sevgi bəlası baisdir buna,
Qüvvət aldım, düşcək eşqin oduna.
Onun tərifində dilim olub lal,
Qoy qələm diliylə şərh edim əhval.
O həzin canıma verdi bir bəla.
Eşqdən başıma gəldi min həva,
Bir ov eşqi çəkdi sinəmə yüz dağ,
Yüksəltdi qəm daşı üstümə min dağ.
Zülm odu yandırdı xəstə canımı,
Qaraltdı tüstülər xanimanımı,
O, bir ov deyildi – qan içən cəllad,
Pəri üzlü divdi, zalım pərizad,
Gözünün küfründən yüz cana afət,
Din mülkunü edər kirpiyi qarət.
Zülm ordusu ilə hücum edərkən,
Dünyanın mülkündən qoparar şivən.
Könül xəznəsinə gözü salar şər,
Kirpiyi səbr ilə əqli süpürər.
Salıbdır aləmə hər yanda qovğa,
Təngə gəlmiş onun əlindən dünya,
Firənglər də edib zülmdən fəğan,
Zülmü olub Çində, Xətadə əyan.
Şəfəq rəngli meyə o, əl uzatdı,
Günəşin camını alıb boşaltdı.
O, ellər qətlinə olmuşdu mayil,
Əcəl tiği kəfən eylər həmayil.
O yel yerişilə bağlayarsa bel,
Fələyin çölündə əsdirər min yel.
Ərkövün gözəldir, əql huş alar,
Bir az o pərinin dəliliyi var.
Eşqi mən yazığı, ildırım sayaq,
O afət oduna yandırar ancaq.
Fələk zülm etmişdir mən mübtəlayə,

Düçar etmiş məni elə bəlayə.
Dərd ilə könlümü etmişdir məhzun,
Bu dərdi çəkməmiş aləmdə Məcnun.
Könlümü uçurdu möhnət quşları,
Yağar üstümüzə tənə daşları.
Sevda çəkmiş məni qəm səhrasına,
Bəlalara salmış, qəm demə ona.
Nə dərdli könlümə vəsli müyəssər.
Nə ayrılıq odu söndü, müxtəsər,
Sevgi qorxuludur, qəm saçar əcəl,
Bunlardan betərdir o rəna gözəl.
Naəhl ilə dostdur, vəfasızla xoş,
Vəfalilə olur həmişə naxoş.
Göz yaşına mələk həsrətlər çəkər,
O pəri divlərçin göz yaşı tökər.
Eşqində göz yaşım gövhərlər saçar,
O daim bədgövhər ardınca qaçar.
Özü tovuzdan da gözəl bir quşdur,
Heyf ki, yoldaşı o şum bayquşdur.
Məni dərdə salan hərcayi dilbər,
Gecələr ay kimi dünyanı gəzər.
Məni dərdə, qəmə etmişdir aşiq,
Özü hər məclisə şamtək yaraşıq.
Ulduz tək səbrimi alan məhpara,
Gecə kimi etmiş günümü qara.
İşim ki, olmuşdur müşkül bu qədər
Yəqinlik üz verdi mənə müxtəsər,
Hikmətlə düşünüb tapsam bir çara,
Gərəkdir əl çəkəm candan, aşkara.
Xoşdur eşq əhlinə verəsən könul,
Çara tap, yar əgər hal ahli deyil.
Ağlımı, huşumu qəm qarət etdi,
Nagahan hatifdən bir səda yetdi:
“Ey, tənə güçüylə bükülən beli,
Gözündən axıdan dərdü qəm seli.
Əvvəllər qələmi ələ alarkən,
Samını sünbülə döndərərdin sən:

Gedərdin Xızrtək gizlin zülmata,
Xalqı qərq edərdin abi-həyata.
Cənnət bəzəkli bir saray ucaltdın,
“Heyrətül-əbrar” tək əsər yaratdın:
Sən aləmə saçdın qiymətli gövhər:
Eşitdin mələkdən min afərinlər:
Çox zəhmət sərf etdin əgərçi buna,
Gör nə xəznə tapdın, gəlib baxsana!
Kimdir bir neçə gün zəhmət çəkərək,
Qiymətli bir xəznə tapsın sənin tək?
Onda min inci var gün tək alışan,
İnçi deyil, bəlkə, ləli-Bədəxşan,
Önündə qızıldır zırnıqdan alçaq,
Yanında gümüş də bir qara torpaq.
Balıqdan aya tək işığı tutub.
Şahanə xəznəni nəqdi unudub.
Bir sənəm tapmısan gümüş bədənli,
O ki, fərq eləməz kəsəkdən ləli.
Gah onu səslərsən: “Ey gümüş bədən!”
“Ay üzlü sərvnaz” söylərsən hərdən.
Səcdə etdin ona, haqqı itirdin,
Ahını eşqində çərxə yetirdin,
Bu dünyada səni o eyləmiş zar,
Qiyamətdə edər dərdə giriftar,
Dinin, dünyan olub cəhalətdə heç,
Cahillik eyləmə, gəl cəhlidən keç!
Bütü burax, iman xəzinəsi tap!
Cəhli burax, ürfan xəzinəsi tap!
Bütü qırıb, küfrü sovursan axir
Müsəlman olarsan, olsan da kafir,
Viranəliklərə qədəmini at,
Yeni bir xəznəyçin əlini uzat.
Qazımağa başla yeni bir mədən,
Naqdını bağışla dostlarına sən.
Mədəni tapmağı kim etsə peşə,
Əlində gəzdirər dağyaran tişə.
Mədən qazımağa kər etsən rəğbət,

Olarsan Fərhadla yaxşı həmsöhbət.
Bu mədən eşqində daş çapsan, tişən
Kütləşsə, Fərhadın daşına çək sən.
Durub Fərhad ilə verin əl-ələ,
Qart daşlar canına salın zəlzələ.
Bu işdə nə danış, nə bir ləhzə dur.
Mətanət üstündə mətanəti qur.
Çox əziyyət çəkib öldüsə Fərhad,
Sənə xəznə vermiş tanrı, gör ol şad.
Tapdın bu xəznədən gözəl məişət,
Çəkmə sən Fərhad tək dünyada zillət.
Fərhadın işini gəl eylə şirin,
Tapasan dünyada bir elə Şirin.
Gözəlin Şirinlə gər olsa həmdəm,
Onda şirinliyi heç olarmı kəm?
Könlünü ovlayan o xəznə yenə,
Məna xəzinəsi bəxş etdi sənə,
Tapdın o xəznənin beşdə birini,
İkinci xəznənin gör tədbirini.
Səndən tələb gərək, bizdən hidayət,
Səndən gədalıqdır, bizdən inayət".
Elə ki, hatifdən bunu eşitdim,
Özümdən özgə cür oldu ümidim.
Sevda fitvasını eyləyib kənar,
Pirin dərgahına üz qoydum ağlar,
Ağlaya-ağlaya düşdüm torpağa,
Nurlandı gözlərim, döndü çırağa.
Ərz edərkən, məni xəcalət aldı,
Cəlalı canıma titrətmə saldı.
O, dünya günəşi torpaqda mənim,
Gördü, civə kimi əsir bədənim,
Gülüb səhər kimi şəfəq göstərdi,
Qəmimin şamını sübhə döndərdi.
Dedi: – "halın nədir, bir-bir söylə sən?"
Cavab aldı hər bir suala məndən.
O mənim halıma olanda vaqif,
Özü oldu mənə ikinci hatif.

Birinci hatif nə hökm etdi durdu, –
İkinci hatif də onu buyurdu.
Onun pak nəfəsi xoş gəldi mənə
Xeyirlər, dualar istədim yenə.
Söylərkən İsatək, o öz kəlamin,
Duasına dedi mələklər amin.
İcabət özüydü, deyildi dua,
Duaydı, icabət qarışmış ona.
Elə ki, o, dövlət nişanı saçdı,
Məna qapısını üzümə açdı.
O bəhrəli bulud, qara torpağa
Başladı incilə dürr yağdırmağa,
O qədər yağdı ki, dənizlə, mədən
Tutmadı bunları, keçdi fələkdən.
Mən bir torpaq ikən göylərə yetdim,
Yer öpüb, oradan evimə getdim.
Saqi, qədəh gətir xəlvətdə bir dəm,
Cəld ol, qapını da tez bağla möhkəm,
Camidən almışıq arzunu, kamı,
Onun xatirinə ver bizə camı,
İçək, göy altında torpaq olmadan,
Cənnətdə bir quru budaq olmadan.

## ƏSƏRİN MƏXƏZLƏRİ

Bəxtimin ulduzu parlaq nur saçdı
Mənə yüksəklərdə bir büsat açdı.
Ulduzu göz yaşı edəndə fələk,
Süpürmüş o yeri pərilə mələk.
Onun səqfi idi o əyilmiş tağ,
Çərx olmuşdu ona atlas bir otaq.
Gecə məcmər idi, ay isə udu,
Ulduz – qığılcımı, günəş də odu.
Xoşdur bu məclisdə mənə əylənmək,
Sürtər ayağıma üzünü fələk,
Vərəqimdən alar səfanı səhər,

Gecə qələmimdən rəng alıb gəzər.
Yazı yazmaq üçün yonarkən qələm,
Yontusunu yığdı Utarid o dəm.
Qələm etməmişkən yazıya adət,
Qapımdan içəri girdi səadət.
Şən üzlə eylədi dünyaları şad,
Məni təbrik edib, o eylədi yad:
“Nə arzun var onu tanrı yetirsin,
Uğruna sevdiyin şeyi gətirsin.
Fələk kimi yüksək himmət, bax budur.
Günəş kimi yeni niyyət, bax budur,
Bu himmətə alın surtər fələklər,
Günəş bu niyyətə afərin deyər.
Gözünü ən uca eyvana saldın,
Böyük bir təpənin torpağın aldın.
Görüm qızıl olsun tutduğun torpağ.
Səpdiyin qətrələr incitək parlaq,
Himmət məclisində hər kim içsə cam,
Bu camla arzusu tapar sərəncam.
Alsa hansı bir quş himmətdən qanad.
Alçaq yuvalara etməz iltifat.
Nəsri-tayir açar himmətlə qanad,
Göyün məclisində oynar gecə şad,
Əl açsa himmətlə hər kim dünyada,
Şübhəsiz, yetişər hər bir murada.
Yüksəklik himmətdən olmuşdur nişal,
Himmətsizi alçaq etmişdir zaman.
Milçək tez uçmağı bacardığından,
Yerdə gəzən bir fil acizdir ondan.
Müşkün xoş qoxusu göylərə çatdı,
Qaranlıq şamını ulduz parlatdı.
Kim lağım atmağı etmişsə peşə,
Diriykən məzarə girər həmişə,
Belə bir himmət ki, sən zahir etdin,
Şübhə yox, dünyada məqsədə yetdin,
Sən ancaq tanrıya təvəkkül eylə,
Onuntək əvvəldən təhəmmül eylə!

Çünki bu evdə sən toxusan ipək,
Gərək nəqş oluna onda hər bəzək,
Nəzmin qulaqlarda xoş olsa əgər,
Alar əfsanədən nəşə könüllər,
Tarixdə nə varsa topla bir yerə,
Bir tarix yarat ki, tarixə girə.
Bəlkə, ondan tapdın elə gözəl söz
Ki, dəyməmiş olsun ona başqa göz,
Yazdığın nəzmə ver eylə yaraşıq,
Olsun əsərimə görənlər aşiq.
Söz yaz ki, yazmamış onu xəlayiq,
Sözü təkrar etmək sənə nə layiq?
Xoş olmaz ellərdən geri at sürmək,
El yüyürən yoldan bir də yüyürmək.
Girmə o bağa ki, başqası girmiş,
Açılan güllərin hamsını dərmiş,
Bu bağda tapmazsan açılmış gül sən,
Dünya bağında tap çox gül, çox çəmən".
Dedikcə bu sözlər beynimə batdı,
Bütün bu mənalar könlümə yatdı,
Bu düşüncə etdi qəlbimi şeyda,
Tarix eşqi saldı başıma sevda.
Tarixi diqqətlə tamam oxudum.
Hər hadisə oldu mənimçün məlum.
Bir neçə söz tapdım, kamımca oldu,
Camım mən istəyən şərabla doldu.
Bu dürrləri sapa düzdüyü zaman,
Onda bilər nədir qulaqdan asan.
Keçmiş ellər əgər çox dürrlər almış,
Qiymətli incilər hələ də qalmış.
Budur nəhayəti olmayan dəniz,
Çatmaq mümkün deyil dibinə hərgiz,
Əliboş mən də bu dəryaya girdim,
Bu söz bəzəyini ələ gətirdim.
Bu bağa qısqanar Çin nəqqaşları,
Atəş rəngindədir gülü, gülzarı.
İnsan bu gülşənə gələndən bəri

Bir söz eşitməmiş qüssədən qeyri.
Onlar eşq əhlinin əfsanəsidir.
Məhəbbət əhlinin nişanəsidir.
Kimin bu badədən qədəhi dolmuş,
Həmişə Xosrovun məddahı olmuş.
Söyləmiş ölkəsi, ayini belə,
Ordusu beləydi, təmkini belə.
Bəzən dünya gəzən Şəbdizdən deyər,
Gah gənci-badavər məğamı söylər.
Kef məclisindəki gözəl süfrələr
Gözəl saraylarda möhnət törədər.
İçib gah Baribüd nəğməsilə mey,
Şapur dastanından deyər peyapey.
Büzürgümmid ona hikmət arayan,
Könlünü açmaqda işə yarayan.
Məryəmin qoynunda gah tapar aram,
Şəkər halvasından gah alar o kam.
Gah Xasrovtək, Şirin eşqiylə yaşar,
Bəzən kəniz, bəzən yartək yanaşar.
Bu nazla bəslənən şahzadə yəqin,
Dünyada qüssədən, dərddəndir əmin.
Arada söyləyib bir-iki dastan,
Zavallı Fərhaddan vermişlər nişan.
Qart daşları çapan bir dağ gövdəli,
Şirinin qəmindən olmuşdur dəli.
Yüyürmüş vəsl üçün bir neçə gün o,
Onu daş içində öldürtmüş Xosrov.
Belə nəqş eyləmiş bu rəsmi qələm,
Bu dastanı belə eşitmiş aləm,
Ancaq ki, nəzmdə hər mahir nəqqaş,
Düzüb söz sapına qiymətli qaş-daş,
Onu dərk etməkdən düşüncə heyran,
Ona vurğun olur ağıllı insan.
Onların nəzminə etdikcə diqqət,
Bildim qarşımdadır böyük əziyyət.
Başqa cürə lazım bildim tərhini,
Bu mehnətnamənin yazdım şərhini.

Demirəm sözlərim dürr tək yaxşıdır.
Daş da olsa, şerim çaxmaq daşıdır.
Od rəngli olsa da gər ləl-parə,
Çaxmaq daşı kimi saçmaz şərarə.
Çaxmaq daşı deyil, bu – mehnət dağı,
Qəmlər burda qoymuş dağ üstə dağı.
Bu qəm dağı içrə dərdü mühəndən,
Mümkün deyil qaçım mən Kuhkəndən;
Nizami ardınca getdisə Xosrov,
Əgər o şah isə, bu oldu xosrov.
Bu işdə uyuşdu iki yeganə,
Xosrovdan dedilər gözəl əfsanə.
Mənim tək yazığa eşq etdi bidad,
Salıb qəm dağına, eylədi Fərhad.
Yerin var qaldırsam ahu fəğanı,
Desəm Fərhad üçün mən bu dastanı.
Yazım can lövhindən iki rəvayət,
Fərhadla Şirindən edim hekayət,
Tişəsi sinəmdən çıxartsa fəğan,
Onu itiləsin gərək bu suhan.
Gəncədə bəslənən o böyük ustad,
Bu xoş əfsanəni belə etmiş yad.
Demiş, yazıq Fərhad daşlar çapardı,
Sanma bu sənətdə bir misli vardı.
Şirinin qəlbində varmış bu məraq,
Qart daşlar bağrında çəkdirə bir arx,
Bu işçin arardı bir əhli-hünər,
Şapur ona verdi Fərhaddan xəbər.
Fərhadçın Şapuru Şirin yolladı,
Şapur da tez gedib tapdı Fərhadı.
Pərdə arxasında Şirin durarkən,
Şirin dillə ona iş buyurarkən,
Bu xoş səsi duyan o xəstə Fərhad,
Aşiq oldu ona, qopartdı fəryad,
Səbrini itirdi,qərarı getdi,
İş bir yerə çatdı, həyatı bitdi.
Lakin hindistanlı mahir sənətkar,

Bu qəm dastanını edəndə izhar,
Bu qüssə üstündə işlətdi qələm,
Açdı bu səhfədən bir başqa aləm
Hansı bir sözü ki, gördü müvafiq,
Onu əsərinə bildi o layiq.
Gövhər dəryasında qələmi üzdü,
Əsərinə belə incilər düzdü
Ki, nəslən çatardı o, sultanlara,
Xəta mülkündəki böyük xanlara.
Hər sözü hünərdən verərdi xəbər,
Alnında parlardı şahlıqdan əsər.
Bəllidir insanın, lakin adəti,
Məlumdur bəşərin bu xasiyyəti.
Könlü hər bir işə göstərsə maraq,
Çətindir özünü ondan qurtarmaq.
Həvəs nizə alıb, göstərərsə zor,
Əvvəl ağlın eylər gözlərini kor.
Nəfsilə vuruşan basılar, inan,
Bu işdə tən durar dərvişlə sultan.
Onun qəlbindəki coşqun bir həvəs,
Hünərlər yaratdı Fərhada əbəs.
Oğlunu bu sayaq görüncə xaqan,
Çox çalışdı onu qaytarsın yoldan,
Gördü mümkün deyil, çün tərki-adət,
İnsanda fitridir nikbət, səadət.
Bu işdə oldusa çox fikrə düçar,
Şahlıq namusuna bu iş gəldi ar.
Çox seyirlər etdi özgə diyara,
Bu müşkül bəlayə tapmadı çara.
Axırda oğlundan əl üzdü bütün,
Onu səyahətə sövq etdi bir gün.
Hünərlə at sürdü Əşrəf meydana,
Bu sözü başqa cür çəkdi bəyana.
Bu qəmli dastanı yazmışlar belə,
Yazan adam bəlli deyildir mənə.
Hər üç şair bundan bir qədəh içdi,
Arada bununçün ixtilaf düşdü.

Xosrov bu qüssəni istərkən yazmaq,
Qabaqca yazandan o verdi soraq.
Bu müqəddəs işə eylərkən rəğbət,
Başdan başlamağı bildim məsləhət.
Bir sözü bilməsən ta başdan-başa,
Ortadan oxusan o gəlməz xoşa.
Olsa "iyman" sözü rəhmətdən nişan,
Əlifsiz yazılsa, oxunar "yaman".
Şəmsi hər bir adam qızıl edər hiss,
Başdan "şi"ni atsan, dönüb olar mis.
Möhnət gecəsinə şam işıq saçar,
Kəsilsə şöləsi qaranlıqlaşar.
Qəm şamı salmışdır canıma atəş,
Can da bu yanmaqda olmuş mənə əş,
Başında olmasa gər zərli bayraq,
Etməz şəbistanı şam belə parlaq.
Mənim can evimi işıqlandıran,
O təraz şamına var ümid inan,
Günəştək göylərdə cövlan edəçək,
Aləmi nuruna heyran edəcək.
O işıq şamını dur gətir saqi!
Şam deyil, o parlaq günəşdir baqi.
Günəş yayılarkən ucalıqlara,
Mən də Fərhad kimi çıxım dağlara.

## FƏRHADIN DOĞULMASI

Bu Çin libasını nəqş edən rəssam
Onu bu nəqş ilə bəzəmiş tamam:
Çin gözəl nəqşlər ölkəsidir çün,
Ona qibtə edir dünya bununçün...
Orada var idi çox böyük bir xan,
Ona xan deməyin, söyləyin xaqan.
Məmləkəti geniş dünyalar qədər,
Yeddi qat göy ilə taxtı bərabər.
Elə bil qum idi yerdə qoşunu,

Nə qum, ulduzlarla bir tutun onu!
Afridundan çoxdu cahı, cəlalı.
Qarundan artıqdı dövləti, malı.
Uca göylər kimi dərgahı vardı,
Hətta göylərdən də ali durardı,
Önündə qul idi elə bil xanlar,
Ona bac verərdi ölkə alanlar.
Səxavəti vardı ümmandan artıq,
Cəvahir saçardı o kandan artıq.
Həm imkandan artıq, nəinki kandan,
Hər kəs tapmadığın, tapardı ondan!
Günəş incisindən olsa da tacı,
Ayrı bir inciyə var ehtiyacı.
Arzu bağı açsa yüzlər ilə gül,
Çırpınırdı başqa bir gülçün könül.
Ondan nur alırkən hər iki cahan,
O işıqlanmadı öz işığından.
Dedi: – "Çün, cahanın bəqası yoxdur,
Uca sarayların əsası yoxdur.
Əbədiyyət evi deyildir ali,
Dünya bədbəxtlikdən olarmı xali?
Min il padşahlıq etsə də insan,
Baş əysə hökmünə illərlə cahan,
Bir gun içər ikən yoxluq camından,
Zənn edər yaşamış dünyada bir an.
Taxti göyə dəyən şah olsun, ya da
Bir daxma tapmayan yoxsul bir gəda.
Onları bərabər siləçək zaman,
Əbədi deyildir nə yoxsul, nə xan.
Baxıb fəxr eyləsin nəyə tacidar
Öndan qalmaz isə bir dürr yadigar?
Yaranan dürrdü, yaradan sədəf,
Sədəf, yəni ata, dürr isə – xələf.
Sədəfsiz dənizdə iz yox incidən,
Dəniz zənn eyləmə bu suları sən.
Necə də qəzəblə köpürür sular.
Üzündə dalğadan qırışıqlar var.

Çoxdur çəmənlikdə gözəl sərvlər,
Lakin faydası nə, verməyir səmər.
Ağac gözəllikçin yaranıbsa gər,
Meyvə verməyirsə, odun edilər.
Bulud yağış ilə verməsə fayda,
Havada boş duman olacaq o da.
İldırım parlarsa göydə nə qədər,
Sönər, arxasında, buraxmaz əsər.
Ocaq yanıb bitsə, nə qüssəsi var,
Təzədən qorilə yandırmaq olar.
Mən o dənizəm ki, gövhərim yoxdur,
Yaxud, bir odam ki, külüm soyuqdur.
Yox, iyrənc gölməyəm, dəniz deyiləm.
Bu od nə oddur ki, tez sönür görən?
Bu odsuzluqdandır könlümdə dağım,
Dövran keçirməsin deyə ocağım.
Ah, həsrət! İllərlə çox udmuşam qan,
Çin – Xəta mülkündə olalı xaqan.
Bu fani dünyadan gedən zamanda,
Bir yad tutacaqdır yerimi onda,
O mənim taxtıma basacaq ayaq,
Qoşunla ölkəmə əl uzadacaq,
Yatağım içində tutacaq aram,
Zəmanə sübhümü edəcək axşam.
Zəhmətlə yığdığım bu xəzinələr,
Ona çatan zaman olacaq hədər.
Düşmən tənindənmi əfsus eyləyim,
Ya kişilik, namus, hansından deyim.
Oğulsuzluqdandı bu əzablarım,
Məni iztirabdan xilas et, tanrım!
Bu dərin girdabda gəl tut əlimdən,
Varis işığilə işıqlanım mən!”
Sözləri, söhbəti daim bu idi,
Həqdən bir oğuldu ancaq ümidi.
İncilər saçardı göz yaşlarından,
Lakin sevinc yaşı istərdi o xan.
Bununçün pul tökdü dünyalar qədər,

Çox nəzirlər verdi, etdi kərəmlər.
Oğulsuz kəslərə min lütfi yetdi,
Çox atasızlara atalıq etdi.
Bunların hamısından məqsəd isə, bax,
Bir oğul atası olmaqdı ancaq.
Lakin nə çəkmişsə qarşıya təqdir,
Tədbiri, eyləmək olmayır təğyir.
Bir işdən mənfəət görməsə insan,
Əzəldən alnına yazılıb haqdan.
Rəngləri qırmızı bir çox gövhər var,
Əslində ləl deyil, kömürdür onlar.
Çox sarı boyalar yaratmış cahan,
Mədən görünsə də alovmış haman;
Edilən arzuda varmı bir xeyir?
Madam ki, məchuldur insana bu sirr,
Elə bunun üçün deyirəm ki, mən,
Razılıq eyləyək taleyimizdən.
Çün bu arzularla yaşayırdı xan,
Duasını etdi məqbul, yaradan,
Bir yeni ay doğdu evində xanın,
Ay deyil, günəşi bütün cahanın.
Açıldı bağında atəşin bir gül,
Gül deyil, yox onu dərd şöləsi bil.
Tale üzük taxdı əlinə həmən,
Zinətini etdi odlu ləldən.
Yazıldı alnında eşqin sirləri,
Qazıldı qəlbində dərd tilsimləri.
Yox, ona ləl deyil, deyiniz bari,
Gecəni nurladan parlaq mirvari.
Mirvari deyildir, dünya yandıran
Qiymətli bir gövhər sanılsın o qan.
Sapı eşilmişdi tabi-vəfadan,
Qəlbi deşilmişdi hökm-qəzadən.
Gözündə göz yaşı selindən izlər,
Köksündə var idi ahlar, əninlər.
Alnında məhəbbət nuru yanardı,
Camalında vəfa damğası vardı.

Onu dərd əhlinə şah dedi fələk,
Qəm oduna tanış, söylədi mələk...
Eşq əhli içinə düşmüş idi cuş,
Doğulub odlarda gəzdi Səyavuş,
Şadlıqdan quruldu böyük mərəkə,
Başladı bir-birin hamı təbrikə.
Ata da o dürrə tez nəzər qıldı,
Sədəf tək gülməkdən ağzı açıldı.
O qədər payladı o xalqa qaş-daş,
Dənizlər, mədənlər qaldı buna şaş.
Ölkə parlayırdı bəzək içində,
Bu sayaq keçirdi ayinlər Çində.
Sonra əmr verdi xalqa hökmdar:
"Varsa: Çin mülkündə nə qədər divar,
Adətimiz üzrə bəzənsin gərək,
Üstünə vurulsun naxışlı ipək.
İpək yox, zərxara, həm cazibədar,
Xəta naxışından olsun naxışlar".
Beləcə bəzəndi hər tərəf bütün.
Çin bütxanəsinə bənzədildi Çin.
Yox sorğu-sualı xalq nə eyləsə,
Yaman demək olmaz kim hər nə desə.
Elə bir ziyafət qurdu ki, o xan,
Onun dövrünəcən fələklər inan,
Ömründə görməmiş belə səltənət,
Mən yüzdə birini yazmıram fəqət.
Geniş süfrələri göyə oxşardı.
Orda günəş boyda çörəklər vardı.
Şah eli qurtardı hər ehtiyacdan,
Üç il azad etdi xalqı xəracdan.
Kef çəkdi camaat durmadan bir an,
Kef, nəşə həddini aşmışdı yaman.
Nəşə doldururkən həmin diyarı,
Dincəldi məşəqqət karivanları.
Nəşələr çəkildi həddən ziyada,
Soyğunlar, talanlar düşmədi yada.
Ölkə üzündə yox qırışdan əsər,

Çöldə qırış varsa, o da ki, şəhər.
Badə məhv eylədi, qalmadı qayğu,
Qaranlıq kədəri yudu qızıl su.
Saqi, bir qədəhlə xatırla bizi,
Gətir o məclisdən qismətimizi.
Məni, Çin əhli tək, meypərəst eylə,
Çin piyaləsini doldur, məst eylə.

## FƏRHADIN TƏRBİYƏ OLUNMASI

Bəzəkli məclisdə mahir nəğməkar,
Dastana bu sayaq başladı təkrar:
Oğul bəxş edərkən ona yaradan,
Bu gözəl töhfədən çox şadlandı xan.
Sevindi uşağın gözəlliyilə,
Hazırlaşdı ona ad qoysun deyə.
Həmin o şahanə hüsnün nurundan
Sonsuz işıqlara qərq oldu cahan.
Tale yardım etdi, üz verdi dövlət,
O nurdan hər bir kəs tapmışdı zinət.
Bütün bu əsaslar üzərində xan,
Fərhad ad qoymuşdu ona bu zaman.
Dedi: – "Fər – nur demək, bəxt isə – hadi"
Bundan şahzadəyə verdi o adı.
İpəklərə büküb şahın oğlunu,
Qaş-daşlı beşiyə qoydular onu.
Yox, ata qoymadı onun adını,
Sevgi görən kimi təmiz zatını,
Ona Fərhad deyə, o, ism qoydu,
Həm də hərflərini beş qism qoydu:
"Fəraq", "rəşk", "hicr" və "ah" ilə "dərd",
Onların ilk hərfin eyləyərək fərd,
Sonra eşq ustadı sözləri qatdı,
Bu tərkibdən onun adın yaratdı.
Kədər beşiyində ağlatdı onu,
Həmin buxov ilə bağlatdı onu,

Uşaq dinclik tapdı, müxtəsər desək,
Şahanə qəfəsdə huma quşutək.
Ona dayə oldu çərxin gəlini,
Bildi hər halını tutdu əlini,
Yığıldı yanına nə qədər ki, var,
Gözəl nəğmə deyən çinli qadınlar...
Yuxudan eylədi xalqı şıltağı,
Laylada tutdular o dəm uşağı.
Başqa uşaqlara bənzəmirdi bu,
Bir an gözlərinə girmirdi yuxu.
Cismi tapsın deyə qüvvət və mayə
Südünü sağırdı ağzına dayə,
Ona xoş gəlirdi bu südü içmək,
Üzümlə qarışmış badam yağıtək...
Verdi neçə qətrə süd, eşq dayəsi,
O dəyişib oldu eşq sərmayəsi
Dürrə çevrilirdi nə içsə uşaq,
Mənəvi dürr idi bu dürr ancaq,
Onun qarışqadan azdı qidası.
Ancaq ki, qüvvətdə aslan balası.
Kim eşqə düşərsə, ona gələr qut,
Süd içsə dürr olar, qan içsə yaqut.
Tamam olar ikən onun bir yaşı,
Şərəf incisilə dolmuşdu başı.
Qalxıb beşiyini tərk etdi bir gün,
Özü özbaşına yerimək üçün.
Sonra üç yaşına gəlib yetişcək,
Sözləri ağzından saçıldı dürr tək.
Hər sözü-söhbəti eşq əfsanəsi,
Oldu məskəni də eşq kaşanəsi.
Üç yaşlı olarkən, görkəmi ilə
On yaşdan az vermək olmazdı tiflə.
Bu işdən qalmışdı el ona heyran.
Günəş də heyrətə düşdü bir zaman.
Ata belə görcək işləri əlbət,
Onu oxutmağı bildi məsləhət.
Çağrıldı o dəmdə həkimi-zaman,

Biliyilə, cahan içində, cahan.
Göyün sirlərini oydu həll edən,
Göylər dad edərdi onun əlindən.
Günəş tək aydındı mühakiməsi,
Ondan da parlaqdı könlünün səsi,
Bir elm yox idi heç ondan nəhan,
Nə vardı ki, ona olmasın əyan!
Göylərə sürərkən o fikr atını,
Öyrəndi göylərin yeddi qatını.
Hikmət nöqtələrə bölsəydi fərdi,
Nöqtə gözlərində cismə dönərdi.
Ona ilahiyyat, hesab, təbiət,
"Əlif", "bəy", "tey" kimi aydındı, əlbət.
Fəlsəfi biliyi çatdı Yunana.
Bir kiçik şagirddi Ərəstu ona.
Məçlisə gələrkən həkimi-aləm,
Hökmdar, Fərhadı çağırtdı o dəm.
Çox səy eylədilər təhsili üçün,
Göyün ortasında mənzil tutdu gün.
Ustad "əlif", "beydən" başladığı dəm,
"Beyə" bəla deyib "əlifə" ələm
Gül üzlü şahzadə vermişdi ilk gün,
Əbcəddən hədiyyə atası üçün.
Üç ay keçməmişdi oxudu rəvan,
Əzbəri olmuşdu bir ildə quran,
O hər hansı dərsə baxsa bir kərə,
Bir də əl vurmazdı o vərəqlərə.
Könlünə yazardı onları özü;
Yox, o can lövhinə yazardı sözü.
Bir dəfə oxusa dərsini ancaq,
Əzbər bilər idi o varaq-varaq:
Görərkən eşq ilə aşiq sözünü,
Könlü vurğun gördü buna özünü.
Şərhini eylədi çox dəfə təkrar,
Tez-tez oxuyaraq etdi ahu-zar.
Hər eşqə düşənin halına yandı,
Hər gözü yaşlını bir yoldaş sandı.

Kim etsə dərdindən bir az rəvayət,
Ona rədd edərdi tamam sirayət.
Bir qəlbi oxursa, fikrində ağlar,
Bir gözdə yaş görsə, ağlardı zar-zar.
Həkimi lal etdi Fərhadın dərdi,
Dərhal öz-özünə yüz hökm verdi.
Getdikcə atanı heyrətlər aldı,
Ana fikir əlində lap aciz qaldı.
Dedi: – "Uşaqlarda bu hal çox olar".
Xaqan dedi: – "Yoxmu başqa uşaqlar"?
Hərə bir növ ilə dedi bir tədbir,
Ancaq bilmədilər nə yazıb təqdiri.
Onun, el içində yayıldı sözü;
Yenicə çatmışdı on yaşa özü,
Bütün elmləri bildi dərindən.
Bir nöqtə qaçmadı nəzərlərindən.
On yaşını tamam etdiyi zaman,
Az vermək olmazdı iyirmi yaşdan.
Elmi vərəqlədi, elə ki, bir-bir,
Bildi dilavərlik silahı nədir.
O hər hansı işə meyl etsə əgər,
Çətinlik çəkmədən onu düzəldər.
Həm qövsi-qüzehi o elə əydi,
Məşriqi əyərkən, məğribə dəydi.
Zülmətdə gər nişan alsa Sühanı,
Fələkdə vurardı həmin nişanı.
Ayrı nişan alıb ox atsa əgər,
Fələk qəhrəmanı afərin deyər.
Dəysə qılıncının zərbəsi hara,
Yarılıb yarağan olardı ora.
Nəinki yer, hətta qranit dağlar,
Onun zərbəsindən yarığan olar.
Əgər vursa idi Elbursa bir gürz,
Uçardı, toz kimi qalmazdı Elburs.
O dövri-fələyə nizə tutan tək,
Qorurdu qalxanla özünü fələk.
Nizənin küt ucu balıqdan keçər.

Tiz ucu fələyin qəlbini deşər.
Döyüş meydanında at çapar ikən,
Düşmənlər qaçardı qərbdən şərqəcən.
Göyün yel atını ötər səməndi,
Bəhramın boynuna düşər kəməndi.
Göyə zərbə vurdu o şeşpərindən,
Hutun qəlbi oldu su, xəncərindən.
Şir bürcünün boynun əlilə üzdü,
Onun qarşısında şirlər gücsüzdü.
Ağrı duyar idi hətta Ruintən,
Nə vaxt tutsa idi onun əlindən.
Elm dünyasında bir parlaq gövhər,
Qüvvət aləmində göstərən hünər,
Heç saydı özünü, əbcəd oxur tək,
Nəinki elmdə, gücdə də gerçək.
Şahlar, qapısında onun bir gəda,
Gədaların ayaq tozuydu o da.
Onunçün şah, gəda nə fərqi vardı,
Gədanı şahdan da üstün tutardı.
Nə ki, könlü, onun gözü də pakdı,
Dili pak, sözü pak, özü də pakdı.
Layiqdir bu təmiz böyük varlığa,
Dünyada kim varsa, eyləsin dua.
Soyuq yellər əssə üstündən nagah,
O vaxt Çin xalqı da çəkər soyuq ah.
Fəda edər ona el xanimanın,
Nə ki, xanimanın, bəlkə də, canın.
Ona toxunmasın deyə bir xata,
Hər gün bir xəzinə paylardı ata.
Uşağın duysaydı bir dərdi vardı,
Onu ölümlərdən satın alardı.
Dərdə əsir oldu Fərhadın başı,
Gəlib çatar ikən on dördə yaşı.
Saqi, qəm dağıdan şərab ver bizə,
Əsər eyləmişdir dərd qəlbimizə.
Başımın üstündə çəkməmiş ikən
Kədər xəncərini, şənlik düzəlt sən.

## FƏRHADIN SEVGİSİ

Mühəndis bu qəsri tikdiyi zaman,
Onu bu növ ilə qurmuşdur: xaqan
haman arzusuna elə ki, yetdi,
Şənlik məclisində o, dinclik etdi.
İndi o, şam idi evində rövşən,
Məclisi o güldən olmuşdu gülşən.
Alovlanan bir qəlb olsa da o şam,
Qəlbi yandırardı alovu tamam.
Alışıb parlardı bəzən alovlar,
Bəzən də göz yaşı olardı onlar.
Eşq onun üzünə dəyərdi nəhan,
Olsun qoy bu gülun rəngi zəfəran.
Deyərdi qəm yükü ona gizlicən:
"Dal" tək əyməliyəm bu əlifi mən"!
Dərd çəkmək istərdi gözünə füsun
Ki, bir gün onları yuxusuz qoysun.
O könlü qorxudub deyərdi kədər:
"Qoy yıxım bu evi qalmasın əsər".
Əgər bir iş etmək istəsə təqdir,
Qabaqdan əsərin göstərər bir-bir.
Qızdırma edincə zahir şərarət,
Bədəndə əvvəlcə olur hərarət.
Yarpağı tökmədən qabaqca xəzan,
Rəngini çevirib eylər zəfəran,
Kimə ki, bir bəla yetirir təqdir,
Əvvəlcə eyləyər əhvalın təğyir.
Çün onun qarşıda çoxdu kədəri,
Qəm ilə boyandı şadlıq günləri.
O, eyşü-işrətə meyl eylənən tək,
Əlində parlarkən şərabi-gülrəng,
Musiqi coşardı o vaxt hər yandan,
Hər könlə, bir şənlik gətirən dastan.
O nəğmə ki, xalqı eyləyərdi şad,
Onu qəm içində eylərdi bərbad.
Məcnundan desələr dastan içində,

Könlü çırpınardı al-qan içində.
Nə zaman dinləsə qəmli rəvayət,
Bu qəmdən olardı qəmgin nəhayət.
Eşitçək eşq ilə aşiqliq sözü,
Çaylar axıdardı durmadan gözü.
Xan olduğu zaman bu işdən agah,
Fikirlər içində çəkdi soyuq ah,
Ki: neçin olmadı o heç zaman şad:
Ürəyi qəmlərdən, qüssədən azad?
Nədir eylədiyi bu ahü fəğan,
Neçin ayrılmayır göz yaşlarından?
Deyim Çin mülkündə qəribəlikdən,
Əcaib işlər var nə qədər desən.
Yasəmən sinəli qızları çoxdur,
Mahir ustaların əvəzi yoxdur,
Vəfasız göy kimi oyunbazlar var,
Göy tasından möhrə oğurlar onlar.
Nə vaxt düzəltsələr bir əfsun əgər,
On dəfə aldanar hər anda göylər,
Gündüz ay doğurub, gecələr günəş,
Oddan su səpərlər, sudan da atəş.
Alovdan göyərdir onlar süpəndan,
Hörümçək torundan asarlar zindan.
Bu kimi minlərcə məkr, əfsunlar,
Onun nə həddi var, nə hüdudu var.
Hər gün ki, şənlikdə olaraq zahir,
Min əfsun edərdi onlar təzahür,
Şahzadə dalaraq xəyalə dərin,
Təhqiq eyləyərdi keyfiyyətlərin.
Tapmaca tapılsa, şənlik olardı,
İşdə nə möcüzə, nə sirr qalardı.
Bir gün çətin işlər olunca asan,
Qəribəliklərdən qalmazdı nişan:
Bunlar ilə dəxi şahi-cahangir,
Eyləyə bilmədi bu işə tədbir.
Təhəmmül elədi yenə də naçar,
Düşündü verməkçin ayrı bir qərar

Ki, dörd qəsr eyləsin bununçün bünyad,
Hər fəsl birində yaşasın Fərhad.
Düzəltsin şadlıqçın nə varsa bütün,
Fərhad dərdlərini unutmaq üçün.
Hər qəsrin yanında saldırsın bir bağ,
O bağın hər gülü olsun şəbçiraq.
Hünərvərlər orda eyləsin gərək,
Hər qəsri hər fəslə münasib bir rəng.
Bahar sarayına verərkən əsas,
Qızıl güllə gərək edilsin qiyas,
Gül üzlü büt kimi gözəl qurulsun.
Gözəl yanağı tək min rəng vurulsun.
Yay sarayına da bina qoyan gün,
Orda bolluq olsun yay kimi bütün,
Yaşıl olduğundan bağda yarpaqlar,
Saray yaşıl olsun dedilər onlar.
Payız sarayına başlanan zaman,
Onun da rəngini edin zəfəran.
Həm də ki, xəzanə oxşamaq üçün,
Qızıl suyu ilə bəzənsin bütün.
Olsun qış sarayı qışın rəmzitək,
Ağ çin ipəyilə bəzənsin gərək.
Baxanda qar ilə buz əks salsın
Düm ağ kafur kimi bir rəng alsın.
Göylərə bənzəyən bu saraylarda,
İlin dörd fəsli də gəlməli yada.
Elə Çin lövhəsi çəkilsin gərək
Ki, olsun fəzası cənnət bağı tək.
Saraylar tikilib qurtaran zaman,
Ora lazım olsa, huri və qılman
Xata ilə Çində varsa nə qədər
Huriyə, qılmana əvəz gözəllər,
Onlar bu cənnətdə olsun xuraman,
Cənnətdə gəzən tək hurilə qılman.
Heç şübhə yoxdur ki, bu dəbdəbələr
Bizim şahzadəyə şənlik gətirər.
Ustad bu işlərə əsas qoyanda,

Hazırlıq işləri qurtaran anda,
Bütün sənətkarlar göstərər hünər,
Daş yonan da olsa, nəqqaş da əgər,
Biri yonar yüz cür qranit hər an,
Hovuz, ya döşəmə etməkçün ondan.
Biri hərdəm çəkər yüz gözəl lövhə,
Sarayları bir-bir bəzəsin deyə.
O vaxt ki, nəhayət, həmin karxana
Qurtarıb bir gündə yetəcək sona,
O zaman göz burda görəcək nələr?
Hər addım başında gözəl şəkillər!
Bir şəkil olacaq göz qabağında,
Tam ayrı bir şəkil çevrilən anda.
Lövhələr xoş gəlsə əgər gözünə,
Yüz iş tapacaqdır Fərhad özünə.
Saray tikilərək tapsa bir sənət,
Qurtaran zamanda sürərsə işrət,
Alışar bunlara nəhayət Fərhad,
Şübhəsiz ki, olar qəmlərdən azad.
Həmin bu işlərə başlayarkən xan,
Qəlbində bir şadlıq duydu o zaman,
Müdrik bir vəziri var idi xanın,
Ölkə tədbirilə abaddı onun.
Çinin ondan idi zinəti bütün,
Mülk-ara adlandı o bunun üçün.
Ondan məsləhətsiz iş görməzdi xan,
Rəyincə gedərdi, onun hər zaman.
Atabəy olmuşdu vəzir Fərhada,
Ata tək sevirdi vəziri o da.
Aşüftə halına yanardı gerçək,
Xəzinəsi itən xəzinədar tək,
Bu fikirlər ilə vəziri pünhan,
Bir gün öz yanına çağırtdırdı xan.
Sarayın vəsfindən, huridən dedi,
Açıb xəyalını bir-bir söylədi.
Vəzir cavab verdi təzim edərək:
“Sizdən gizlin bir şey qalmamış, gərək

İşə başlanılsın bir an durmadan”.
İşləri tapşırdı vəzirinə xan.
Vəzir fərmanından şadlandı xanın,
Önündə baş əyib o hökmranın.
Oradan şad-xürrəm qayıtdı geri.
Tökdü bundan sonra çox tədbirləri.
Təmiz şərab gətir, ver mənə, saqi!
İş başa çatmışdır içək şərabi;
Göydə yeddi qəsrin vəfası yoxdur,
Dünyada dörd fəslin bəqası yoxdur!

## SARAYLARIN TİKİLMƏSİ

Həmin karxananı qurub yaradan,
Ondan verir idi belə bir nişan:
Həmin sarayları tikdirmək üçün
Şah, Mülk-aranı təyin edən gün.
Atına minmişdi özü də dərhal.
Yandı dövlət kimi alnında iqbal.
Yanında minlərlə alim gedirdi,
Onu mühəndislər təqib edirdi.
Şərab nəşəsilə Çini gəzib xan
Seçdi ən nəhayət, dörd gözəl məkan.
Hər biri çənnətin bir guşəsitək
Abü həvasından açılır ürək.
Hər biri bir fəslə gəldi müvafiq.
İstirahət üçün Fərhada layiq.
Divar tikənləri tapdırdı əvvəl,
Verdi hər birinə Dörd ədəd cədvəl.
Çəkildi bir ağac uzununda xətt,
Böldülər sonra da onu xətbəxətt.
Gördülər gözəldir bağın sahmanı,
Yetişdi dörd saray tikmək zamanı.
Artıq əmr etməyin zamanı yetdi,
Mülk-ara işlərə rəhbərlik etdi.
Vardı Çin mülkündə həm iki ustad,

Onlarda bir idi hünər, istedad,
Banilə Manidi onların adı.
Görüb tanıyanlar iki ustadı.
Fərq edə bilməzdi bir-birindən
Bani zənn edərdi Manini görən.
Memarlıq işini Bani etmiş faş,
Mani Çin mülkündə ən gözəl nəqqaş.
Banidə məharət o qədər çoxdur,
Təsvir eyləməyə onu söz yoxdu.
O elə tez çəkdi nəqşəni görcək,
Bir divar nəqşəsi çəkən ustatək.
Uca qübbələri çatdırmaq sona,
Su içimi kimi asandı ona.
Bir evin binasın o qoysaydı həm,
Fələk sarayıtək olardı möhkəm.
Qranitdən möhkəm bina qurardı.
Kirəci dəmirdən sərt yoğurardı.
Elə nəqş edərdi, Mani, doğrudan,
Çərxin nəqşbəndi əskikdi ondan.
Rəqəm dairəvi, istər olsun düz,
Çəkərdi cədvəldən, pərgardan təmiz.
Cansız lövhələri bəzəyən zaman
Onlara verərdi elə bil ki, can.
Onun çəkdiyinin əksini belə
Çəkə bilməmişdi yüz nəqqaş hələ.
O yatmışa təlim verərsə əgər,
Ayılıb mahir bir ustaya dönər.
Var idi yenə də cəld bir sənətkar,
Sənəti həm incə, həm də ahəngdar.
O idi sərt daşla yarışa girən,
Ləqəbi Qarindi – qranit kəsən.
Tişəsinin ucu dəysə bir kərrə,
Min deşik açardı qranitlərə.
Oldu qələminə sənətkarlıq fən,
Bütün ömrü boyu oldu daş kəsən.
Çox ustalar vardı aqil, yeganə,
Beləsin görmədi, hələ zamanə.

Çağırtdı hamını o müdrik vəzir.
Halı, vəziyyəti şərh etdi bir-bir
Ki: “Xaqanın bir çox əmrləri var,
Şahzadə üçündür, bəllidir onlar.
Dörd bağ salınmalı cənnət bağı tək.
Bəzəyi gülşəndən dörd saray gərək.
Şahzadə hər fəsil birində olsun,
Hər gün könül quşu bir bağa qonsun”.
Sonra da rəngləri o, şərh eylədi,
Bu növ, bu növ olsun bünövrə, dedi.
Sözünü qurtarıb fikirləşmədən,
Qum kimi pul səpdi ortaya birdən.
İşə salmaq üçün biliyin, əvvəl
Öpüb göz üstünə onlar qoydu əl.
Elədi Mülk-ara onları xoşbəxt,
İşə başlamaqçın təyin oldu vaxt.
Əvvəlcə girişdi işə dörd sərkar,
İş üçün gərəkli nə var yığdılar.
hər işi tapşırdı yüz iş bilənə,
Verdi hər birinə min işçi yenə.
Çinin hər yerini abad-xaraba.
Tutdu daş, kərpiclə yüklü araba.
Doldu gurultuyla dağlar, dərələr,
Hətta səs çatırdı göylərə qədər.
Ustalar dağlara çıxdı durmadan,
İşlədi minlərlə qranit yonan.
Bu araba deyil, elə bil göydür,
Qranit yükünün altında gedir.
Səhərdən axşama çəkilir birbaş
Ora, iş yerinə ağ, qırmızı daş.
Coşur dəniz kimi hər kanal çəkən,
Rübai oxurdu ustalar bərkdən.
Onların gücündən bu idi nişan,
Gəmilər hər yana olurdu rəvan.
Orda səndəl ilə ud elə çoxdu.
Tüccar dükanında bu qədər yoxdu.
Səndəl ağacından, hər anda mişar

Qışda kafur kimi tökdü qabıqlar.
Gər bənnanın başı göyə ucaldı,
Palçıq verən isə yerlərdə qaldı.
Yer bu zərbələrdən elədi fəğan,
Qalxdı hər parçası asimanacan.
Uca tağ üstündə dayanıb bənna,
Yerdən kərpiç almaq etsə təmənna,
Çıxıb ay üzlülər meydana bütün,
Zühəl ulduzuna gələrdi üstün.
Gəlir ustalardan hər an bir fərman,
El bu fərman ilə işlər durmadan.
Düşüb bəni-adəm tamam həycana,
Həycan salmışdılar bütün çahana.
Elə çalışırdı o dörd həvəskar,
Ona heyran qaldı bu yeddi pərgar,
Ustalar baxdıqca hər birisi nər
Bir an dincəlmədən işləyərdilər.
Elə ki, bu təhər başlandı işlər,
Gəlib şahzadəyə nəql eylədilər:
Ki, göylə bərabər dörd saray durur,
Edib yer üzündə dörd cənnət zühur.
Belə tağ görməmiş heç zaman afaq,
Təkdir yer üzündə ordakı hər taq.
Üfüqdən ucadır orda qüllələr,
Dünyada onlara əvəz nə gəzər!
Çün tərif etdilər həddən ziyada,
Görməkçün həvəsə düşdü şahzadə
Atını çəkdirib, tezcə geyindi,
Ay, sanki, göylərin atına mindi.
Yanında ay üzlü yüz atlı da var,
Sanki ay ətrafın tutmuş ulduzlar.
Şahzadə gördü ki, çatınca ora,
Qiyamət qopmuşdur lap aşikara,
Təəccüb eylədi, coşur bir diyar,
Yemədən, yatmadan işləyir onlar.
Dörd saray çəkibdir orda göyə baş,
Göy ona tariflər yağdırır şabaş.

Orda göylər kimi ucadır tağlar,
Onların Zühəl tək bir görkəmi var.
Hər bina uca bir tağ olsun deyə,
Dövranın hökmilə ucalmış göyə.
İşə elə dalmış orda hər ustad,
Başqa hər cür işdən olmuşdur azad.
Şahzadə görüncə belə bir əhval,
Barmağın dişləyib, sanki oldu lal.
O hansı bir işə diqqət eylədi,
Ona heyran qalıb təhsinlər dedi.
Çox ustalar gördü, getdisə hara,
Rast gəldi yüzlərcə daş yonanlara.
Qranit dağlarda vuraraq dövrə,
Bölürlər dağları onlar min yerə.
Tişələr altında bölünür hər dağ,
Sanki bıçaq altda əriməkdə yağ.
Birisi mum kimi yoğurur daşı,
Ondan novca üçün edir şir başı.
Birisi mərməri yonub vurhavur
Ondan sütunlarçün bünövrə qurur.
Orda sənətilə mahir sənətkar
Memarlıq hünərin etdi aşikar.
Dəmir qələmini çəkib hər yana,
Daş üstə torpaq tək qoydu nişana.
Çəkdi qələmilə yüz naxış dərhal.
Belə bir ustadan Mani oldu lal.
Bəzən güc göstərdi bəzən də hünər,
Səs saldı dünyaya ancaq bu təhər.
Mahir sənətkarı gördüyü o an,
Şahzadə seyr etdi bir xeyli zaman.
Sonra da atından yerə düşən vaxt
Qranit üstündə quruldu bir taxt,
Şahzadə oturdu burda bəxtiyar,
Dedi: – “Ey sənətdə böyük sənətkar?
Bir az sənətindən gəl bizə danış,
İşin əsli ilə bizi et tanış!
Həm də, söylə görək, nədir bu peşə,

Yonur qraniti mum kimi tişə?
Nədən görməmişik bu şeyləri biz?
Ağıl belə bundan qalmışdır aciz.
Ağac bir azacıq sərt olsa əgər,
Bıçaq ona dəysə, dərhal kütləşər:
Nəylə itilədin tişəni de bir?
Onu mərmərlər də kütləşdirməyir?
Sərt daşlar üstündə bu əyilməyən
Qələmini, nədən qayırmısan sən?"
Yerləri öpərək qabil sənətkar
Başladı, dilində xeyir-dualar;
"Müşkülün Qaf kimi olsa sıldırım –
Qoy çaxsın üstündə onun ildırım.
Olsun qəm daşından asudə başın.
Yarsın dərd başını atdığın daşın.
Düşmənin nəsibi qoy xarə olsun.
Məşəqqət dağında avarə olsun.
Öncə sordun ad və şöhrətimi sən,
Sonra sənətimin keyfiyyətindən.
Adım Qarin mənim, işim aşikar.
Qranit yonmaq tək bir sənətim var.
Sorursan, nə üçün bu möhkəm tişə
Sınmadan qranit yonur həmişə?
Bunun çox fəndləri, çox sirləri var,
Lakin eyləmirəm eli xəbərdar.
Onlara çəkərsə tişəni ustad,
Yüz il qranit yox, o yonar polad.
Usta rahat olar sınmaz o tişə,
Sınar o zaman ki, yaramaz işə.
Çin xalqı yaradıb elə bir sənət,
Sənətdə edilməz ona rəqabət.
Onlar da bilməyir mən bilənləri,
Bu işə heç kəsin çatmaz hünəri".
Bu incə fikrini həkim deyərkən,
Həvəsə düşərək şahzadə birdən,
Dedi ki: "Könlümə yatdı bu peşə,
Dayanma, qarşımda məşğul ol işə,

Qraniti gah yon, gah naxışla sən,
Mən də bu işləri keçirim gözdən”.
Sanki göyə dəydi ustanın başı,
Tez hazır eylədi aləti, daşı,
Gördü, Fərhad olub işlərinə bənd,
Qranit üstünə nəqş etdi peyvənd,
O, sərt qranitə vurçaq tişəsin,
Şahzadə heyrətlə edərdi təhsin.
O qədər dayandı şahzadə o gün,
Dağların dalında batıb getdi gün.
Şahzadə ayrılıb mərmərdən naçar,
O mərmər dırnağa minərək təkrar,
Keçdi çölü, düzü o şəhər deyə,
Sanki gün dağlarda yüksəldi göyə.
Bir cami-rəngin ver gəl, saqi, mənə?
Qəm daşı könlümü bərk əzir yenə.
Bu sel, qəm tozunu silsin oradan,
Toz demə, qranit silinsin, aman.

## FƏRHADIN QARİNDƏN DAŞ YONMAQ ÖYRƏNMƏSİ

Bu qranit üzrə işlədən qələm,
Üzünə nəqş etmiş belə bir rəqəm
Ki, evə çatınca şahzadə axşam,
Könlü bir ləhzədə olmadı aram.
Fikri ayrılmırdı o tamaşadan,
Marağa, həyəcana düşürdü hər an.
Hər şeyi həll edər ağıl dünyada,
Həvəs qarşısında acizdir o da.
Gecə zülmət çağı çevrilən zaman.
Zəlzələ baş verir sanki dağlardan.
Günəş ləli qurdu çün dağlara taxt,
Mərmər rəngli etdi sübh göyü o vaxt.
Elə ki, ucalıb gün göydə yandı,
Tamaşa etməkçün Cəmşid atlandı.

Gəlib həmin yerə yetişən zaman,
Ustalar içinə düşdü həyəcan.
Hər işə salaraq ani bir nəzər,
Bir an dayanmadan edərdi güzər,
O hansı sənətə nəzər salırdı,
Onun sirlərindən hali olurdu.
Bundan ruhlanaraq hər əhli-hünər,
İşə daha artıq səy eylədilər,
Hərəni bir sözlə çün xoşhal etdi,
Şahzadə Qarinin yanına getdi.
Həmin qranitdə o tutdu yerin,
Yonmağa başladı tez onu Qarin.
Mahir bir dəmirçi çağırtdı işə,
Poladdan qayırsın möhkəm bir tişə,
O dəmir pəncəli, o dəmir peşə,
Buyruğu eşidib başladı işə.
Oddan dəmir oldu ləli—Bədəxşan
Sanki şəfəq içrə günəşdən yanan.
Usta alətləri qayıran zaman,
Qarin su verərdi onlara o an.
Sonra qraniti o yonar ikən,
Qığılcım qalxardı qranitlərdən.
O, hansı bir işə baxsaydı nəhan,
Nəhanı aşikar edərdi o an,
Elə mənimsədi işi dərindən,
Ona rövnəq verdi yüz min yerindən.
Həm də ki, həvəsə elə tutuldu,
Yüz Qarin önündə bir şagird oldu.
Bəzən eldən edib gizlin əndişə,
Alardı əlinə xəlvətcə tişə,
Bir anda işlərdi gizlin o qədər,
Bir ildə görərdi onu özgələr.
Şahzadə bununla hər gün məşq etdi,
Həmin bu peşədə kəmalə yetdi.
Çün gəlib keçincə dörd il baş-başa
Cənnət tək dörd saray yüksəldi qoşa.

Qəsrin xariçini Qarin işlədi,
İçərsin tamam Mani nəqşlədi.
Həm də o rənglə ki, danışdıq bayaq,
Vurdu saraylara nəqşi yüz sayaq,
Gər rəssamın çəkmək hünəri vardır,
Şahzadə həm rəssam, həm sahibkardır.
Hansı bir surəti çəksəydi Mani,
Üzünü çəkərdi şahzadə ani,
Az zaman içində göründü bunlar,
Öyrəndi hər işi Fərhad necə var.
Saraylar göylərə qaldırınca baş,
O həm daşyonandı, həm də ki, nəqqaş.
Hələ bunlar nədir, hər mahir ustad
Sənətilə qoydu burda böyük ad.
Hansı bir peşəyə meyl etdi Fərhad,
Oldu o peşədə mahir bir ustad.
Müxtəsər, dörd saray belə qurtardı,
İçində cənnət tək bağları vardı.
Bahar sarayının işi bitən gün
Al idi daxili, xarici bütün.
Həm də al rəngdəydi, bütün lövhələr,
Sanki gülşən içrə əylənirdilər.
Al, zərif xalılar döşəmiş yerə,
Yataqlar tutulmuş al ipəklərə.
Al idi pənçərə, buxarı nə var,
Nəinki qapılar həm astanalar.
Baxdıqca alırdı hovuzları çan,
Kiçik daşları da ləlü yaqutdan.
Axır gülrəng şərab, arxlardan daşır.
Orda hovuzların ağzından aşır.
Güldən hər tərəfdə gülşən açılmış,
Hər yana baxırsan güllər saçılmış.
Gəzib gülüzlülər dolaşır qoşa,
Al ipək geyinmiş ayaqdan başa.
Sonra yay bağına baxdığın zaman,
Bir saray görursən rəngi minadan.

Ona göy rəngində vurulmuş zinət,
Göy ondan solğundur eləsən diqqət.
Hər yana baxırsan səbzəsi növbər,
Bütün çəmənliklər sərv, sənubər,
Tutuquşu demə, söylə bir mələk,
Yaşıl geyinmişlər sanki mələk tək,
Səbzə rəngi geymiş gözəllər tamam
Gəzirdi əllərdə mina rəngli cam.
Orda zəbərcəddən vardı hovuzlar,
Zümrüd daşları da par-par parıldar.
Göy kimi maviydi sarayın daşı,
Sanki qübbələri yaşıl bir kaşı.
Çün yaşıl rəngdəydi onun hər yeri,
Yaşıl çinidən də döşəmələri
Hər yana döşənən körpə otlar da,
Bir şənlik gətirən Xızrdı orda.
Daha bir saray var rəngi lap xəzan,
Divarların rəngi sanki zəfəran,
Qızıllanmış idi qübbələri çün,
Fərşi də qızıla tutuldu bütün.
Eylədi sənətkar göstərib hünər,
Sarayın içini, xaricini zər.
Orda hər surətin sanki çanı var.
Gün kimi parlaqdır xaric divarlar.
Orda hovuzların yanları, dibi
Cənnətdə olan tək qızıldan idi.
Sarı mey hovuzda olarkən rəvan,
Sanki gün doğardı bu hovuzlardan.
Mey daşıb aşarkən burdan, elə bil
Xəzandır, budaqdan yarpaq tökür gül.
Orda günəş kimi gözəl sənəmlər,
Kəhrəba rəngində geymiş geyimlər.
Görənlər həycana düşür onları,
Aşiq üzü kimi sarı donları.
Dördüncü sarayın rəngi nur kimi,
Ağ rəng vurulmuşdu bir kafur kimi.
Həm içdən, həm tişdən mərmər idi bu.

Nə mərmər, hər yanı yaşəm kafuru.
Elə bil gümüşdü hovuzda sular,
Sularda bir civə parlaqlığı var.
Ağ kirəcdən idi gümüş rəvağı,
Sanki qaş altında gözlərin ağı.
Ağ ipəkdən idi haşiyələri,
Ağ çinilər ilə döşənmiş yeri.
Hər evdə nur saldı bir gümüş bədən,
Əynində paltarı bərgi-yasəmən.
Hovuzdan sədəf tək axırdı sular,
Hər qətrə elə bil incidir, parlar.
Beləydi dörd ədəd Çin bütxanəsi,
İçində dörd saray, cənnət hərəsi.
Hər saray, sanki göy eyvanı idi,
Hər bir dairəsi günəş qədərdi.
Orda hər bağ sanki baği-İrəmdi,
Nə İrəm! Bəlkə də, beytülhərəmdi.
Çün Mülk-aranın səyilə bütün,
İş başa yetişib qurtardı o gün,
Gəlib xan önündə eylədi təqrir,
Dörd çətin sarayın işindən bir-bir,
Mülk-ara sözünü qurtaran zaman,
Tamaşa etməyə yola düşdü xan.
Sol yanında müdrik vəziri gedir,
Ki, əqli ölkəni nura qərq edir.
Sağ yanında gedir şahzadə Fərhad,
Ata ilə oğul hər ikisi şad.
Tez birinci bağa etdilər səfər,
Şah ilə şahzadə, vəzir bərabər.
Tamaşa etməkçün düşdülər atdan
Baxdıqca doymurdu göz bu büsatdan.
Bağlarda möcüzlər vardı nə qədər!
Sarayda min cürə şeylər gördülər.
Cənnətdən gözəldir ikinci saray,
Üçüncü saraya tapılmazdı tay.
Dördünçüdə sənət o qədər çoxdu,
Saraylar içində buna tay yoxdu.

Bu ondan üstündü, o bundan üstün,
Dördü bir-birindən üstündü bütün.
Onun hər birinə baxdıqca insan
Heyran qalır idi bu tamaşadan.
Kim gözəldir desə birin görən tək,
Bunu unudardı o birin görcək.
Almağa nə qədər tamahları var,
O qədər mükafat aldı ustalar.
Mülk-aranın artdı min qat məqamı,
Yüz min qat çoxaldı həm ehtiramı.
Ona bəxş edildi sonra hər nə var:
Ordaki hurilər, bağlar, saraylar.
Bir il elə şənlik düzəltdi ki, xan
Dil onu deməkdən acizdir inan.
Mülk-araya tez ol, – dedi hökmdar, –
Hər bir gecikmədə mütləq zərər var.
Hər sarayda düzəlt bir fəsil çağın,
Üç aylıq eyş ilə işrət yarağın.
Hansı fəsil olarsa, keçən bu üç ay,
Ona uyğun olsun gərək o saray.
Bunu eşidərkən o müdrik vəzir,
Əmrlər verməyə başladı bir-bir.
Xəznə qapıların açıb bu zaman,
Verdi kef çəkməyə belə bir fərman:
Hər fəsil bir saray düzəltsin büsat,
Qoy hər gün kəsilsin min qoyun, yüz at.
Bunlara layiq də şərabla yemək,
Həm əladan əla, çoxdan çox gərək.
İpəyə tutulmuş orda hər nə var,
Yerə döşənmişdi zərif xalılar.
Meyvənin yox idi orda qədəri,
Bir də nəhayətsiz Çin yeməkləri.
Saqi, Çin meyilə elə bizi məst
Ki, bir Çin gözəli edib cana qəsd.
Çün getdi şənliyə xaqanı Çinin,
Qoy biz də kef edib, içək həmçinin.

## SARAYLARDA ŞƏNLİK

Həməldən gül üzlü günəş keçən tək,
Minlərlə gül açdı günəşi görcək.
Dəhrin gəlinini bəzəyib təkrar,
Məşşatə, sənətin edər aşikar,
Qamətin gündüzdən, zülfün gecədən
Düzəldib, bir etmiş onları həmən.
Yağış nəm eyləsə əgər torpağı,
Çağ olar qətrədən gülün damağı.
Bulud yağdıranda gözdən yaşını,
Nərgiz yerə tikər dərhal başını.
Nərgizi yuxuda belə görüncə
Sonsuz gülüşlərdən qızarar qönçə.
Qönçə şirin-şirin gülümsəyərkən,
Gül olub açılır bu gülüşlərdən.
Bulud qönçə üstə töküncə şəbnəm.
O gülüşdən bağrı daş olur o dəm.
Qönçə gülən zaman eşitmədiyin
Nərgiz yuxuluykən eşitmiş yəqin.
Nərgiz gül açdıqca rəngi zəfəran,
Qönçə ona baxıb şadlanır hər an.
Əgər içməyirsə qönçə onu bəs,
Neçin ağzın edər zəfəran əbəs?
Deyəsən o heç də deyil zəfəran,
Qönçə edər onun ağzında nəhan.
O meyl göstərər ağlamaq üçün,
Dəhr onu pərişan edər bununçün.
O öz şıltağından yıxılmamış gər,
Nədir belindəki bəs o duyünlər?
Bülbül edir bağda o qədər fəğan,
Əfğanı eyləyər gül bağrını qan.
Demə gözəlləşmir gül bu fəğandan.
Dolur hər yarpağı alovla ondan.
Sevir qızıl gülü həsrətli bülbül,
Bu mənadan olur o atəşin gül.

Edincə yarpağın yel parə-parə,
Bu oddan hər yana uçur şərarə.
Gülşən başdan-başa gül ilə dolur,
Hər gül lətafətdə bir gülşən olur.
Bağa yağış saçır sübh eli güldən,
Bağ bu odlu güldən alışır həmən.
Salar bülbül bu od yanında məskən,
Qanad çalıb onu eyləyər rövşən.
Qızılgül kolları güllər açan tək,
Olur gülşən üzü o güldən gülrəng.
Çün aləm bu fəsil ala boyanır,
Əksi şəfəq kimi göylərdə yanır.
Hər gül varlığından verincə xəbər,
Şah yaz sarayına eylədi səfər.
Orda qurulmuşdu o qədər büsat,
Gülşən də xatirdən çıxırdı heyhat.
Saraya döşənmiş al rəng ipəklər,
Bir taxt qoyulmuş ki, göylərə dəyər.
Oturdu yanında şahın şahzadə,
Gül rəngi eylədi üzlərin badə.
Gül rəngli bir kürsü qoyuldu ora,
Üstündə əyləşdi onun Mülk-ara.
Çin gözəlləridi məclisə bəzək,
Geyimləri oldu hamısının gül tək,
Al şərab daşıdı gül üzlü saqi,
El içib qoymadı bir qətrə baqi.
Oxurdu durmadan bir an nəğməkar,
Necə ki, bülbüllər oxuyur bahar.
Hətta sərvlərin yarpağı güldü,
Saraya hər yandan güllər töküldü,
Batdı gül yarpağı içrə qonaqlar,
Günəş şəfəq içrə necə qərq olar.
İçdi gül rəngli mey şahzadə Fərhad,
Onun gül üzündən xaqan oldu şad.
Sevincdən yaş axdı dərhal gözündən,
Üzünə baxınca getdi özündən.
Ona hər an etdi min sevgi zahir,

Başına gül tökdü, gah da cəvahir,
Qonaqlar deyildi yalnız vurğunu,
Bütün Çin və Xəta sevirdi onu.
Çarxın ulduzları döndü bu sayaq,
Fəsl hesabından üç ay alaraq,
Bəzəndi atəşin güllərlə saray,
Hamı keflər çəkdi, mey içdi üç ay,
Vaxta ki, gülşəndə əsdi küləklər.
Daha qızılgüldən qalmadı əsər,
Güllər yox oldular torpaq içində.
Ağaclar gizləndi yarpaq içində.
Çəmənlər geyindi minadan paltar,
Göy kimi laciverd olmuşdu onlar.
Çəmənlər içində gözəl sərvlər,
Fərhadın qəddinə bənzəyirdilər.
Nə sərvü sənubər, onun hər halı,
Sərvü sənubərin oldu misalı.
Tuti ləleyiydi sanki yarpaqlar,
Hər ağac cənnətdə tovusa oxşar.
Təzə şirədəndi hər tükü onun,
Etmiş tacın, şaxdan, yarpaqdan donun.
Ağaclar deyilsə tovusu bağın,
Tovusa oxşatmış neçin ayağın?
Bildi yaxınlaşır yuxunun çağı,
Tükündə gizləndi tez bir ayağı.
Qızıl portağaldan yığdı xəzinə,
Tikdi yarpağından paltar əyninə.
Budur, bir yandan da incə sarmaşıq
Dolandı şaxlara sanki bir aşıq.
Bir yaşıl levhədir sanki çəmənlər,
Arxlar da gümüşdən bir xəttə bənzər.
Burada ayna tək sular parlardı,
Üstündə ətrafın xoş əksi vardı.
Yox o su bağların sayılır üzü,
Səbzə də o üzdə bir xətdir düzü.
Belə bir fəsldə aləm bəzəndi,
Üfüqlər yamyaşıl, hər tərəf şəndi.

O laciverd rəngli gülşənə getdi.
Zərif çəmənlikdə ziyafət etdi,
Mey içdi göy kimi mavi sarayda
Laciverd göyləri salmadan yada,
Geyib Çin ipəyi xaqanla Fərhad,
O gün Çin mülkündə oturdular şad.
Gümüş bədənlilər, o yaşıl donlar,
Yarpaq içrə sərvə bənzərdi onlar.
Qızıl şərab dolu yaşıl piyalə,
Yaşıl çəmənlikdə sanki bir lalə.
Çin piyaləsində şərabi-gülrəng,
Laciverd göylərdə batan şəfəq tək.
Şirin əllərində açı qədəhlər,
Gözəllər məclisdə saqilik edər.
Kim mey şirəsindən odlansa əgər,
Məzə sərinlədib, təskinlik verər.
Bütün adət üzrə danışdıq necə,
Təam mərasimi oldu öyləcə.
Gəldi başa çatdı burda da üç ay.
Dəmadəm kef çəkdi durmadan saray.
Kəhrəba rəngini alar ikən gün,
Yarpaq kəhrəba tək saraldı bütün,
Gəldi kəhrəba rəng sarayın çağı,
Onun kəhrəba tək açıldı bağı.
Yarpaqlar kəhrəba rəngini aldı,
Yamyaşıl çəmənlər soldu, saraldı.
Çün əsir olunca yelə ağaclar,
Saçdı yarpağını hər yana çinar.
Çinar, o içindən alovlar daşan,
Bu odu almışdır yarpaqlarından.
Qızıl saçan zaman su üstə yellər,
Sular xəncərinin ağzın etdi zər.
Odlu yarpaqlardan uçdu şərarə,
Sanki zərvərəqdir, oldu min parə,
Sarı yarpaq üstə qonunca qarğa,
Sarı lalə içrə bənzədi dara.
Saraldı söyüdlər aşıq üzü tək,

Sarılıq gətirdi elə bil gərcək.
Çəməndə hər ağac sanki sarı quş,
Uçub getmək üçün o hazır durmuş,
Qanadlarını da etmiş yarpaqdan,
Tökür lələyini yel əsən zaman.
Edirdi gecələr sübhün ruzgarı,
Səhər şəfəqi tək yarpağı sarı.
Kim aşiqlər kimi ah çəksə hərgah,
Rəngini saraldar bəllidir bu ah,
Bağda yarpaqları etmək üçün zər,
Xəzanın nəqqaşı qızıl əridər,
O bu məşqələrdə özün unutdu,
Bütün yarpaqları qızıla tutdu,
Günəşə oxşarsa zər saray əgər,
Yarpaqlar dövrədə ulduza bənzər.
Bir fəsil göstərdi cahana üzün
Ki, gün də, ulduz da parladı hər gün.
Şah ilə şahzadə gəlib bərabər
Əyləncə yerini şənlik etdilər.
Zəfəranı geydi onlar geyimi,
Hər iki aləmin günəşi kimi.
Qızıl sürahının içində gülrəng,
Yanır qızıl şərab qızıl suyu tək.
Ev qızıl, yer qızıl, orda dam qızıl,
Mey qızıl, qab qızıl, əldə cam qızıl.
Hər şey o sarayda qızıldır, zərdir,
Bəzəyi ulduzlar, mirvarilərdir.
Onun qızıl kimi bir görkəmi var,
Ərişi, arğacı qızıl şüalar.
Müğənni oxuyur yanıq havalar,
Qızıl qübbə içrə düşür sədalar.
Meyvələrdə ancaq narıncı, limon.
Narıncı heyvaya qoymaq olmaz son.
Orda həddindən çox çəkildi keflər,
Kef üçün yox idi bir ölçü, qədər.
Əyləncə içində burda da üç ay
Nəğməylə, şərabla kef çəkdi saray.

Sonra yarpaqları töküncə yellər,
Dey civə suları eylədi mərmər.
Hava kürk geyindi boz buludlardan,
Bulud civə saçdı havaya haman.
Qışın soyuqları Çin zərgəri tək,
Gümüşlədi sular lövhəsin gerçək.
Buluddan tökülən hər xırda qətrə
Donub, inci kimi səpildi yerə,
Çaylar yatağını eylədi xəncər,
Soyuq qətrələrdən düşdü incilər.
Göy etdi gecədən kömür sərəncam,
Şəfəqdən od saldı ora hər axşam.
O odu yandırdı sübhün yelilə,
Özü də əyildi isinsin deyə.
Ay tökdü hər geçə çeşməsindən buz,
Hər donmuş qətrədən olurdu ulduz.
Buz etdi yer üzün aynatək parlaq,
Buna Çin aynası söyləyin ancaq.
Soyuq, od təbindən istini aldı,
Daha qığılcımlar qəzəbsiz qaldı.
Qızıl güldə səncab istisi yoxdu,
Tülkü dərisindən şölə soyuqdu.
Qırmızı əqiqdi yanan kömür san,
Tər gülə oxşardı o donduğundan.
Qızıl od soyuqdu, qızılgül kimi,
Tüstü gül üstündə bir sünbül kimi.
Bu zaman başladı elə şaxtalar,
Sal daşa çevrildi o ipək sular.
Yoxsul, nəfəsilə isitdi əlin,
Köksünə bərk sıxdı sonra dizlərin.
Əlin qoltuğunda gizlədib hər an,
Çiynin uca tutdu qulaqlarından.
Məzacı yerində yoxdu deyə, gün,
Nur yerinə kafur saçmışdı bütün.
Cahan qarlarilə elə bil kafur,
Hava buzlarilə təmamən büllur.
Artıq soyuqların yetişdi dəmi

Qar yağıb ağappaq etdi aləmi.
Ağ kafur rəngdəysə geyimləri gər,
O, qu tükü kimi istilik verər.
Gəldi ulduzlar tək tamam qonaqlar,
Düzüldü məclisdə ülkər tək onlar,
Çin nazəninləri yığıldı həmən,
Tutub min naz ilə Çin qədəhindən,
Onun adı isə gər Çin fəğfuri,
Rəngi də həmçinin olmuş kafuri.
Xülasə, ordakı şənlik və büsat
Burda deyiləndən artıqdı yüz qat.
Keçdi şənlik günü yazdığımız tək.
Nə ki, yazdığımız, həm yüz qat yüksək.
Belə keçirdilər burda üç ayı.
Şahzadə bəzədi bu dörd sarayı.
Bunların hamısından məqsəd: şahzadə
Nəşələr içində qaldırsın badə.
Çün badə nəşəni hər an təzələr,
Məclisə tükənməz bir şənlik gələr.
Lakin o tərzini etmədi təğyir,
Dəyişmək olarmı nə yazsa təqdir?
Həm sözü, həm ahı, kədərlə doldu,
Qəlbinin qonağı nalələr oldu.
Birisi ağlarsa, ağlardı zar-zar,
Elin azarından tapardı azar.
Başı dumanladar atəşin sözlər,
O soyuq bir ahdan odlu ah çəkər,
Duyar el dərdindən onun könlü qəm,
O da yaxa yırtar, kim yırtsa o dəm.
Biri məhəbbətdən etsə rəvayət,
Deyər, təkrar olsun həmin hekayət,
Müfəssəl sorardı o işdən nişan,
Nişani qəlbində saxlardı pünhan.
Aşiqlər birləşsə o olardı şad,
Ələmdən, qüssədən xəyalı azad.
Ağlardı yetişsə nə zaman hicran,
Tökərdi gözləri yaş yerinə qan.

Xaqan bu işlərə baxdıqca bir-bir,
Gördü düz deyildir tökdüyü tədbir.
Heyrətlər bürüdü onu bu zaman,
Oğluna baxdıqca çaşırdı o xan.
Saqi! Qədəh gətir halım yamandır,
Qədəh ətrafına yol ver, amandır.
Qəlbə eşq atəşi salsa şərarə,
Ona mey suyundan yox başqa çarə.

## XAQANIN FƏRHADA TƏXTÜ-TAC TƏKLİF ETMƏSİ

Çaldı ölkə üstə kim şahlıq sinci,
O söz qoşununu düzdü birinci:
Düşünüb nə çarə eylədisə xan,
Qəzanın hökmünə tapmadı dərman.
O Fərhad dağının sərt gördü ucun,
O dağ kütləşdirdi tədbir qılıncın.
Lakin xan bu işdə qalmadı naçar,
Düşünüb bir çarə tapmışdı təkrar.
Çün onun yarıdan çox keçmiş yaşı,
Qocalıq önündə əyilmiş başı.
Fərhad isə artıq növcavan olmuş,
Həm müdrik, həm də ki, pəhləvan olmuş.
Ona nə ki, Çində xaqanlıq layiq,
Yeddi aləm içrə sultanlıq layiq.
Hər nə ki, lazımdır şah olmaq üçün,
Şaha nə lazımsa, o şeylər bütün
Ona verilmişdi həqq tərəfindən,
Nə lazım yoxlamaq onu təzədən?
Bütün eyblərdən varlığı xali,
Hər şeydə görsənir onun kəmalı.
Bir eybi vardısa Fərhadın, o da
Nalə etməsiydi hər vaxt dünyada.
Kim ki, şahlıq içrə tapdı riyasət,
Düz getməz işləri, yoxsa siyasət.

Onun könlü olsa riqqətə mayil,
Qəzəb naxışları tez olar zayil.
Saf olmaq nə lazım həm də bu qədər,
Sultanlıqla saflıq yerləşər məgər?!
Gər bir kəs dünyaya gəlir isə şah,
Salır xalq üstünə öz əksin allah.
Şah rəftar eyləsin hər kəslə gərək
O şəxsin özünün xasiyyəti tək.
Böyük tanrı qurmuş cənnət, cəhənnəm.
O, həm ədalətli, qəhr edəndir həm.
Şahlıq güzgüsünü hər kəs ki, alır,
O həqq varlığının zühuru olur.
Onun varlığına köməkçi olan
Sifətin aşikar etsin o zaman.
Bu sifətdən biri kimdə olsa kəm,
O şəxs yararsızdır şahlığa o dəm.
Yumşaq xasiyyətsə o, həddindən çox,
Şahlıq əzəməti əgər onda yox,
Düşmən həyatına, qəsd edərsə gər,
Əvəzində qəlbin qurban eyliyər.
Taleyin yayından, gər yağsa yüz ox,
Özünə götürər, özgələrə yox.
Bu iş dərvişlikdə yaxşı sifətdir,
Lakin şahlıq üçün pis xasiyyətdir.
Şah, cəza qılıncın tiz etməsə gər.
Qalxar xalq içindən yüz qanlı xəncər,
Quldurun paltarı batsa qanına,
Tacirlər ürəkdən sevinər ona.
Şahlar qorxutmasa zalımı hərgah,
O, bildiyin edər, zərər çəkər şah.
Haqsızlıq görərsə yetimlər əgər,
Məktəbli bu dərddən azaddır məgər?
O, demək olmaz ki, bunları bilmir,
Bilir, layiqincə əməl eləmir.
Bu hal mənim üçün çox çətin oldu.
O, məzlum aciz bir qəlblə doğuldu.
Gücdə aciz ikən önündə fillər,

Sinək nişini də qırmaz o əllər.
Fildə güclü pəncə bəs nəyə gərək
Qarışqanı belə incitməyəcək?!
Alim olsa belə nə mənası var,
Əgər qorxmayırsa ondan nadanlar?
Bu inandığından deyil özünə.
Mənasız görünür aləm gözünə.
Nə qədər düşünsəm işi dərindən,
Yalnız bircə çarə görməkdəyəm mən:
Gər ona tapşırsam bu səltənəti
O da tərk eyləyər həmin sifəti.
Düşərsə üstünə əgər bu işlər,
İşi rədd etməyib, rəhbərlik edər.
Çün o ellər üçün zəhmət çəkəcək,
Sərt adamlara da sərt olsun gərək.
Siyasətə qoysa bir adam bina,
Get-gedə xilqəti alışar ona.
İşin ləzzətini duyarkən ancaq,
Hər ləhzə səyi də bundan artacaq.
Xaqan bu fikirdən çox xoşdil oldu.
Çünki istədiyi şey hasil oldu.
İşə belə tədbir tapdığı zaman
Şahlıq məclisini çağırtdırdı xan.
Məşhur, qeyri-məşhur kim varsa, o gün
Ərkani-dövləti, çağırtdı bütün.
Yanında yer verdi şahzadəyə xan.
O, müşkül bir işdən danışdı asan:
"Hər işdə haqq mənim dadıma yetdi.
Mənə cahandarlıq inayət etdi,
Etdi Çin mülkündə məni hökmüran.
Qalibiyyət oldu qismətim hər an.
Mənə dövlət verdi imkandan artıq,
Mən özüm etdiyim gümandan artıq.
Xəyala sığmayan həm elə bir kam.
Elə bir nəşə ki, inanmır insan.
Bir oğuldan başqa, mənimçün xuda
Hər nə istədimsə, verdi dünyada.

Çün mənim mülkümdə yoxdu vəliəhd.
Zəhər dadı verdi əgər yesəm şəhd.
Bu qəmdən müfəssəl oldum pəjmürdə.
Həyatım bağında çox düşdüm dərdə.
Çün düşüb yerlərə sürtdüm üzümu.
Səninlə yarıtdı tanrı gözümü,
Hər nə eylədimsə haqdan təmənna,
Şükr, xoşbəxt olub yetişdim ona.
Arzumu verənə şükr edirəm mən,
Yüz artıq almışam gözlədiyimdən.
Haqq səni eylədi bilik çeşməsi,
Nə lazım hər kəsin tərifləməsi.
Nədən ibarətsə şahdakı qiymət.
Bunları zatına eylədi qismət.
Fələk fili çəksə səhərdən xortum,
Milçək xortumu tək bu sənə məlum.
Bilik dənizinə vurulsa yekun,
Utarid qətrədir yanında onun.
Yersizdir ağlını tərif eyləmək,
Günəşə təzədən işıqlı demək.
Sənə müdrik demək nəyə gərəkdir?
Bu, mey acı, şəkər şirin deməkdir.
Bax bu gün belədir haqqın rizası,
Qəlbimdə yer salır pirlik yarası.
Əlli vadisindən ötmüşdür yaşım,
Əzalər süstləşir ağarır başım.
Hər an düşünərkən mən öz işimdən,
Halım xarab olur, bax, günbəgündən.
Qocalıq eybini heç danmaq olmaz,
Əcəl gəlib çatmış dayanmaq olmaz.
Gənçlik həvəsinə düşsə ixtiyar,
Xəcalətdən başın aşağı tutar.
Varlıqda zəiflik, müşk üzrə kafur.
Yenidən müşk olsun kafur, nə məqdur?
Ölüm qasididir saqqaldakı dən,
Həyat səbzəsidir o qara ikən.
Cavanlaşmaq üçün onları üzmək,

Bu, öz matəmində saç yolmaq demək.
Özünü incidib beş tük qopartsan,
Bir az sonra olar on-on beş, inan.
Kim saç-saqqalına çəkər isə rəng,
Bir az sonra olar tez ala-bəzək.
Boyaqçının görüb bu təhər işin,
Daraq gülmək üçün ağardar dişin,
Daraq gülər isə, nə zərəri var,
Böyük bəla olar gülsə uşaqlar.
Qərəz ki, məkrilə hiyləylə qarı,
Bir daha qayıtmaz gəncliyə sarı.
Gənclikdə nəşənin yoxdur qədəri,
Qocalıq çətindir, çoxdur kədəri.
Çətin bir iş düşüb üzərimə çün,
Düşünmək lazımdır bu işlər üçün.
Şikayət dəmləri yetişmişsə gər,
Şikayət etmirəm mən zərrə qədər.
Çünki haqdan olmuş hər bir hidayət,
Mənə ağıl vermiş o binəhayət.
Nə vaxt arzu etdim mənə cavanlıq,
Həm də Çin mülkündə bəxş etdi xanlıq.
Qocalıq yoluna qaytaran zaman,
Köməkçi göndərdi səni yaradan.
Cahan axşamında bir ay olsa kəm,
Günəş tülu edər, var burda nə qəm?
Bağda kölgəsini azaltsa çinar.
Göy sərv böyümüşsə, nə kədəri var?
Qorxu yox meşəni tərk eyləsə şir,
Çün yerində qalır yırtıcı bəbir.
Kimin sənin kimi bir övladı var,
Həyat ağacında o peyvənd tapar.
Ölüm vaxtı gəlsə, o, qəm yeyərmi?
Dünyadan gedəndə getdim deyərmi?
Çün etibar yoxdur ömrə heç zaman,
Öləcəyi günü bilirmi insan?
Cavanda qocalmaq ümidi çoxdur.
Qocada gəncləşmək ümidi yoxdur.

Qocalıq dərdinə yoxdu bir dərman,
Könlüm qayğı çəkər bir işçün hər an
Ki, ölməkdən qabaq açıb gözümü,
Gənc görəydim bu taxt üstə özümü.
Yəni bu tacü-təxt, həm də səltənət,
Qoşun, bu mülkü mal, həm bu məmləkət
Səninlə olaydı barı müzəyyən,
Səni öz yerimdə görə idim mən.
Sənin ola idi bu padşahlıq,
Ölkənin üstündə edəydi şahlıq.
Şahlıq et, mənə də sən qulluq eylə,
Həm atalıq, həm də oğulluq eylə.
Xalqın xeyri nəysə, onu et, fəqət
Budur məndən sənə xeyir, məsləhət!"
Çün gördü məclisdə onu şahzadə,
Şah verir qədərsiz acı bir badə,
O eylə bir odlu ah çəkdi bu an,
Tüstüsü göylərə yetişdi haman.
Bu sözdən inciyib ağladı zar-zar,
Torpaqlara düşüb hıçqırdı təkrar,
Canları yandırıb bu zaman ahı,
Dedi: – "Çox yaşasın şahların şahı,
Göylərə yüksəlsin bu taxtı hər an,
Qoşunu çox olsun göy ulduzundan!
Onun nəşə bağı daim tər olsun,
Məclisində açan al güllər olsun!
Düşməsin əlindən tutduğu bu cam
Şərab şərbət olsun içəndə müdam.
O sözlər ki, mənə şah etdi xitab,
Mən kiməm ki, ona qaytarım cavab?
Çaşmışam, bilmirəm söz sərhəddimi,
Həm cavab verməyə mən öz həddimi.
Torpaq olsa belə həqir bədənim,
Yenə də bir-iki sözüm var mənim:
Etibar yox isə ömrə heç zaman,
Gəncə, həm qocaya bir baxır dövran.
Aləmdə var isə nə qədər mövcud,

Bir son günü vardır onların labüd.
Məşəl ki, bu məclis içrə odlanar,
Yüz şölə uçsa da o yenə yanar.
Bağda olar ikən yüz min ot bərbad,
Ancaq yüz il yaşar bir sərvi-azad,
Yüz təpə düz olar sel gələn çağı,
Durar öz yerində Elbrus dağı.
Kiçiyin kiçikdir həm ömr əsası,
Böyüyün böyükdür ömr qayası,
Əgər ömür artsaydı bir də ki, yüz il,
Milçək çəkə bilməz çəkdiyini fil.
Əgər ova çıxsa qartal ilə sar,
Sanma ki, o bunun ovunu ovlar.
Şahmatın taxtası boş qalsa əgər,
Şah yerini tutmaz piyada əsgər.
Axşam düşüb, günəş batdığı zaman,
Heç yüz min zərrədən qalarmı nişan?"
Həmin fikirləri deyib şahzadə,
Atanın şövqini etdi ziyadə:
"Ey gözümün nuru, – söylədi xaqan, –
Ey evimdə nurlu bir çıraq olan.
Hər sözün min candan artıqdır inan,
Həyat çeşməsindən, nəinki candan.
Gövhər mücrüsünü bu sözlə açdın,
İçindən dünyaya incilər saçdın.
Qulaq səndən tapdı parlaq bir inci,
Ancaq ki, mən zəif, zarın, birinci
Bu sözlər deyildi istəyi səndən,
Belə bir cavabı gözləməzdim mən.
Gər etsən sən məni özündən xoşdil,
İstəsən ki, olsun məqsədim hasil,
Hörmət eyləyərək sözlərimə sən,
Gərək bu arzumu qəbul edəsən".
Daha rədd etməyin yeri deyildi,
İşin qəbulunu zəruri bildi,
Atasının qəlbin o şad eylədi,
Yerləri öpərək şahzadə dedi,

Ki: “Çün şah üzrümü rədd etdi, o dəm
Nə həddim vardır ki, tərəddüd edəm?
Çün mən bir həqirəm iş böyük, fəqət
Bunları deməkdə duydum zərurət:
Mən heç nə bilmirdim bu günə qədər,
Bilmirdim üstümə düşəcək işlər.
Kef çəkmək olmuşdu hər zaman işim,
İşsiz yaşamaqdı mənim vərdişim.
Kömək etsə mənə bir-iki il şah,
Həmin bu işlərdən olaram agah.
Şah daim yanında yer versə mənə,
Baxaram işlərin keyfiyyətinə,
Görərəm ölkənin varın, kəsadın,
Tanıram yaxşısın, həm də fəsadın.
Xırda iş verilsə əvvəlcə mənə,
Ən xırda nöqsanım deyilsə yenə,
Müəyyən bir işi görüb bacarsam,
Bundan yaxşı bir iş verən o zaman,
Cahanda hər kəsin bəlli, işi var,
İşinə müəyyən bir vərdişi var,
Vərdişi yox isə çətin olur iş,
İş çox asan olur, olunca vərdiş.
Həmin bu vərdişi mən qazananda,
Nə hökm eyləsəniz, eylərəm onda”.
Gətir, saqi, mənə bir cami-şahı,
Kədər qoşununun olsun pənahı.
Şahlıqdan xoş gəlir qədəh gözümə.
Zülmü, özgəyə yox, edim özümə.

## FƏRHADIN İSKƏNDƏR GÜZGÜSÜ İLƏ MARAQLANMASI

Bu incə sözlərdən kitab düzəldən
Onu bu növ ilə bəzəmiş: həmən:
Fərhadın sözlərin xaqan eşitdi,
Arzu eylədiyi məqsədə yetdi.

Nəşə süfrəsini yenə yığmadı,
Bəlkə şadlığından Çinə sığmadı.
Etdi şahzadəyə nəvaziş hədsiz,
Nə hədsiz, bəlkə də, sonsuz, sərhədsiz.
Eyləmək istədi cahanı fəda,
Nə cahan, bəlkə də, o canı fəda.
Bu işdən sevindi xaqan o qədər
Tökdü mükafatçün çoxlu tədbirlər.
Başından istədi xəzinə saçsın,
Bununla oğlunun könlünü açsın.
Madam ki, yüksəkdi mehman o qədər,
Gövhər də yanında bir daşa bənzər!
Bu işdə çox fikrə daldı hökmdar!
Ki, Fərhada layiq onun nəyi var.
Çoxdu xəzinədə qəribə şeylər,
Girdi şahzadəylə ora bərabər.
Gəl, xəzinə demə, dərya və mədən!
Nə varsa, artıqdı saydan, qədərdən.
Ədədsiz evlər var, xəzinələr var,
Ağıl xəznədarı saysa yorular.
Qırx ev, qızıl ilə dolu otaqlar,
Hər evdə qırx ədəd şahlıq küpü var.
Bir evdə nişan bu qəribəlikdən,
Bir qızıl küpü var, mumdur deyəsən.
Kim ordan bir qədər ələ alardı,
Tezcə istədiyi şəklə salardı,
Yenə qırx ev, dolu əla parçalar:
Hər evdə yüz qırx min top zərxara var.
Hər yan ipəklərlə bəzənmiş qat-qat,
Fələklər görməmiş belə bir büsat.
O qədər çox idi onda Çin malı
Acizdi dərdindən insan xəyalı.
Qəribə şeylərin sayı yox idi,
Görünməmiş şeylər həddən çox idi.
Üstündə olunmuş yüz çöhrə təsvir,
Gözəlliyi ağlı heyran eyləyir,

Tikili paltarın hesabımı var!
Nə kəsilmiş nə də tikilmiş onlar!
Onları yaradan usta bir əldi,
Toxunduğu dəzgah çox mukəmməldi.
İpək o qədərdi, yoxdu ədədi,
İpək bəzəkləri hesabsız idi.
Bir xalat gətirtdi şah xəzinədən,
Ondan, onunu da bir nazik bədən.
Geysə görünərdi yenə də təni,
Qızılgül rəngində zərif bədəni.
Müşk torbaları həm xalvar-xalvar,
Tökülmüşdü orda anbarbəanbar.
İnci, dürr orada elə çox idi,
Mində birini də sayan yox idi.
Orda hər sulu ləl göz yaşı tökür,
Ruhu candan alır hər bir təmiz dürr.
Büllurdan, yaşəmdən minlərcə qablar,
Hər biri, bir elin vergisi olar.
Min cür şey göstərdi həm xəzinədar,
Şah da, şahzadə də nəzər saldılar,
Baxdıqca onlara heyran qaldılar,
Gah gülüb, gah da baş yırğalayırlar.
Çün, tamaşa bitmək vaxtı yetişdi.
Fərhadın gözü bir sandığa düşdü.
Bir qızıl sandıq var orda büllurdan,
Demək olmaz onu yaratmış insan.
Hər şey üzərində əks olunardı.
İçində qəribə nə isə vardı.
O şey sandıq içrə qalırdı mübhəm.
Qiymətli daşlarla bağlanmış möhkəm.
Ona sandıq demə, afət hasarı.
Qapısın bağlamış bərk qəl-ədarı
Ki, afət qələsi çox möhkəm olar,
İçindəki sirlər həm mübhəm olar.
Birinci nəzərdə görərkən bunu
Şahzadə can atdı öyrənsin onu.

Dedi: – "Çox nadirdir, bu mücrü aşkar,
İçində, söyləyin, onun nə sirr var?
Açarı hardasa, tapılsın dərhal,
Qıfılı açılsın bilinsin bu hal!".
Yumşaqlıq göstərib bu işdə xaqan,
Üzr istədi ondan bir xeyli zaman.
Dedi: – "Kimsə bilmir sandıqda nə var,
Qıfıl bağlı qalmış itmişdir açar,
Onu gördün bəsdir, bu fikirdən keç.
Biz də içindəkin görməmişik heç".
Eşitcək bu üzrü şahdan şahzadə,
Həvəsi daha da oldu ziyadə,
Dedi: – "Nə iş görsə insan əlilə,
Mahiyyətin anlar fikir yolilə.
Bütün elmlərə girdim müfəssəl,
Bir məsələ yox ki, mən etməyim həll.
Məndən gizli qalsın bəs bu sirr nədən?
Onu layiqincə bilməyincə mən,
Ürəyim yerində eyləməz qərar,
Bir ləhzə təsəlli tapmaz aşikar".
Nə qədər bəhanə gətirdi, xaqan,
Bundan maraq artdı onda hər zaman.
İşi gecikdirib düşündükcə xan,
Oğlunda qalmadı heç tabü-təvan.
Şah işi hər yandan təftiş eylədi,
Söyləməkdən başqa çarə yox dedi.
Əmr etdi, sandığı açdılar o an.
Çox parlaq bir ayna çıxdı sandıqdan.
O işıq saçırdı şərq günəşitək,
İskəndərin imiş bu ayna demək.
Beyza kimi idi sədəf ilə dürr,
Fələk sandığında o sanki gündür.
Kim ki, bəzək vermiş o qədər ona,
Sirrini gizlincə yazmış dalına.
Ki: "həmin aynada aks edir cahan.
Günəştək parlaqdır, şəffafdır ondan,

Onu yaratmışdır İskəndər Kəbir,
Bu ondan dünyaya bir xatirədir.
Dörd yüz alim ilə cəhd etmiş ona.
Hər alim əvəzmiş bir Əflatuna.
Bilərək dünyanın hər sirrin aşkar,
Cahan filosofu idilər onlar.
Xoşbəxt ulduzları düz bilərdilər.
Bu ayna üstündə əlləşərdilər.
Neçə il çalışıb edib müdara,
Çıxardı bu işi o aşikara.
Hikməti-cahandı bu güzgü inan.
İçində əcaib bir tilsim nəhan.
Kim onu açmağa gər səy qılsa,
Onun səyi ilə sandıq açılsa,
Gəlib bu güzgünü alarsa əgər,
Bərraq üzünə o, salarsa nəzər,
Ömründə ən məchul qəribə işlər,
İstər nəşə olsun, istər qəm, kədər
Tanrıdan nə isə görmək qədəri,
Qəzanın onunçün edəcəkləri,
Güzgüyə baxarkən, görünər haman,
Güzgü gizlin sirri eyləyər əyan.
Lakin bu sandığın açılması bil,
Fəlakət gətirər, xeyirli deyil.
Kim onu açarsa düşünsün gərək,
Bu sirri bilməkçün nələr çəkəcək:
Olduqca bəxtiyar ölkədir Yunan.
Hikmətlər bəzəmiş onu hər zaman.
Orda göy sirrini bilən həkimlər
Hesaba gəlməyir, çoxdur o qədər.
Daşı həkimlərçin incidən tacdır.
Hər xəstəlik üçün otu əlacdır.
Kəskin külələri, uçurum dağları,
Zirvəsi yeddi qat göydən yuxarı.
Bir kimsə gedərsə Yunana sarı,
Uzaqdan görərkən həmin dağları,

Üç böyük məsafə qalar, nəhayət,
O, üç mənzildə var üç böyük afət.
Birinci mənzildə əjdər bir ilan,
Qəhrindən yaratmış onu yaradan.
İkinci mənzildə var bir əhrimən,
Qəzəbdir, afətdir sifətlərindən.
Üçüncü mənzilin bir tilsimi var,
Hər ikisindən də bu qorxunc olar.
Kim bu üç mənzili keçərsə əgər,
Dördüncü mənzildə o dağı görər.
Bu dağdan keçərkən görər mağara,
Hicranlı gecə tək rəngi qapqara.
İçində bir Sokrat vardır yeganə,
Ona Sokrat demə, Boqrat zəmanə.
Həkimlər həkimi sağ isə əgər
Yolçunun müşkülün asan eyləyər.
Əgər ki, köçmüşsə artıq dünyadan,
Gələnin arzusu nəysə o zaman,
Onun ruhu üçün etsə dualar,
Çətin işlərinin bəndi açılar".
Şahzadə oxuyub bunu qurtardı,
Onun həlli üçün bir yol axtardı.
Ürəyi maraqla o qədər doldu,
Yeməyi, yatmağı, bu fikir oldu.
Onun bu işindən olarkən agah,
Rədd edib tələbin ləngidirdi şah.
Şah, işi nə qədər uzatsa, ancaq,
Oğlunda o qədər artırdı maraq.
Əgər oğul çətin bir hala düşdü, –
Ata bundan çətin zəvala düşdü.
Ağırlıq düşsəydi oğluna əgər,
Ata hiss etdiyi ondan da betər.
Saqi, bihuş edən şərab ver bizə,
Çətin bir iş düşdü üzərimizə.
Nə qədər sərt olsa bəxtimiz, inan,
Ona bihuşluqdur yeganə dərman.

## FƏRHADIN YUNAN ÖLKƏSİNƏ YOLA DÜŞMƏSİNİN QƏRARA ALINMASI

Bu möhnəti təsvir eləyən nəfər
Vəqədən bu sayaq vermişdir xəbər:
Fərhaddan üzünü tale döndərdi,
Qəlbini incidib, cəfalar verdi.
Fərhadın qalmadı səbri, qərarı,
Getdi əldən tabi, həm ixtiyarı.
Qorxurdu axırda divanə olsun,
Dosta, aşinayə biganə olsun.
Gizlədə bilməyib o bu sevdanı,
Çağırdı gizlincə Mülk-aranı,
Ona nəql eylədi macərasını,
Könlünü incidən bu bəlasını.
Dedi: – "Ya dilənçi, ya da şah olsun.
Ya qafil, yainki bir agah olsun.
Həm dövlət, həm zillət, həm yaxşı, yaman,
Əbədi yazılmış insana haqdan.
Qədər yazan şeyə məgər çarə var?!
İnsan kəmalına aydındır bunlar.
Taleyin hökmündən nə şah, nə gəda
Azad ola bilməz heç bu dünyada.
Qəzanın yazdığı qaranı pozmaq
Su üstündə yazı yazmaqdır ancaq.
Qədərin yazdığı qaranı heç kəs
Bu dünyada pozub, dəyişə bilməz.
Dünyanın işini kamil bilənlər
Tale qarşısında göstərməz hünər.
Yer üzünə hakim olsa da insan,
Can qurtara bilməz yenə baxtından,
İnsan acizliyi bəllidir mənə.
Taleyin önündə acizəm yenə.
Qəzanın alnıma yazdığı sözü
Ancaq poza bilər qəzanın özü.
Əzəldən bu idi haqqın rizası:

Mənə qismət olsun eşqin bəlası.
Kimin öz ağlından qəlbi alsa nur,
Gərək tutsun məni bu işdə məzur.
Mən bu gün düşmüşəm bir yaman hala,
Bundan ölkəmiz də çəkəcək bəla.
Başqa yolum yoxdur, qalmışam naçar,
Belə yazı yazıb o pərvərdigar...
Nə çarə, çox müşkül görürəm işi,
Hökmümlə qəzanın sönmür atəşi.
İndi sən xaqanın hüzuruna get.
Mənim taleyimdən onu agah et,
Atalıq haqqı ki, vardır arada,
Yardım etsin mənə bu macərada.
Qoy mənə yol üçün görsün ehtiyat,
Dua oxuyarkən etsin məni yad.
Xeyir-dua verib olarsa aram,
Şəksiz, mən bu işdə xeyir taparam.
İcazə verməzsə bilir yaradan,
Saxlamaram ondan sirrimi pünhan.
Dönmərəm yolumdan avara olsam,
Əgər yoxsul düşsəm, biçarə olsam.
Gedərəm, bilmərəm nə dağ, nə dərə,
Məqsədim uğrunda düşüb çöllərə...
Yoluma div çıxsa, əjdaha çıxsa,
Tilsim içrə yüz min dərd-bəla çıxsa,
Göz yumub qorxmaram heç bir bəladan,
Canımı verərəm məqsədimçin mən.
Qərarım qətidir, sən eylə agah,
Yaxşı olar əgər izn versə şah".
Fikrini söyləyib qurtardı bu dəm.
Ürəkdən bir daha eylədi qəsəm:
– "Niyyətim qətidir, fikrim dəyişməz,
Olacaq hər səyin bu yolda əbəs".
Mülk-ara olunca bu işdən agah,
Çəkdi ürəyindən çox dərin bir ah.
İstədi eləsin ona nəsihət,
Nəsihət qapısı bağlıydı fəqət.

Necə çalışdısa tutsun qolunu.
Gördü ki, bağlamış o, söz yolunu.
Gördü onda vardır qəribə bir hal.
Dili söz tutmayır olmuş sanki lal.
Vücudu atəşdən yandı, qaraldı,
Ahının tüstüsü göyə ucaldı.
Bu acı tüstüdən gözü yaşardı,
Ağlayaraq şahın yanına vardı.
Gözünün yaşını hey axıdaraq
Dedi ki: "– Ey, şahım, bir an tək qalaq!"
O sonsuz əzabla hər nə ki bilir,
Şahın hüzurunda söylədi bir-bir.
Dinləyib oğlunun macərasını,
Yırtdı köynəyinin, şah, yaxasını,
Hər ikisi yanıb bu dərdə yaman,
Deyib ağladılar bir xeyli zaman.
Ağlayıb boşaltdı ürəyini şah,
Vəzir yeri öpüb, çəkdi dərin ah.
Təskin etmək üçün onu bir qədər,
Nəsihət yoluyla söylədi: – "Əgər,
Ey şahım, olmuşsa qəzadan bir iş,
Çarə tapmaz, ona, inan, bu gərdiş.
Ey bu günün şahı, aqili-zaman,
Qəlbindir dövləti işıqlandıran.
Fayda verməz artıq bir yol göstərmək.
Yanıb ağlamaqdan yaxşıdır kömək.
Çarə tapsa ağıl bu işə əgər,
Nəticədə həkim yol tapa bilər.
Təqdir olsa əgər çarəyə mane
Olmalı qəzanın hökmünə qane!"
Şah dedi: – "Sözlərin bir şəfəqli şam,
Şirin nitqin etdi qəlbimi aram.
Heç o şirin candan doymaq olarmı?
Onu bu hal ilə qoymaq olarmı?
Nəsihətdir könlün dərdinə dərman,
Nəsihət etməli var ikən imkan...
Əgər təskin tapsa, səadət olar.

Könül kamə yetər, can rahət olar.
Əsər eyləməsə ona nəsihət.
Başqa bir yol tapmaq lazımdır, əlbət...”
Bu sözlərdən sonra vəzir və xaqan,
Tərəddüd etdilər bir xeyli zaman.
Düşünüb hər necə tədbir etdilər,
Bir fayda görməyib, təğyir etdilər.
Təkid göstərirdi fikrində Fərhad,
Vermirdi nəsihət bir fayda, heyhat!
Nəsihət eyləyib, öyüd verirkən,
Daha çox yanırdı qəlbi şövqdən.
Şah çarə tapmayıb, olaraq məyus.
İstədi eləsin oğlunu məhbus.
Həbs etmək fikrini atıb kənara,
Düşündü ki, tapsın bir başqa çarə.
Dəyməyib qəlbinin arzularına,
Sevdalı ömrünün gənc baharına.
Qət etdi ki, yığsın Çini bir yerə,
Yunan ellərinə çıxsın səfərə.
Özü də oğluna bir həmrah olsun,
Yaxşıdan, yamandan ta agah olsun.
Əvvəlki fikrindən o əl çəkərək,
İstədi ki, etsin oğluna kömək,
Onu rahat qoyar fikri, xəyalı,
Düzələr azacıq pəjmürdə halı.
Yenə də olmasa bir qədər rahət,
Görək yaradandan nədir məsləhət.
Şah çox təqdir etdi bu imtahanı.
Çağırdı yanına o, Mülk-aranı,
Dedi: – “Tez Fərhadın yanına sən get,
Mənim bu fikrimi ona bəyan et!” –
Vəzir şahzadənin yanına getdi.
Şahın bu fikrini ona ərz etdi.
Fərhada bu xəbər çox fərəh verdi,
Atası rəyinə meyl göstərdi,
Bilirdi ki, desə yalnız vararam,
İşi öz başıma mən bacararam,

Haqqında bu işə olmaz rizası,
Dərdü-qəm içində ölər atası.
Tək atası deyil, ölkəyə belə,
Hətta göy üzünə düşər vəlvələ.
Razılıq eyləyib dedi: – “Tez ol, get
Yola çıxmaq üçün bir tədarük et”.
Vəzir eyləyincə məqsədi hasil,
Gəlib xaqanı da eylədi xoşdil.
Müəyyən edildi qoşun üçün yer.
Başçılar hər yandan əmr verdilər.
Doldur badələri, saqi, mədəd qıl!
Bir cam şərab içək, məst olsun ağıl.
Ver səfər camını, məni xumar et,
Divə, əjdahaya bir sehrkar et!

## FƏRHADIN XAQAN İLƏ YUNAN ÖLKƏSİNƏ SƏFƏR ETMƏSİ

Mənalar yolunu tapan o nəfər
Bu növ ilə çəkdi sözlərdən əsgər:
Şah, işi xoş görüb eylədi niyyət
Ki, Yunan mülkünə etsin əzimət.
Əmr etdi, yürüşçün şeypur çalsınlar,
Toplansın əsgərlər, nə qədər ki, var.
Bir anda, ölkədə, bütün hər yandan,
Qoşunlar yığışıb gəldilər haman.
Bir saysız-hesabsız qoşun oldu cəm,
Yarandığı gündən görməmiş aləm.
O qoşun dəryası cuşa gələrək,
Qalxır asimanın dəryasına tək.
Aləm görməmişdi bunca əsgəri,
Ətlasın, Xaranın yoxdu qədəri.
Hər çadır fələyin karigahıydı,
Qapısı göylərin barigahıydı.
Onun uclarında firuzə çadır,
Elə bil, göylərdə günəşlə aydır.

Dövrəsində bağı qızılla gümüş
Elə bil, ulduzlar yerə tökülmüş.
Çadırın qübbəsi nəhayət bilməz,
Onun divarları ölçüyə gəlməz.
On iki payəli bir təxti-ali.
On iki bürcü də ulduz misali.
Nəsri-tair uçsa yüz illər yenə.
Çata bilməz onun bir qülləsinə.
Onun ayağından sallanır zəri,
Sanki uçan ulduz yarır göyləri.
Cəmşid sarayına bənzər görkəmi,
Gülləri parlayır bir günəş kimi.
Çadırların sayı ulduzlar qədər.
Qoşun qarışqaya burda bərabər.
Zorla bu axına qatlanmış torpaq.
Dünyanın üzünü sel tək alaraq,
Onlar yola düşdü Yunan mülkünə,
Eşq, qoşun çəkdi o can mülkünə.
Hərəkət eylədi nizamla əsgər.
Qayda-qanun ilə başlandı səfər.
İki gün bir yerdə tutmayıb qərar,
Hey mənzil kəsdilər, mənzil aldılar
Yürüşün sorağı çatınca haman,
Xalqın çıxır idi huşu başından.
Coşur bu zəfərdən xalqın vüqarı,
Bağlı qapıların gəlir açarı.
Alınır ölkələr bir çox yerlərdə.
Deməyin ölkələr, sular da, yer də...
Aylarla keçdilər səhranı, dağı.
Göründü qarşıdan Yunan torpağı.
Xaqanın qoşunu gəlmişdir deyə,
Xəbər yayılınca bütün ölkəyə,
Həm zəngin, həm yoxsul çıxdı qabağa;
Şahı töhfələrlə salamlamağa.
Hikmət sahibləri daldı işrətə.
Elə bil Utarid çatdı şöhrətə.
Təntənə içində hamı bəxtiyar.

Şahın qabağına belə çıxdılar.
Hər nə var ölkənin yaxşı-yamanı,
Yığıb gətirdilər malı-qaranı,
Fələk qüdrətinə baş əyib, yeksər
Bütün məmləkəti şaha verdilər.
Şah hər kəsə lütfi-inayət etdi,
Haqqın qanununa riayət etdi.
Göstərdi hikmətə ehtiramını.
Bildirdi hər kəsə öz məqamını.
Öpdürdü əlini hikmət əhlinə,
Onlar dua etdi xaqanə yenə.
Hikmət əhli tamam tapanda təskin,
Xaqan söz başladı səsində təmkin.
"Etdiksə buraya bu gün əzimət,
Yoxdur bu yürüşdə bir özkə niyyət.
Məmləkət fəth etmək deyil qəsdimiz,
Təhlükə fəth etmək fikrindəyik biz.
Ali qəlbimizə olmuş aşikar
Ki, haman ölkədə bir belə yer var:
Bu torpaq malikdir bir böyük dağa.
Tamam qranitdir başdan-ayağa,
Qranit içində vardır mağara,
Ayrılıq dəmində gecə tək qara.
Sokrat bu zülmətə vermiş səhəri.
Nur çəkmiş gecəyə sanki Müştəri..."
Yoldakı üç çətin mənzili bir-bir
Bacardığı kimi, eylədi təsvir.
Sözünü qurtarıb etdi işarə:
"Kim nə bilir desin, artıq nə çarə.
Gedək hansı səmtə, nə yana sarı,
Söyləyin hardandır onun yolları?"
Qalxıb yer öpdülər hikmət bilənlər:
"Xaqana arzusu olsun müyəssər,
O yer ki, şah ondan nişanə arar,
Burda onu bilən tək bir həkim var,
Beş yüz ildən çoxdur onun həyatı.
Süheyla həkimdir ellərdə adı.

Zəmanə Sokratı odur Yunanda.
Mağaranın sirri gizlidir onda
Yaşar inzivada, duası təmiz,
Hünərdə şagirdik ancaq ona biz.
Bilir həqiqəti o əhli-hikmət.
Bu işin halından agahdır əlbət.
Bir az eşitmişik bu sirri biz də.
Nə desəniz varıq xidmətinizdə...
Lakin bizə deyil mənası əyan,
Təhqiq etməmişik onu heç zaman.
Bir şey xəbər alsa gər dövlət əhli
Bilmirik deyərmi heç hikmət əhli?!
Bu sirrin ondadır yalnız açarı,
Buyruq verin gedək biz ona sarı".
Şah istədiyindən tapınca nişan,
Şahzadənin qəlbi şad oldu haman.
Tumar-sığal verdi mehtər də ata.
Mindilər atlara oğulla ata.
Getdi hikmət əhli onlarla birbaş.
Şahla şahzadəyə oldular yoldaş.
Bir qala göründü çöldə bu ara –
Həkimin olduğu o tək mağara.
Bir tərəfdə qoyub hamı atları,
Piyada getdilər qalaya sarı.
O həkim şəxslərdən birisi getdi,
Süheylanı işdən xəbərdar etdi:
"Əbədi iqbala olaraq həmrah,
Utaridə gəlmiş Xurşud ilə Mah".
Eşitcək Süheyla belə sözləri,
Söylədi: – "Gəlsinlər, deyin, içəri".
Ədəblə girdilər Fərhadla xaqan,
Qalxdı öz yerindən həkim bu zaman,
Hər ikisi ilə görüşdü xoşhal,
Onlar da öpdülər əlini dərhal,
İstəyirdi etsin bu müşkülü həll,
Yer verib, oturtdu onları əvvəl,
Yol çətinliyini soruşdu bir-bir,

Dedi: – “Məramınız gəlməkdən nədir?!
Bu uzun yollarda çəkib əziyyət,
Gəlməkdə nə imiş söyləyin niyyət?”
Nəql eylədi ona xaqan bu halı.
Fərhadın başına düşən xəyalı.
Həkim dedi: – “Bildim, məqsədi indi”.
Həm qüssəyə daldı, həm də sevindi.
Etdi şahzadənin ürəyini şad,
Dedi: – “Sənin adın qoyulmuş Fərhad”.
Süheyla, qonağı bir təhqiq etdi,
O hər nə sordusa bu təsdiq etdi,
Öpərək alnından o böyük insan
Səcdə edib dedi: – “Şükr yaradan.
Ölmədim, bu çərxi-fələk yenidən,
Verdi istəyimi, xoşbəxt oldum mən.
Neçə yüz il var ki, yerim mağara,
Düşmüşəm ömrümdə çox bəlalara,
Mənə Camasibdən qalmış bu xəbər,
Vəsiyyətnamədə vardır bu sözlər;
Məndən sonra min il bu çərxi-dövran,
Dolanıb keçəcək yerin başından.
Çıxaçaq şahzadə Çin ölkəsindən.
Gələcək iqballa Yunana həmən.
Adı Fərhad, özü hər işdə mahir.
Səadət ulduzu üzündə zahir.
Dözüb zərbəsinə işgəncələrin,
Açar tilsimini o İskəndərin.
Ancaq yolunda bil, iki mane var,
Onları dəf etmək çox müşkül olar.
Biri əjdahadır yol üstə yatmış,
Nəfəsi od saçır onun yay və qış,
Biri əhriməndir açıb savaşı,
Başına göylərdən yağdırar daşı,
Münəccim Süheyla, o həkim insan,
Məndən sonra elmin varisi olan,
Bu xeyir-duamı qoy qəbul etsin,
Tapşırdığım işin sonuna yetsin.

Bu məqsədə doğru gedəndə Fərhad
Kömək etsin ona bu yolda qat-qat.
Çox şahlar bu işə çox can atacaq.
Fərhadındır, bilin, bu qismət, ancaq.
Yaxşı bilsin bunu Süheyla gərək.
Etsə, etsin ancaq Fərhada kömək.
Qorxunc əjdahanı öldürsə Fərhad.
Bu xoş xəzinədən aləm olar şad.
Divi öldürüb o qurtarsa ancaq,
Süleyman möhrünü burda tapacaq.
Bu tilsim onunçün hər şeyi açar,
Cəmşidin camı da olar aşikar.
Bunlar xoşbəxtlikdən çatarsa ona,
Qoy təqdim eləsin o da xaqana.
Ona bəsdir yalnız Sokratın özü,
Bir də İskəndərin məşhur güzgüsü,
Bu işdən Sokrata itaət etsin,
Güzgünün dalınca sürətlə getsin.
Nələr gələcəkdir başına hər an
Güzgüdə görəcək, nə varsa tamam".
Həkim sözlərini belə qurtardı:
"Böyük yaradana bu aşikardı.
Bu tapşırıqla mən edib iftixar,
Neçə yüz ildir ki, çəkdim intizar,
Yolunda çıxacaq müşkülə bir-bir
Mən çoxdan bəridir tökmüşəm tədbir".
Qalxıb mağaranın yanına vardı.
O yerdən bir cürə şüşə çıxardı.
"Səməndər yağıyla, – dedi, – həmişə,
Bil ki, dolu olur gördüyün şüşə.
Çox atəşgah vurmuş sinəmə dağı
Mən cəm eyləyincə bu qədər yağı.
Qılıncla əfini vuran zamanda,
Əjdaha göylərə toz qaldıranda,
Zirehli paltarda səməndər tək sən,
Öz bədəninə bu yağdan sürtərsən.
Sən o əjdahayla vuruşan zaman,

Yağ qurtarar səni onun odundan.
Əzablar içində əjdər öləndə,
Xəzinə sahibi olarsan sən də.
Orda daş-qaş vardır ulduzlar qədər.
Xatırından çıxar o əziyyətlər.
Qəribə bir şey də o xəznədə var.
Bundan əhrimən də çox bədbəxt olar.
Əhrimənə matəm tutanda fələk,
Möhür öz əlinə sənin keçəcək.
Əlin hər tilsimi açmağı bilər.
O zaman bu gözəl qiymətli xəbər,
Bir gümüş lövhədə yazılı olar.
O divin boynunda asılı olar.
Tilsim açmaq sənə olunca asan,
Cəmşidin camını orda taparsan.
Camın dövrəsində vardır nəqşələr.
Onları əlilə çəkmiş İskəndər.
Bu nəqşi o camın üstə görəndə
Sokratın halını bilərsən sən də.
Görəndə güzgü tək öz camalını,
Anlarsan güzgünün hər bir halını.
Güzgünün sirrini biləndə artıq,
Başına gələnlər görünər açıq.
Bundan sonra yoxdur icazə daha
Sirrin pərdəsini artıq açmağa...”
Bu sözləri deyib camı verərək,
Söylədi: “Get, yolçu yolunda gərək!”
Verdi mənzillərdən o bir-bir nişan.
Dedi ki: – “Gecikmə, yola ol rəvan!
Kama çatmağına vardır ümidim.
Bu ümidlə gərək dünyadan gedim”.
Bu növ ilə ona təlim elədi.
Canını tanrıya təslim eylədi.
Göz yaşıyla onu təmiz yudular.
Bu yerdəcə ona qazıldı məzar,
Sonra burda qaldı o hikmət əhli.
Yola rəvan oldu bu dövlət əhli.

Keçib mənzil-mənzil yol qət etdilər.
Həkimin dediyi yerə yetdilər.
Axırda çatdılar eylə bir yerə,
Əjdahanın idi bütün o dərə.
O yerdə qalaraq axşama qədər,
İstirahət edib nəfəs dərdilər,
Gecə əjdahasi qaldırdı duman.
Əzəmətli göylər tutuldu ondan.
Günəşin xəznəsi batdı tozlara.
Viranələr göyü oldu qapqara.
Yandırıb işrətin odunu, haman
Orda başladılar kefə bu zaman.
Gəl saqi, başlandı, durma, mey dəmi.
Bir ömür gecəsi xoş tut aləmi!
Mey iç bir dəm qalxsın işrət nəvası;
Məhv etməmiş səni ömr əjdahası.

## FƏRHADIN ƏJDAHA İLƏ VURUŞMASI

Gecə dumanını dağıtdı səhər,
Gümüş lövhə qalxdı, sübh tazə-tər.
Gecə zülmətindən gün oldu əyan,
Əjdaha dili tək çıxdı kahadan.
Fərhad qüsl edərək ağladı bir az,
Pak oldu tanrıya eylədi niyaz.
Süheyla Fərhada nə təlim verdi,
Şahzadə yerinə bir-bir yetirdi.
Üz qoyub torpağa dua eylədi.
Özünə tanrıdan kömək dilədi.
Qoyub atasının ayağına baş,
Halallıq istədi, tökdü qanlı yaş.
Xaqan yaxasını cırıb, didirdi,
Ağlaşdı camaat görüb bu dərdi,
Oğul hökmdardan dilədi aman;
Demə hökmdardan, qoşundan, xalqdan.
Hündürdən qoşun da, xalq da ağladı.

Fələyin bağrını bu səs dağladı.
Oldu ulduzlara sanki hökmdar,
Atlı əjdaha tək yaman zəhmi var.
Silaha qərq oldu vücudu bütün,
Elə bil parladı səmalarda gün.
O mənzilə sarı atı sürərək,
Dilədi tanrıdan özünə kömək.
Oğlunun halını görüncə xaqan,
Özünü toplayıb getdi arxadan.
O, mənzilə tərəf atını sürdü.
Orda əjdahadan əlamət gördü.
Qatran tək qapqara düzü görüncə,
Sandı ki, yolunu bürümüş keçə.
Fəraq əyyamı tək əbədi zülmət,
Ölüm gecəsilə etmişdi ülfət,
Hicran tək qaradır gecənin donu,
Əjdaha nəfəsi qaraltmış onu!
Külə batmış kəhər gedir çaparaq,
Tozdan at, gecə tək qaralmışdı, bax?
Bir üfunət yeli əsdi bu zaman,
Cənnətin xoş ətri yox oldu ondan.
Bu iy təsir etdi hər bir nəfərə.
Yıxıldı əsgərlər atından yerə.
Fərhad dişlərini qıcadıb bu dəm,
Bəla qarşısında durmuşdu möhkəm.
Göründü uzaqdan qorxunç mağara,
Fərhad üz döndərdi tələsik ora.
Çatdı insan iyi o əjdahayə,
Əcəl nizə vurdu min bir bəlayə.
Heybətlə kahadan çölə süründü,
San göy qübbəsindən bəla göründü.
Hirsi bir cəhənnəm oduna bənzər.
Tüstü kimi hər an qıvrılıb gedər.
Nəfəsindən alov sel kimi axır,
Hər bir qığılcımı dünyanı yaxır.
Tüstü tək nəfəsi bir qara bulud,
Qığılcımı şimşək bərabərdə tut.

Vücudu bir bəla, bir möhnət dağı,
Sanki bir kahadır ağzı, dodağı.
Tüstü və atəşlə doludur kaha,
Dağ kimi uzanmış orda əjdaha.
Bir bəla dağıdır yolları kəsir,
Vücudu sel kimi rahətsiz əsir.
Özü-dağa bənzər, başı bir dimdik,
Bir qara daş kimi dayanmış dimdik.
Gözləri adama baxan zamanda,
Odlu neft bulağı qaynayır onda.
Burun deşikləri boruya bənzər,
Hər biri od saçan kürələr qədər.
Ağzından alovlar püskürən zaman,
Sanki alov qalxır neft qaynağından.
Fələk kimi təni dağü-bəladır,
Hər qolu, hər budu bir əjdahadır.
Əcəl pəncəsidir ondakı pəncə,
Yeddi qat göylərə vermiş işgəncə.
Onun hər dırnağı, sanki, bir oraq,
Orağı almastək itidir ancaq.
Vücudunun rəngi gül rənglər kimi,
Üstü naxışlıdır pələnglər kimi.
Yerə quyruğunu çırpan zamanda
Sanki şimşək çaxır coşqun tufanda.
Zülmətə qərq edir tozu cahanı,
Sürmətək qaraldır mavi səmanı.
Ağzı od püskürür, dişlərində qan
Belə bir heybətlə çıxır kahadan.
Gözüylə baxanda şahzadə sarı,
Qəzəbdən qalmadı səbri qərarı.
Elə bil yüyürür onun üstünə,
Ədəm əjdahası, o can qəsdinə.
Fələk şeypurunu zilə çəkərək,
Ağız açır bəla darvazasıtək.
Nəfəsindən odlar saçaraq müdam,
İstədi yemini bişirsin tamam.
Qızartdıqdan sonra onu bir təhər,

Alıb mədəsində yaxşı həzm edər.
Açılar bununla tez iştəhası,
Qalan əsgərlər də olar qidası.
Şahzadə qorxmadı əsla bu oddan,
Ona sirri həkim etmişdi əyan.
Əjdahanın odu etmədi əsər.
Yenidən bürüdü onu qanlı tər.
Əjdaha Fərhadı udmaq istədi.
Şahzadə "ey tanrım, kömək et" – dedi.
Qövsi-qüzeh kimi gərilmiş yaya
Qoyaraq oxunu, atdı o taya.
Atdı od püskürən əfiyə sarı.
Pərəstişə gəldi göy ulduzları.
Əjdaha qıvrılıb çəkildi geri.
Oxa hədəf oldu onun hər yeri.
Amansız olsa da əjdaha, fəqət
İlan-oxlar ondan müdhişdi, əlbət!
Oxlar qılınc kimi onu biçirdi,
Əti kabab kimi şişə keçirdi.
Kabab odu yaxdı tox olmaq üçün,
Ox kabab eylədi özünü bütün.
Bədənində vardı yarası sonsuz.
Onlara tökdülər çoxlu acı duz.
Artıq gücdən düşdü susdu əjdaha,
Yoxdu döyüşməyə qüvvəsi daha.
Pəhləvan at çapıb qılınc çəkərək,
Almışdı üstünü qara buludtək.
Qılınc çəkiləndə bilmədi fələk,
Parlayan qılıncdır ya odlu şimşək.
Şimşək qılıncını çalaraq bir an,
Əjdahanı orda eylədi candan.
Fərhad əjdahanı sərib torpağa,
Əjdaha atını sürdü qabağa.
Heç qorxu bilmədən kahaya girdi.
Orda daşın üstə yazılar gördü.
Hamar bir daş üstə sözlər qazılmış,
Xəznənin yatağı burda yazılmış.

Ki: – “Ey afaq içrə belə şur salan,
Tanrı kərəmindən cəsarət alan!
Öldürdükdən sonra əjdahanı sən,
Xəznənin yerini orda görərsən...
Əjdahaya qalib gəldiyin üçün
Sənin olacaqdır bu xəznə bütün.
Kaha səma kimi dəyirmidir bax!
Mərkəz nöqtəsini görəndə ancaq,
Sən əqiq rəngində bir daş taparsan,
Ağırlığı çoxdur bir min batmandan.
Qılıncın ucuyla kənarını yar,
Sonra çəkib onu yerindən qopar!
Rədd elə bu daşın zəhmətini sən,
Gör ulu tanrının mürvətini sən”.
Şahzadə oxuyub bunu bitirdi.
Onları yerinə bir-bir yetirdi.
Bütün yazılana etdi riayət,
Orda sonsuz xəznə tapdı, nəhayət.
Fələk xəznədarı aciz saymaqdan,
Mində birini də görməmiş insan,
Neçə min küp qızıl qoymuş Firidun,
Göy küpü qədərdir hər biri onun.
Qızıl, gümüş oldu bəzində zahir,
Bəzində qiymətli qaş-daş, cavahir,
Xəznənin altıydı bir ali eyvan,
Ki, hörümçək olur bürüncdə Keyvan.
Eyvanda qaş-daşlı gözəl bir taxt var
Üstündə yüz cürə qəşəng parçalar,
Bir qılınc sancılmış yuxarıda parlaq,
O, zülfüqar kimi itidir ancaq.
Yanında bir qalxan vardır ki, əflak
Tutur qübbəsini günəşdən də pak.
Üstündə yazılmış onun bu sözlər:
“Sən ey şah taleli olan bəxtəvər!
Bu qalxan, bu qılınc düşsə əlinə,
Birin as, birini bağla belinə.
Yüz div də birləşib çıxsa qarşıdan,
Toza döndərərsən onları inan.

Qalxan qübbəsində, üzük qaşı tək
İsm-əzəm yazdırmış Süleyman, gerçək.
Bu adda elə bir qüvvət var əgər,
Yüz min div də çıxsa azğın, hiyləgər,
Tutsan qabağında bu qalxanı sən,
Bu hörmətli adı ona göstərsən,
Onlarda nə qüvvət, nə cürət qalar,
Hamısı torpaqla olar bərabər.
Qılıncda da vardır bu ad, ey insan!
İtilik almışdır qılınc bu addan.
Onun xasiyyəti budur ki, əgər
Bu qılıncla vursan haqsız zərbələr,
Günahı olmayan kimsəyə əvəz,
Bu qılıncdan əsla bir zərər dəyməz.
Lakin iki bölər pis iş görəni,
Şeytani-ləini və əhriməni".
Bu iki töhfəni tapınca Fərhad,
Haqqa səcdə edib oldu könlü şad.
Öpüb o qılıncla qalxanı aldı,
Belinə bağladı, boynuna saldı.
Ata minib oldu yoluna rəvan
Onu gözləyirdi əsgərlər, xaqan.
O əjdaha ilə vuruşan zaman
Qatran tək bir toza batmışdı cahan.
İtirmiş əsgərin çoxu huşunu,
Huşda olanlarsa görmürdü onu.
O, İskəndər kimi zülmət içindən,
Çıxıb gələn zaman dəhşət içindən.
Xaqanla, Mülk-ara eylədi əfğan.
Hazırdı əsgərlər keçməyə candan.
Xilas olub qorxunc bir əjdahadan,
Fərhad sağ dönmüşdü bu cür bəladan.
Xəbər tutmamışdı hələ əsgərlər
Ki, əfidən artıq qalmamış əsər.
Olunca bu işdən xəbərdar ata,
Dedi: – "Canım olsun yolunda fəda!"
Xəbər gedib elə çatınca birbaş,
Dualar,etdilər, gözlərində yaş.

Fələk dəhşətli bir külək qopardı,
Səhranı bürüyən tozu apardı.
Aydın şərq günəşi doğdu göylərdə,
Əjdaha cəmdəyi göründü yerdə.
Açıldı vadi də, göründü dağ da,
Kahanın qapısı göründü dağda.
Ona doğru getdi Fərhadla xaqan,
Düzü başdan-başa bürümüşdü qan.
Verdi o xəznəni xaqana Fərhad
Ki, paylayıb etsin camaatı şad.
Anlatdı onların xasiyyətini,
O iki töhfənin keyfiyyətini.
Bu töhfədən xaqan şad oldu o gün,
Tutdu xəznəsindən onları üstün.
Bu iki qiymətli töhfədən xaqan,
Bir də əjdahanın məhv olmasından
Xeyli sevinərək, unutdu dərdi.
Töhfələrçin xeyli şadlıq göstərdi.
Dağa tərəf çəkdi qoşunu, bütün.
Səhra qan selinə batmışdı o gün.
Yer verib qoşuna sevincli və şad,
Əjdaha dərdindən oldular azad.
Nə xoş əjdahanı qətl edib tamam
Xəznələr paylamaq dünyada müdam!
Qorxunc əjdahadan oldular xilas,
Sərvətə sevinib, etdilər niyaz.
Günəş, Fərhad kimi nizə çəkəndə,
Gecənin qanını yerə tökəndə,
Səmanı şəfəqlə bürüdü al-qan:
Verərək yerdəki bu qandan nişan.
Onlar eyş evini etdilər abad,
Mey içib oldular o gün xeyli şad.
Məclis qurub fələk gülüstanı tək,
Gülgün mey içdilər əjdər qanı tək,
Mey tök, saqi, məni qəmdən azad et!
Gəl mənə həmdəm ol, könlümü şad et!
Əjdaha qanı tək şərab tök, ancaq.
İçib bu sərvəti kefdə paylayaq.

## FƏRHADIN ƏHRİMƏNİ ÖLDÜRMƏSİ

Gecə öz müşkünə səpəndə kafur,
Saçıldı əhrimən nəfəsindən nur.
Gecə ifritinin çoxaldı dərdi,
Fələk Süleymanı möhür göstərdi.
Fərhad yola düşdü döndü bir yelə:
Döyüş qılıncını bağladı belə,
Həmayil olmuşdu qalxan köksünə,
Hərbə hazırlaşdı şahzadə yenə.
Div kimi minərək atına haman,
Əhrimən düzünə tez oldu rəvan.
Qaldırdı ahını xaqan fələyə,
Qara toz ucaldı bu anda göyə.
Qorxunc Əhriməndən sıxılırdı can,
Elə bil bezmişdi o, yaşamaqdan.
Çıxmışdı bu yola şah xeyli nakam,
Həvəssiz, gedirdi qoşun da tamam.
Getdikcə məqsədə yaxınlaşaraq,
Fərhad yeriyirdi qoşundan qabaq.
Vardı qoşunlarla xeyli arası,
Görünürdü ancaq gendən qarası.
Dincəlmədən gedir məqsədə sarı,
Keçirdi düzləri, boz səhraları.
Qəflətən qarşıdan göründü meşə.
Bir meşə ki, salır canı təşvişə.
Meşə deyil, bura, əhrimən bağı.
Nə ucu görünür, nə də bucağı.
Ağacların altda çoxlu otlar var,
Göylərə ucalmış bu yaşıllıqlar.
Salsan ağaclara bir nəzər əgər,
Görərsən ucalmış göylərə qədər.
Qorxarsan baxanda onlara sarı,
Xeyli əcaibdir göy yarpaqları.
Bu dağ başdan–başa divlər mənzili,
Qasırğalar əsən hər xəfif yeli.
Hər yarpaq vəsvəsə ayinəsidir.

Eyləyir insanın huşunu əsir.
Burdakı heyvanlar divlərdir, fəqət
Almışdır hərəsi bir özgə sifət.
Çaylarından axan suyun sədası,
Söyləyir şeytanla-cin macərası.
Cana dəhşət salır çayında, hər daş,
Elə bil, yatmışdır burda kəsik baş.
Hər damla günbəzi ətlə bir hüdud,
Çərxin günbəziylə tam bərabər tut!
Suyunun dalğası sevdaya sehir,
Onun hər ləpəsi ağla xətt çəkir.
Asılmış yarpaqlar göydən Xızr tək,
Qanlı suyun sehri yazılmış, gerçək.
Əgər ki, düşsəydi ora bir insan
Mat qalar, çıxardı ağlı başından.
Hər ağac kötüyü bu yerlərdə, bil,
Divə ya şeytana olmuşdur mənzil.
Çıxarır bu mənzil ağılı başdan,
Bir div buynuzudur hər budaq, baxsan.
Torpağı bağlayır nicat yolunu,
Aparır hər yana min döngə onu.
İtirir huşunu kəskin ağıl da,
Bu hər yana gedən dolaşıq yolda.
Vəhşi heyvan idi orda şeytan, çin,
Azdırır insanı yolundan yəqin.
Bu yerə bir nəfər düşdüyü zaman,
Orda külək belə edirdi fəğan.
Hər yandan ilişən tikanlar belə
"Getmə, – deyirdilər, – sən bu mənzilə!"
Çəkir çalmasından onun hər budaq,
Budaq yox, bir divin buynuzudur, bax.
Quşlar fəğan edib yanır halına,
Gələn qonaqların bu əhvalına:
Ağlar, inci təhər burda buludlar,
Keçən müsafirin halına yanar.
Fəryada gələrək inləyən külək,
Elə bil ki, divdir ağlayır, gerçək.

Neştər kimi otun ucları kəskin,
Neştər demə, iti bir qılınc təkin!
Hər yandan əssə yel, titrəsə budaq,
Deyirdi: “Gəl getmə bu yana, küstah!”
Əlini uzadıb çinar hər yana,
“Sən tanrı geri dön” – deyir insana.
Şahzadə allaha təvəkkül etdi,
Atını sürərək meşəyə getdi.
Yolu işıq kimi tez keçdi, birdən
Canlandı önündə bir gözəl çəmən.
Çəməndə doluydu əlvan çiçəklər,
Çiçəkləri qəmdi, gülləri kədər.
Bu yerə getməyə o, qərar verdi,
Qabağında böyük bir saray gördü.
Atı qəsrə sarı sürəndə Fərhad,
Etdi div və pəri tanrısını yad.
Olcaq qafil ifrit işdən xəbərdar,
Qaldırdı başını görsün ki, nə var.
Div uzaqdan gördü o şahsuvarı,
Gəlirdi uçaraq bu qəsrə sarı.
Sifətdən ağıllı bir insandı o,
Görkəminə baxsan, div qırandı o,
Səadət ulduzun görüb Əhrimən,
Şimşək tək parlayıb güldü ürəkdən.
Qəzəb buludu tək üstünə çəkdü,
Başdan-ayağacan bir zəhər tökdü.
Saçırdı, dağıdıb hər bir hüdudu
Cəhənnəm atəşi, qiyamət odu.
Nərəsindən əsdi cahanın bağı.
Çatladı ahından çərxin otağı.
İti bir nizədir tənində tüklər,
Demə nizə, əjdər ilana bənzər.
Vücudundan düşən hər damla təri,
Haman divə dönüb çıxır hər biri.
Məlamət gecəsi-o qara üzü,
Qiyamət günü tək uzundur özü.
Əlindəki ağac sanki bir çinar,

Bir minarə kimi dümdüz və həmvar.
Ucuna bağlamış qayanı, görsən,
Dəstək kimi tutmuş o, minarədən,
Başında saxlamış bir qocaman gürz.
Bir toxunsa, dönər tozlara Elbrus.
Şahzadənin üstə hüçum çəkərək,
Sanki, cumdu azad süsənə külək.
Div nərə çəkdi ki: – "Ey qafil insan.
Çərx alnına yazmış gizli bir divan.
Burdan keçənlərin gözü qaralır.
Bu yerlərdə, pələng, şir, dırnaq salır.
Burdan mələk keçsə, sönər həyatı,
Burdan qartal uçsa, sınar qanadı.
Bu yerə gəlməkdə nədir niyyətin?
Axıdar qanını bu cəsarətin".
Çox acı töhfələr gətirdi yenə.
Gürzünü atdı tez onun üstünə.
Şahzadə cumaraq əlində qalxan,
Kəsdi qılınc ilə gürzü ortadan.
Qaldırdı sürətlə başına daşı,
Daşın zərbəsindən titrədi başı.
Yaxdı Əhriməni qəzəb odları,
Qayıtdı acıqlı qəsrinə sarı.
Daha böyük bir gürz gətirdi, yenə
Qaldırdı Fərhadın salsın üstünə.
Div gürzü çalmadan o hökmdara,
Fərhad etdi onu tez para-para.
Divin hücumunu rədd edən zaman.
Ona səcdə etdi bütün asiman.
Əhrimən qəzəbdən dəhşətə gəldi,
Buludtək nərəylə dağa yönəldi.
Havada yel kimi uçdu çaparaq:
Kökündən qoparıb gətirdi bir dağ,
Bahar buludu tək Fərhadın, budur
Yağdırır başına daşlardan yağmur.
Gizlənir qalxanla şahzadə birdəm,
Qalxan qələ kimi durmuşdu möhkəm.

Əhrimən görüncə o ism-əzəmi,
Bitdi ixtiyarı, çoxaldı qəmi,
Qalmadı taqəti, yerlərə düşdü,
Daşların üstünə bir kərə düşdü.
– "İstədim əzməyə, – dedi, – daş atam,
Özüm daşa dəydim axırda nakam".
Fərhad gördü həmin daş çevirəni,
Daş çevirən deyil, o Əhriməni,
Düşmüşdür yerlərə, alçalmış, aciz.
Artıq hərəkəti bitmişdir təmiz.
Qaldırıb qılıncı Fərhad yuxarı,
Sürdü div atını əhrimən sarı.
Tutdu cavahirli, daşlı qıfıldan,
Sındırıb içəri oldu tez rəvan.
Bir otaq gördü ki, orda misilsiz,
Kinsiz adamların qəlbi tək təmiz.
Heyrətlə dörd yana baxarkən ancaq,
Gördü asılmışdır bir yaqut çıraq,
Müştəri kimidir, şəfəqləri var.
Şərqin xavəri tək işığı parlar.
Düşünüb çırağı, tez açdı haman,
Çıxdı Süleymanın üzüyü ordan.
Çırağın üstündə vardı bu sözlər:
"Sən, ey bu şöhrəti qazanan bəşər!
Oxuyub bu adı, aça bilərsən,
İskəndər Ruminin tilsimini sən.
Göylərin səsindən olub bəxtiyar.
Bu adı oxuyan müşkülü açar".
Üzüyü önərək qoydu gözünə,
Allaha dualar eylədi, yenə.
Şükr etdi tanrıya, tez çıxdı ordan,
Qoşunlar tərəfə oldu tez rəvan.
Şimşək qılıncını çəkib o saat,
Kəsdi Əhrimənin başını Fərhad.
Qəsrə rəvan oldu sonra o Rüstəm,
Bağladı atını qapıda möhkəm.
Div yıxan qılıncı alaraq ələ,

Qəsrə qədəm qoydu şahzadə belə.
Nə saray, dünyadır dünya içində:
Bir özgə aləmdi bina içində.
Hər yanda kilidli, bağlı qapılar,
Hər birində möhkəm dəmir qıfıl var.
Bir yerdə yazılmış: "Hər cür xəzinə".
Vardı açıq sərvət, həm də dəfinə.
Oxudu şahzadə bu yazıları,
Sonra da yönəldi qapıya sarı,
Qapının hər yanı qızıl və gövhər.
Üstünə yazılmış onun bu sözlər:
"Bu qapını açmaq deyildir asan,
Yaxşı olar qorxub onu açmasan!"
Bu yazı Fərhadın huşunu aldı,
Bu, div qatilini həycana saldı.
Atını meşədən kənara sürdü,
Qoşunu qəribə bir halda gördü.
Əhrimәndən düşüb qorxuya ləşkər,
Söyüd yarpağı tək titrəşirdilər.
Görünən zamanda birdən şahzadə
Gəldi tez özünə atlı, piyadə.
Xaqanın gözünə dəyincə Fərhad,
Fərhad kimi oldu onun könlü şad.
Fərhad demə, de ki, dövründə vahid,
Qoşunla bir yola çıxdı o igid.
Keçib əhrimənin sıx meşəsindən,
Qurtardılar onun əndişəsindən.
Çatdılar bir yerə tamam gül, çiçək.
Ətirli havası İrəm bağı tək.
Əhatə edildi qoşunla saray,
Açıldı müəzzəm qapı taybatay.
Atası, yanında möhtərəm vəzir,
Girdilər içəri üçü də bir-bir
Bütün xəzinəni onlara verdi,
Möhürlü üzüyü özü götürdü.
Yenə də şad olub eyşə daldılar,
Mey nuş edib hər kəs oldu bəxtiyar.

Bir şahanə məclis qurdular o gün,
Əvvəlki tək şadlıq etdilər bütün.
Çün fələk Rüstəmi qılıncı aldı,
Zamanə divinin boynuna çaldı.
Onu həlak etdi, lakin ahından
Qaraya büründü elə bil cahan.
Saqi mey gətirdi şənləndi məclis,
Bir yeni rövnəqlə bəzəndi məclis.
Dolmuş Əhrimənin başı kimi cam,
Kef edib içdilər yenə o axşam.
Mey ver, soyuq baxma, saqi, bu halə,
Əhrimən başından yarat piyalə!
Bu camdan məst oldum, yenə şərab ver!
Olsun nəfsin divi qoy mənə əsir.

## FƏRHADIN XIZR İLƏ GÖRÜŞÜ

Zülmatın bayrağı endiyi zaman,
Günəş İskəndəri qalxdı səmadan.
Tilsim mavi göyə vurdu bir bəzək,
Eynən İskəndərin öz tilsimi tək.
Fərhad yenə geydi yol paltarını,
Tazələdi yenə arzularını,
Şahın ayağına düşdü yenidən.
Özünü torpaqla bir etdi həmən.
İltimasə gəlib dedi ki: – "Ol şad".
Sonra yel atına sıçradı Fərhad.
Yenə işi üçün olaraq rəvan,
Xatəm duasını deyirdi hər an.
Göründü bir tala, elə bil, fələk,
Onun içindəki bulaq günəştək.
Dirilik suyu tək çeşməsi təmiz,
Hər damla ruh kimi saf və ləkəsiz.
Ordakı ağaclar göylə bərabər,
Bu can suyu, o da Xızr peyğəmbər.
Yetişib o yerə oldu xeyli şad.

Bağladı atını ağaca Fərhad.
Pak oldu, qüsl edib bu suda bir an,
Yuyub qəm çirkini, şad çıxdı sudan.
İşinə xudadan kömək dilədi
İtaətlə haman niyaz elədi.
Qalxınca gördü ki, durmuşdur, fəqət.
Bir yaşıl paltarlı nurani sifət.
Fərhad onu görcək oldu biqərar,
Şəfqətlə söylədi ona ixtiyar:
“Oğlum, bu düşdüyün qəmdən azad ol,
Qismətinə düşən bu işdən şad ol.
Mən Xizrəm, çıxmışam yoluna sənin
Gəlmişəm yapışam qoluna sənin
Qaldım İskəndərlə xeyli möhnətdə,
Dirilik suyunu tapdım zülmətdə.
İskəndər də gəzdi bu suyu, fəqət,
Mənə oldu bu su ən sonda qismət.
Kəsdi yanğısını canımın bu su,
İskəndərsə yandı, artdı qayğusu.
Fələkdən qəlbinə arzular doldu,
Cahanda məşhur bir münəccim oldu.
Şər işə bənd vurar, bağlar həmişə,
Bu bəndi açmaqdır mənimçün peşə.
Tilsimin ondadır bil ixtiyarı,
Yalnız məndə vardır onun açarı.
O, tilsimə salmış vadini bütün,
Mən sənə köməyə gəlmişəm bu gün.
Gedəndə bu yoldan məqsədə sarı,
Sayarsan atdığın bu addımları.
Qarşında çarx kimi tilsim görünər,
Hündür divarları göylə bərabər.
Ordan on iki min addım yol qalar,
Hər addımda vardır bir çox bəlalar.
Yol rahat görünur uzaqdan, ancaq
Lazımdır bu yolda qüvvətli olmaq.
Bu yol bir cığırdır qranit yanı.
Qranit qılınctək kəsər insanı.

Bu yoldan nə qədər keçsə də insan,
Yenə də bu yolda sürüşər, inan.
Kəsər ayağını qranit yəqin,
Görər bu çeşmədə özünü miskin.
Lakin düz yol ilə keçərsə əgər,
On bir min addımı tezcə qət edər.
Qranit qələyə-rast gələndə, bir
Şir görər, salınmış boynuna kəndir.
Açmışdır ağzını adam udmağa,
Ağzı bənzər onun böyük bir dağa.
Hər kəs ondan ötsə bəxti gətirər.
Mincə addım qalar qələyə qədər.
Doqquz yüz addım da keçdikdə yenə
Daşdan bir taxt çıxar onun üzünə.
Taxta çıxıb qılınc vurarsa möhkəm.
Açılar qələnin qapısı o dəm.
Qapının içində görünər birdən
Heykəli andıran bir dəmir bədən.
Orda insan üzü, insan tövrü var.
Ox kamanı hazır əlində saxlar.
Bir ox alıb dərhal bu dəmir adam,
Deşər qraniti ortadan tamam.
Başdan ayağadək, o, dəmir paltar
Geyinmiş, onda bir atəş halı var.
Döşündə bir ayna, daş kimi səssiz,
Günəş aynasıtək təmiz, ləkəsiz.
Hər kəs yüz addımdan ona ox atsa,
Bu atdığı ox da köksünə batsa,
O vaxt yerə düşər bu vücud, ancaq.
Tək o deyil, bütün heykəllərdə, bax,
Açılar dolaşıq tilsim o zaman,
Girər vahiməsiz oraya insan.
Lakin bədbəxtlikdən oxu atanda,
Güzgünü sındırsa elə, bu anda,
Oxlar öz üstünə tökülər, inan,
Bir turağay kimi tüklənər haman.
Dönərək vücudu qəfəsə, ancaq

Həyat bülbülündən məhrum olacaq.
Sən də bu məqsədçin edəndə səfər,
Çıxmasın yadından dediyim sözlər.
Bu yolda istəsən məqsədə irmək,
Hər addımı ölçüb-biçəsən gərək.
Gedərsən dilində ismi-əzəmlə,
Onsuz bir addım da atmazsan belə.
Şir hücum edərək ağzını açsa.
Əjdaha tək o da alovlar saçsa,
Şirin ağzına at üzüyü tez sən,
Həmin saat düşər şir öz gücündən,
Götürüb üzüyü yubanma bir dəm.
Tez get o daşa ki, nişan vermişəm.
Qapını açarkən çıxaraq daşa,
Ox atıb, işini vurmaqçın başa,
Nə qədər olsa da, səndə iqtidar,
Olsun ismi-əzəm dilində şüar".
Xızr hər bir şeyi öyrətdi ona,
Dedi: – "Qorxusuz çıx indi yoluna".
Öpdü ayağından onun şahzadə,
Gətirdi etdiyi təlimi yadə.
Yol gedib o şirin yanına yetdi,
Üzük atıb onu tezcə məhv etdi.
Sonra addım-addım yolu sayaraq,
Həmin daşa gəlib yetişdi qoçaq.
Daşa ayağını vurunca möhkəm,
Qələdən çox səslər ucaldı o dəm.
Qələdən ətrafa səs-küy saçıldı,
Qələnin qapısı birdən açıldı.
Fərhad gördü səsdən-küydən əsər yox,
Durmuşdu o gövdə, əlində bir ox.
Qələ divarında yüz nəfər daha,
Hazır dayanmışdı oxu atmağa.
Onlar gözləyirdi, tutub oxları
Fərhadın durduğu bu səmtə sarı.
Dəhşət gətirirdi bu hal insana,
Yüz ox yönəlmişdi təkcə bir cana.

Lakin qorxutmadı onu bu əhval,
Oxunu, yayını götürdü dərhal,
Sakitcə buraxıb oxunu yaydan.
O güzgünü nişan aldığı zaman,
Elə bil göz vurub aşiqinə yar,
Gətirdi başına yaman bəlalar.
Elə ki, şimşək ox güzgüyə dəydi
O dəmir gövdənin qəddini əydi.
Divarda pusquda duran adamlar,
Elə bil oldular işdən xəbərdar.
Bu yıxılan zaman hər bir nəfərə,
Sanki xəbər çatdı, düşdülər yerə.
Fərhadı heyrətdə buraxdı bu hal,
Az qaldı bu işdən olsun dili lal.
Allahı çağırdı Fərhad bu zaman,
Fərhadın dilini açdı yaradan.
Yönəldi şahzadə qapıya sarı,
Gördü gözlərilə bu bəlaları.
Yolu oldu bütün bəladən azad,
Yollandı qələnin içinə Fərhad.
Gördü ki, qaş-daşa bu yerlər dardır,
Burda yüz harunun xəznəsi vardır.
Dünyanı məşriqdən məğribə qədər,
Yeddi ölkə boyu almış İskəndər,
Başı çox bəlalar çəkmişdir, fəqət
Keçirmiş əlinə böyük bir sərvət.
Bu göy tək qələni tilsimə saldı.
Bütün varı, yoxu bu yerdə qaldı.
O qələdə vardı gözəl bir bina,
Bəzək ola bilməz yüz min söz ona.
Gün kimi hər yana işıq saçır, bax!
Özü kiçik, xeyri böyükdür ancaq.
Şahzadə içəri qoyarkən qədəm
Tağında parlaq cam göründü o dəm.
Safdı günəş kimi, yox onda ləkə,
Günəş demə, Cəmşid camıdır bəlkə!..
Aləmə nur verən günəş kimidir,

Dünyanın hər işi onda bilinir.
Bütün gizli işlər onda aşikar,
Cahanın hər cürə sirri onda var.
Görünür səthində bu mərkəzi-xak,
İçində hərlənir o doqquz əflak.
Səthi-bir aqilin təmiz görkəmi,
Daxili bir həkim diləyi kimi.
Fərhad qurtarcaq min bir bəladan,
Şad oldu bu camı tapdığı zaman.
Qoyaraq bu yerdə dövləti, varı,
Fərhad geri döndü qoşuna sarı.
Yetişib çeşməyə, sıçradı ata.
Tələsirdi tezcə xaqana çata.
Yel kimi sürürdü atını Fərhad,
Ürəyi fərəhli, könlü xeyli şad.
Xaqanı, qoşunu xeyli şad etdi.
Onları qayğıdan o azad etdi.
Tez durdu qoşunun başında haman,
Hərəkət elədi qoşun arxadan,
Yol gedib çeşməyə axır yetişdi,
O yerə ki, Xızr təlim vermişdi.
Qoşunu, əyanı yerləşdirdilər,
Şah, vəzir və Fərhad getdi bərabər.
Orada qələni qoruyurdu şir,
Qələ göyə qalxmış uzun bir zəncir!
Qələnin içində xəzinə vardı,
Tükənmək bilməyən dəfinə vardı.
Bunları xaqana təslim eylədi,
Dünya camını da təqdim eylədi.
Min niyaz eyləyib tanrıya belə,
Şadlıqla döndülər yenə mənzilə.
Göstərdi qəmər də Fərhada cismin.
Gündüz qələsinin qırdı tilsimin.
Gün İskəndər kimi zülmətə daldı,
Cəmşidin camı da tilsimdə qaldı.
İşrət məclisini qurdular yenə;
Təmiz mey tökdülər Cəmşid caminə,

Deyib İskəndərdən çox danışdılar,
Cəmşiddən dedilər burda o ki, var.
Gəl saqi, çatmışdır işrət məqamı.
Mey tök, qalxsın əldə Cəmşidin camı!
İskəndər güzgüsün eyləyib ifşa;
Cəmşidin camına qılım tamaşa.

## FƏRHADIN İSKƏNDƏR TİLSİMİNİ AÇMASI VƏ GƏLİB SOKRATIN YANINA ÇIXMASI

Dağa sübh Sokratı çıxdığı zaman
Onun şöləsindən nurlandı çahan.
Onun alətləri: göy vərəqləri,
Günəş dairəsi, üstürlab yeri.
Şahzadə tanrıya dualar etdi.
Minib öz atını sürətlə getdi.
Tərəddüd etmədən o dağa vardı,
O dağda Sokratın kahası vardı.
Xaqanla baş vəzir sürüb atları
Yol getdilər həmin bu səmtə sarı.
Çalınmadı yürüş şeypuru bir an,
Əsgər tərpənmədən çeşmə başından.
Bir-iki min nəfər yaxın əyanı.
Yalnız təqib etdi yolda xaqanı.
Fərhadın dalınca sürüb çaparaq,
Biyabanlar keçib, aşdılar çox dağ.
Fərhadla bir yerdə oldular həmrah.
Keçdilər çöllərdən əyan ilə şah.
Bir dağ ətəyinə çatdılar belə,
Həkimin olduğu tənha mənzilə.
Gördülər burda var çıxılmaz bir dağ,
Yer onun yanında bir ovuc torpaq,
Müştəriyə dəyir bu dağın başı,
Fələyin camını qırdı hər daşı.
Ağac kölgə salır fələk qəsrinə,
Göy budağı ondan alçaqdır yenə.

Uca asimanı başı deşərək,
Çıxmış ordan çölə dəvə beli tək,
Asimanı deşib keçən həmin dağ,
Fələk dəvəsinin donqarıdır bax.
Bu dağ bir cahandır, o tay bu tayda,
Hamarlanmaq üçün hərlənir ayda.
Qar ki ağararaq, üzündə durmuş,
Şirmayıdır ona nəqşlər vurmuş.
Cüdi ulduzunu aşıb zirvəsi,
Əsəd bürcünə də düşüb kölgəsi.
Onda yüz minlərlə qaynayır bulaq,
Onlardan biri də günəşdir, parlaq.
Min cürə otu var, hər biri məlhəm.
Əlacsız dərdlərin dərmanıdır həm.
Hündürlüyü doqquz göyə bərabər,
Dövrəsi də iki bu cahan qədər.
Saysız mağaralar var ki, onda, bil,
Girə bilməz ora nə hiss, nə əqil.
Mağaranın yoxdur başı, ayağı,
Nə ucu var onun, nə də bucağı,
Qaranlıq hakimdir mağaralarda.
Sönür günəşin də çırağı burda.
Bura parlaq ay da girərsə əgər,
Qaralıb zülmətdən qatrana dönər.
Böyləcə zülmətli hər bir məğarə,
Zülmət içindəydi həm dağ, həm dərə.
Bu yerdən baş alır yüz qanlı dərya,
Bu dağda minlərcə vardı əjdaha.
Yetişib bu dağa şahzadə və şah,
Oldular buranın halından agah.
Heyrətdən lal oldu görüncə xaqan,
Belə şey görməmiş çünki heç zaman.
Lakin verdi ona şahzadə ürək,
Şaha və əsgərə cürət verərək,
Dedi: – “Hazır olsun Cəmşidin camı,
Qoy azad eyləsin qəmdən adamı”.
Bircə an içində gəldi ələ cam,

Qılsın bu müşkülə, bəlkə, sərəncam.
Salınca bu cama şahzadə nəzər,
Cahan timsalını gördü sərasər.
Hara baxsa aydın göründü gözə,
Bütün ölkələr də parlaq və təzə.
Bütün yer üzünü edərək təslim,
Ayırdı sonradan o yeddi iqlim.
Parlaq ölkələrə o göz yumaraq,
Tək yunan mülkünü axtardı ancaq.
Göz əsgəri gəzdi hər bir bucağı,
Axırda gözüylə tutdu o dağı.
Görüb gözlərilə dağın halını,
Bildi hər kahanın o əhvalını.
Haman bu kahanı tapdı, nəhayət,
Sokrat da burada olmuşdu rahət.
Yarın dodağına yol tapan kimi,
Tapdı mağaranın Fərhad səmtini.
Dedi: – “Girin camı alaraq ələ,
Məşəl tək nur saçar cam bu mənzilə”.
Girincə içəri əlində bu cam.
Gündüzə çevrildi gecə də tamam.
Cam nurə qərq etdi hər yanı əvvəl,
Elə bil yanırdı gecədə məşəl.
Gəzdilər kahada dəhşət içində,
İskəndər sayağı zülmət içində.
Xızr vermiş idi bu yolu nişan.
Dirilik suyu da tapıldı burdan.
O yerin nişanı məlumdu indi,
Sokrat gizlənən yer artıq bilindi.
Axır gəlib çatdı bu yolun sonu,
Gecənin bitməsi göstərdi bunu.
Düşdülər atlardan olub piyadə,
Yola rəvan oldu şahla şahzadə.
Bu işin axırı görünən zaman
Orda peyda oldu bir daş pilləkan.
Bir şah, bir şahzadə-bu iki nəfər,
Onlarla baş vəzir getdi bərabər.

Beş-altı pilləni çıxınca ordan,
Göründü qarşıda böyük bir eyvan.
Getdikdə o səmtə şahzadə və şah,
Kördülər o yerdə gözəl bir dərgah.
Tutdular dərgahın yanında aram,
Nur saçdı, dünyanı timsal edən cam.
O müqəddəs evdən bir səda gəldi,
Onları çağıran bir nida gəldi.
Girdilər içəri qəlblərdə təlaş,
Sanki qəlb evinə fikir vurdu baş.
Mənzilin içində gördülər ziya,
Bir bolluq evinə düşdülər guya.
Bu yer girdələnmiş bir günəş kimi,
Ona şahid idi çərxin həkimi.
Təmiz ruhu etmiş cismində zühur,
Şəxsində mücərrəd əqli görünür.
Ətəyini dağ tək çəkib cahandan,
Tağ tək tərpənmirdi, o, bu məkandan.
Saflığı ləl tək təmiz aşikar,
Ləl üzrə qranit ondakı paltar.
Qranit içində onun cahanı.
Cahan cismindədir ya təmiz canı.
Cahan nədir, tamam bu ali insan,
Çox-çox yüksək idi bizim dünyadan.
Onun qəlbi – geniş, aydın bir dəniz,
Onda hər şey safdır, hər şey ləkəsiz
Bəslər sədəf kimi içində saf dürr.
Orda yüz min ulduz gözə görünmür.
Üzü ilahi nur ayinəsidir.
O tanrı sirrini anlamış bir-bir.
Vücudundan düşən hər damla təri,
Ulduz tək nur saçıb parladır yeri.
Onun kahasında aciz hörümçək,
Üstürlab tək ölçür cahanı gerçək.
Cismi sabit, ruhu asiman təkin,
Gəzir, hərəkəti deyildir mümkün.
Onun varlığından yağır mərhəmət,

Alnında alimlik görünür fəqət.
Görüncə bu ali kamallı əri,
Onlar diz çökərək öpdülər yeri.
Görüncə bir taqət qalmadı təndə.
Ürək yarpaq kimi əsdi bədəndə.
Gizlin xəznələri qoruyan dərhal,
Göz açıb onlara verdi bir sual:
"Bu qorxulu yerdən necə keçdiniz,
Bu zəhmətdən sonra necəsiniz siz?"
Onlar baş əyərək sakit qaldılar,
Bir söz demədilər, sanki laldılar.
Dedi xaqana: – "Sən çəkdin çox möhnət,
Tanrı əvəzini göndərər əlbət...
Çox bəlalar çəkib gəlmisən bizə,
Xeyli sərvət düşmüş, əllərinizə.
Sizə qismət oldu ən sonda, ancaq,
Süleyman üzüyü, Cəmşid camı, bax.
İki müjdə daha verəcəyik biz,
İki qiymətli şey, həm də misilsiz,
Bu iki müjdənin birisi xəbər,
Digəri olacaq qiymətli gövhər.
Xəbər budur: ömrün uzun olacaq!
Ölkələrin varı sənindir ancaq.
Bütün əcdadına salsan bir nəzər,
Yaşayan tapmazsan orda sən qədər.
O biri töhfədir bir kiçicik daş:
Sən ömür sürərsən dünyada yüz yaş.
Qocalıq susaltsa səni cahanda,
Bu daşı ağzına alan zamanda,
Hərləyib udarsan tüpürcəyini,
Sağalıb olarsan sağlam və yeni.
Qocalıqdan səndə qalmaz bir əsər,
Qocalığı gənclik tez əvəz edər".
Sonra Mülk-aranı təbrik elədi,
Ona üz tutaraq belə söylədi:
"Sən ki, keçirmisən bunca dərdü qəm,
Bu möhnət yoluna qoymusan qədəm,

Hansı bir şah alsa bu taxtı, haçaq,
Sən olarsan daim vəziri ancaq.
Sənə də bu daşdan verərəm ki, mən,
Zəiflik üz versə qəbul edərsən,
Lakin qarşınızda var bir fəlakət,
Bundan qorunmanız lazımdır, əlbət...
Hər iki ünsürdən alınar ki, bu.
Birisi küləkdir, o biri də su.
Sizə üz verəcək min bəla, möhnət,
Tanrı, qurtuluş da verəcək fəqət.
Ömür bu yollardan ötdüyü zaman,
Təxminən beş yüz il keçəcək inan".
Həkim bu müjdəni bəyan eylədi,
Hörmətlə Fərhada belə söylədi:
"Ey cavan şahzadə, yaxın gəl mənə!"
Onu vaqif etdi bütün sirrinə.
Göz açıb seyr etdi gül cəmalını,
Sordu nəvazişlə hər əhvalını...
Əyilib önündə yer öpdü Fərhad,
Həkimsə eylədi bir nitq irad:
– "Ey bütün varlığı dərdü qəm olan!
Əzəldən eşqdir qismətin, inan...
Xoş gəldin, ey cavan, səfa gətirdin.
Qaranlıq evimə ziya gətirdin...
Sənin vüsalına çəkib intizar,
Yaşaram dağlarda, budur min il var,
Səni gördü gözüm şükür tanrıya!
Səni tapdım özüm, şükür tanrıya!
Vaxtım azdır, indi məni dinlə bir.
Əbədiyyət evi məni gözləyir.
Bil ki, əmanətdir gördüyün cahan.
Həqiqət əhlinə zindandır, zindan...
İskəndər mülkünü tapsan da onda,
Uzun ömür sürsən Nuh tək cahanda,
Əzəl-axır bir gün gedəcəksən bil,
Sərvət də, ömür də əbədi deyil.
Tanrı xəlq eylədi insanı fəqət

Onun varlığına qoydu bir məqsəd:
Haqqın hər əmrinə tabe olaraq,
İnsan bu dünyada yaşasın ancaq,
Madam ki, həqiqi sevgili odur,
Ona tərəf getmək daha xoş olur.
Məqsədindirsə gər onunla vüsal,
Əbədiyyətdədir daimi iqbal.
Bil ki, çox yüksəkdir, ancaq o dövlət,
Ona çatmaq gücdür, çətindir, əlbət...
Bu yolda çox kədər, çox qəm olacaq,
İki addımsa da, uzundur ancaq.
O iki addımçın gərəkdir min il,
Gedə bilməz insan o yolları bil.
Getməkçin gərəkdir olasan fani.
Bu yolla taparsan sən o nişanı.
Özün unutmayan heç ona yetməz,
Dürr tapmaz dənizə girməyən bir kəs.
Dəryaya baş vuran dürrlər tapar.
"Mən"dən qurtarmanın bircə yolu var.
Yalnız bu yol ilə qurtarar insan.
Ancaq məcazidir bu yol da inan.
Kim qəm axşamına oldu vəfadar,
Ona sübh açılıb sonra gün doğar.
Məcazi eşq yanır üfüqdə səhər,
Həqiqi eşq ona xurşidi-xavər.
Eşqi-məcazinin ahı, fəğanı,
Bir çöpə döndərər aşiq olanı.
Hərarət çatınca bu çöpə bir gün,
Atəşin içində yanar büsbütün.
Əbədi sevginin şimşəyi belə,
Qığılcımla onu döndərər külə,
Olacaq məcazi eşq nəsib sənə.
Çox bəla görəcək vücudun yenə.
Salıb sorağını bütün cahana,
Yetirər sevdanı ta asimana.
Eşqin odu qılar aləmi rövşən;
Tək aləmi deyil, göyləri birdən.

Eşqin qəmi tutar bütün cahanı,
Tək cahanı deyil, bu asimanı.
Harada bir aşiq tapılsa, ancaq
Gözünə nur olar basdığın torpaq.
Fəryadın doqquz qat göyləri aşar,
Sözün yeddi ölkə gəzib, dolaşar.
Yığılsa eşq əhli qoşunla əyan,
Bil ki, hamısına olarsan xaqan.
Məcazi eşqdən yansa da canın,
Sel olub getsə də bu xanimanın,
Əsərsə həqiqi eşqin nəsimi,
O çatarsa sənə bir qoxu kimi,
Məşuqə səninlə həmsöhbət olar.
Məcazi eşq də həqiqət olar.
O zaman bixudluq çıxıb zahirə,
Eşqin gəlib çıxar artıq son yerə.
O bəqa mülkündə olub qəhrəman,
Həqiqət taxtında şahlıq taparsan.
Atan kimi yüz min xaqan, ya qeysər,
Dünyada bir iz də qoymadan gedər.
İnan ki, yaşayar cahanda yadın.
Eşqin yollarında şərəfli adın”.
Söyləyib bunları dedi bir dua:
“Çıxarsa qarşına möhnətlə bəla,
Tezcə bu duanı oxuyub da san,
Qurtararsan gələn ağır bəladən.
Gəlişinə səbəb, ey cavan igid,
Güzgü əhvalatı, belədir, eşit:
İskəndər tilsimin qırdığın anda.
Dəmir vücuda ox atan zamanda,
Oxun dəydi onun ayinəsinə,
Batdı o yerdəcə tez sinəsinə.
O səni ağladan ayna boş deyil.
Ox sındırmış onun tilsimini bil.
Burdan qayıdarkən Çin ölkəsinə
O güzgüyə baxmaq istəsən yenə,
Nə ki, arxasında çəkmişdi rəssam,

Görünər gözünə üzündə tamam,
Görcək eşq oduyla ürəyin yanar.
Sənin məhəbbətin belə başlanar.
Görməzsən bir daha baxacaq olsan,
Çox dolaşıq düşər kələfin inan.
Taleyin əlindən kim qaça bilir?
Aqillər tapmazlar işinə tədbir.
Olar əvvəl1kindən əhvalın betər.
Qəlbinin fəryadı göylərə yetər.
Yenilməyən bir eşq çəkib qoşunu,
Girərək qəlbinə, fəth edər onu.
Olarsa bir nəfəs o sənə əyan,
Yaxşıdır min illik şahlıqdan inan.
Mən də vidalaşıb səninlə bütün,
Murada çatmağı dilərəm bu gün.
Eşq tüğyan edib, hücum çəkəndə,
Yadına düşərəm hərdənbir mən də."
Bununla qurtardı həkim sözünü,
Sonra yavaş-yavaş yumdu gözünü.
Həkim, Süheyla tək yola düzəldi.
Fərhad bu rehlətdən fəğanə gəldi.
O, qəmlər içində gördü bu halı.
Ağladı, sonsuzdu onun məlalı.
Çox ağlayıb tutdu qəlbində matəm,
Onun əhvalına, öz halına həm.
Çağırdı gəldilər vəzirlə xaqan,
Vəziyyəti belə seyr edən zaman,
Onlar itirdilər tez özlərini.
Eşitdilər, onun son sözlərini.
Yığılıb bir neçə ağıllı adam,
Həkimin işinə verdi sərəncam.
Qismətinə düşən yeri qazdılar,
Dağın ətəyinə çəkdilər hasar.
Bu mənzili tikib qurtaran zaman,
Keçməyə yollandı onlar durmadan.
Yetişdi qoşuna xaqanla Fərhad.
Nə biri qəmgindir, nə digəri şad.

Gün Sokratı yerdə salanda məskən,
Gecənin loğmanı başladı şivən...
Geydirib göylərə bir qara libas,
Göz yaşı tökərək saxladılar yas.
Tutdular bu gecə torpağa matəm,
Çin fikri bu dərdi dağıtdı birdəm.
O gecə qonaqlıq etdilər naçar,
Acı içdilər ki, itsin acılar.
Saqi, hikmət göstər, gülgün şərab ver!
Tünd mey gətir, durma, dərdimə tab ver!
Qədəhin çeşməsi qaynasın, burax!
Bir ləhzə dinclik ver könlümə ancaq!

## FƏRHADIN GÜZGÜDƏ ŞİRİNİN XƏYALINI GÖRMƏSİ

Səhərin çeşməsi olanda rövşən,
Fələk çəmənini eylədi gülşən.
Yunan torpağının yandı göyləri
Günəş-Çin xaqani çəkdi əsgəri.
Yenə qayıdırdı şah Çinə sarı,
Demə ki, şah, Fərhad və qoşunları
Qoyub xəznəyə çox mötəbər adam,
Verdi hər birinə min qızıl tamam.
Gedirdi, tutaraq Çinin yolunu,
Bir iş yoxdu artıq ləngitsin onu.
Hərəkət eylədi Çinə tərəf düz,
Yol getdi durmadan o gecə-gündüz.
Öz taxtına çıxdı yenə də xaqan;
Ay şərəf bürcünə çıxdı sanasan.
Fərhad Çin elinə qoyarkən qədəm,
Qəlbi həyəcanla vururdu hərdəm.
Xəyalı aynada görmək eşqilə.
Tezliklə kilidi götürüb ələ,
Qapını sçanda getdi qərarı:
Təlaşla yüyürdü aynaya sarı.

O büllurdan cismi gördüyü zaman,
Kədərli ürəyi sevindi bir an.
O zərif mücrünü xatırlayaraq,
Zərif demə, bəla mücrüsü ancaq.
Xəzinədarından açarı aldı,
Özünü bir sonsuz bəlayə saldı.
Kilid dil açmışdı bir insan təki.
Özünü açmağa qoymurdu, lakin
Qıfılın ağzı da dartıb saçından,
Elə bil, – gəl açma – deyirdi – insan!
Qıfıla yüz dəfə saçı keçərək,
– Bu qorxunc fikirdən – deyirdi – əl çək!
Lakin öz bəxtindən qurtarmaz insan.
Çıxardı güzgünü Fərhad sandıqdan,
Dünyanı, günəştək gördü, ləkəsiz.
Çəmşid camı kimi göstərir təmiz.
Fərhad bu güzgüyə bir nəzər saldı;
Heyrət qığılcımı qəlbini çaldı.
Nə gördü: səfalı, gözəl çəmənzar.
Üzəri al güllər və yaşıl otlar...
Otları bir neştər, pas tutmuş ancaq,
Gülü el qanına boyanmışdır, bax.
Sünbül saçlarının zənciri bənd-bənd,
Huşu ovlamağa olub bir kəmənd.
Çarxın göyərtdiyi, bənövşəni, san,
Qapmaqçin yapışmış ağlın boynundan.
O pak adamları etməkçin bihuş,
Nərgizlər şərabı etdirirlər nuş.
Səfalət dağını pozmaqçın qəlbdən,
Lalələr odundan alışıb bədən.
Saçılıb torpağa müşk-tatarı;
Qara gəlsin deyə elin ruzgarı.
O yerdə süsənin dili olmuş lal.
Gəlmişdir hər kəsin başına bu hal.
Ehtiras gülləri açmış bu yerdə.
Açılmış baş əyməz ğızıl güllər də.
Dil çıxarıb durmuş hər yanda otlar,

Burda qarqaşalıq əlaməti var,
Görsənir bu düzün dörd bir qırağı,
Hicran dağı kimi qayalı dağı.
Ayağilə durub torpaqda möhkəm,
Baş çəkib, fələklə söhbət edir həm.
Çox uzun eləmiş vəsfini afaq,
Bu çahan bəhrinin, lövbər salaraq,
Onun ətəyində saysız izdiham.
Hazır dayanmışdır döyüşçün tamam.
Biri arx qazırdı bu dağda belə,
Arx da uzanırdı dağın döşüylə.
Bu öz şəkli idi, bir növcavandı,
Demə növçavan,yox, bir natəvandı,
Adamlar içində məşğuldu işə,
Külüngçülük olmuş o şəxsə peşə.
Bu zaman adamla dolmuşdu hər yan,
Elə bil coşqun sel axır dağlardan.
Gözəllər ki, ata minməkdə mahir,
Hər birinin üstə qaş-daş, cavahir.
Tikandı kirpiklər, güldü yanaqlar,
Ədalər işvəli, baxışlar xumar,
Göz qapağı geniş, ağızlar darı.
Çıxdı günəş kimi gözəl süvari,
Köhlənin yanında, çərx atı axsaq.
O gül yanağından gün utanar, bax.
Oynayan zamanda altında boz at,
Yüz dəfə günəşi eyləyirdi mat.
Camalı od salıb aləmə başdan,
Bütün başdan-başa adlanmış çahan.
Onun hər əsgəri aya bərabər,
Özü də parlayır bir günəş qədər.
At üstə hamıdan seçilir ancaq,
Yel kimi atını sürür çaparaq.
Tamaşa eyləyir, hər yana baxır.
Gözüylə hər kəsi yandırıb yaxır.
Fərhadın xəyalı durduğu yerə
Sürürkən atını o birdən-birə,

Onun gözlərinə baxdı o xəyal,
Bürüdü timsalı qəribə bir hal.
Yaralı maral tək ünü ucaldı,
Bir nalə çəkərək yıxılıb qaldı.
Fərhad onu belə körduyü zaman,
Baxmaq həvəsilə dayandı bir an.
Yaxın gətirərkən güzgü timsalı,
Göründü dilbərin ay tək camalı,
Öz timsalı kimi nalə çəkərək,
Fərhad yerə düşdü cansız cəsəd tək.
Öz timsalı kimi ağzı yumuldu.
Timsalı tək həm də o, bihuş oldu.
Bu yaman əhvalı görüb nökərlər.
Verdilər tezliklə xaqana xəbər.
Eşidib oğlunun macərasını,
Yırtdı göynəyinin, şah yaxasını.
Anası saçını yolub bu zaman,
Elə bildi oğlu ölmüşdür bu an.
Mülk-ara həm fəğan edir ata tək,
O idi Fərhada çünki atabək.
Bir də Mülk-arapın oğlu o Bəhram, –
Fərhadın qəlb dostu tapmadı aram.
Bəhram onun üçün bir sirdaş idi.
Fərhada arxaydı, bir qardaş idi.
Görüncə Fərhadın yaman gününü,
Köynək əvəzinə yırtdı köksünü.
Pərvanə tək onun başına döndü:
Fərhad elə bil ki, şam idi, söndü.
Bihuş oldu qaldı taqətsiz, gücsüz,
Özünə gəlmədi bir gecə-gündüz.
Nəsimlər əsərkən sabah bağından,
Azacıq özünə gəldi o, bir an.
Göz açınca gördü durmuş adamlar,
Olmuş göz yaşları selə bərabər.
Ağlayır Mülk-ara, susmayır Bəhram.
Eylədi şahzadə onları aram.
Ata və anası tutmuşdu matəm,

Görüncə onları utandı, bu dəm
Yenidən az qaldı qəlbi sıxılsın,
Az qaldı ki, Fərhad yerə yıxılsın.
Xeyli üzr istədi, qalxaraq Fərhad,
Diz çöküb, yer öpdü, dedi: – "Həzərat!"
Mənə nə olmuşdur özüm bilmirəm,
Neçin tutmusunuz siz mənə matəm?
Bilmirəm yaxşıdır, yamandır bu iş,
Billah ixtiyarım əlimdən getmiş...
Məni məzur tutun mən rüsvay oldum,
Rüsvay oldum demə, mən artıq öldüm.
Mənimçün sizlərə qəm toxunmasın.
Sizin könlünüzə qoy toz qonmasın".
Bu sayaq göstərib təəssüf, məlal,
Onların könlünü edirdi xoşhal,
Gözlərilə dili burdaydı, fəqət
Güzgüdəydi canı, ürəyi, əlbət.
Onlar bu sözlərdən sevincli xürrəm,
Evlərinə tərəf getdilər o dəm.
Onlar sakit olub çıxıb getdilər,
Şahzadə güzgüyə saldı bir nəzər.
Güzgünün aynası qaraydı bu an.
Boylə yaratmışdı onu yaradan.
Tilsimi bu sayaq qurmuşdu həkim.
Ondakı şəkli görərsə hər kim,
Görünür gözünə tamaşa bir an.
Bir daha görünməz ona heç zaman.
Gördü ümüdsüzdür, Fərhad, arzular,
Oldu bir əbədi möhnətə düçar.
Dedi: – "Ölüm gəlir mənə bu dərddən,
Qəm içində ölüb getməliyəm mən.
Etsəm də özümü mən parə-parə,
Çatmaram arzuma yenə, nə çarə?
Solub qurtarınca bu can baharım,
Gedincə əlimdən səbrim, qərarım,
Bir çarə axtarmaq lazım bu işə:
Ağlın təlimini eyləyim peşə,

Çalışmaq, güc almaq lazım ağıldan,
Şah baxıb sevinər buna o zaman.
Buna hazırlıqçin keçər çox aylar,
Eşq bəlasına ollam giriftar.
Yox, əgər ki, indi acizlik etsəm,
Başımı götürüb bir yana getsəm,
Şübhəsiz ki, yurdun zinəti xaqan
Gözləməz bu hala dözüb də bir an.
Haman hazırlayıb yüz min əsgəri.
Məni axtaracaq gəzib hər yeri.
Onlar Çin mülkündə hər yana çapar,
İki-üç gün keçməz tez məni tapar.
Girişsəm vuruşa qoşunla gerçək,
Günahsız qan tökmək lazım gələcək.
Xalqa polad qılınc çəkərəmsə, bil,
Özümə zülm olar, xalqıma deyil.
El boynuna necə qılınc vurular,
Günahsızı necə öldürmək olar?
Son zərbədə qolum gücdən düşəndə,
Təslim olaçağam axırda mən də.
Nə pislik görmüşəm Çin xalqından mən.
Onların qanını axıdım nədən?
Bu zülm üçün cəza verməsə də şah,
Bir gün cavab istər bu işə allah.
Gözüm neçə baxar şahın gözünə,
Mən neçə baxaram xalqın üzünə?
Bir tərəfdə hər şey, bir yanda tək mən.
Şah xəbərdar olar qəribə işdən.
Gözətçilər qoyar dörd bir yanıma
Qanun hasar çəkər hər səhmanıma.
Xaqan bu müşkülü həll etsə əgər,
Mənim bu tədbirim müşkülə düşər.
Dəlitək zənçirlə bağlasa, ancaq
Qurtuluş ümidi sönmuş olacaq.
Əgər dəliliyim keçsə də yenə,
Kim inanar bunun səhihliyinə?
Bunun qayğısını çəkməyim gərək.

Lazımdır bu işi hər an gözləmək...
Tapınca bir çıxış bu çətin işdən.
Ağıl qanuniylə davrandı həmən.
Eşq zalım olur bilmirdi bunu,
O yelə sovurur yüz min qanunu.
Eşq meyini ver saqi, edim nuş!
Bu ömür ağılla əfsanə olmuş.
Gəl eşqin bəzmində könlümü xas et!
Ağıl bəlasından məni xilas et...

## FƏRHADIN EŞQİ

Eşqin sirlərindən olan xəbərdar,
Bu sirri bu yolla etdi aşikar:
Fərhad öz eşqini tutaraq nəhan,
Qəmsiz görünməyə çox atırdı can.
Lakin tüstü çıxa bilsə otaqdan,
Onun qorxusu yox, oddan, ocaqdan.
Buxarı olmayan evlərdə mütləq,
Divarda bir yarıq açılsın gərək.
Axşam gizlətsə də günəşi göylər,
Ulduzlar şəklində aşikar eylər.
Müşkünü gizlində tutsa da ahu,
Yayılar ətrafa yenə xoş qoxu.
Lalənin qönçəsi açan yaz çağı,
Yayınarmı gözdən qəlbinin dağı?!
Xeyr, o açılıb gələndə cana,
Köksündəki dağlar çıxar meydana.
Fərhad da istədi çör-çöplə barı
Gizlədə köksünu yaxan odları.
Lakin hər damla yaş, çəkdiyi hər ah,
Xalqı qüssəsindən edirdi agah.
Sevda atəşini söndürməz kamal,
Eşqi nəhan tutmaq mahaldır, mahal.
Gizlədə bilərmi günəşi zərrə?!
Bir dəniz sığarmı bir damla içrə?

Fanusun içində yansa da bir şəm,
Görər şöləsini kənardan aləm.
Qanlı yaş göz içrə olarmı pünhan?
Al şərab şüşədə qalarmı pünhan?!
Gizlin saxladıqca Fərhad bu dərdi,
Qəlbində yanğınlar tüğyan edərdi.
Az vaxtda eşq ona elə kar etdi
Ki, səbri tükəndi, taqəti bitdi.
Hər kim görsə onu eylərdi güman
Ki, bu daş, mumlara dönmüş alovdan.
Bir ayda Fərhadı möhnət əritdi,
Göydəki ay kimi büküldü qəddi.
Bənzədi çöhrəsi sarı laləyə,
Göz yaşı lalədə olan jaləyə.
Lalə tək köksünə çəkilən dağlar
Hər fəğan çəkəndə oldu aşikar.
Bir sərvə bənzəyən uca qaməti,
Əydi fələk kimi könül möhnəti.
Bu tənək barından hasil olan mey,
Qanlar uddururdu ona peyapey.
Cismi gündən-günə zəifləyirdi,
Qəddini yay kimi qəmlər əyirdi.
Əlilə ağzını yumsa da bərk-bərk,
Evdə bilməyirdi ahu-zarı tərk.
Möhkəm iradəsi vardı bir zaman.
Deyildi cismi də belə natəvan,
Fəğan etməməyə cəhd eyləyərdi,
Çıxmazdı meydana qəlbinin dərdi.
Fəqət kök atdıqca onda məhəbbət,
Artıq vücudunda qalmadı taqət.
Cünunluq duyulub təbiətində,
Məhəbbət sezildi hər söhbətində.
Könlündə qalmayıb səbri, qərarı,
Getdi əldən gücü, həm ixtiyarı.
Baxıb şahla vəzir ondakı hala,
Düşdülər təşvişə, dərdə, məlala.
Nəsihət etdilər, qılmadı təsir.

Tapa bilmədilər bu dərdə tədbir.
Gördülər ki, əldən çıxacaq fürsət,
Bir çarə tapmağa eylədilər çəhd.
Şah yığıb başına əhli-kəmalı,
Söylədi onlara olan əhvalı.
Başlandı çox uzun bir müzakirə,
Əl atdı hərəsi bir cür tədbirə.
Nəhayət, ərz etdi arif olanlar
Ki: – "Ey yer üzündə adil hökmdar!
Bizçə oğlunuzun dərdi sevgidir,
O, sevda yolunda əriyib gedir.
Çox idi cismində hərarət, həvəs,
Üstəlik mey içib, oldu meypərəst.
Meyin atəşilə öz hərarəti,
Birləşib yaratdı bu şərarəti.
Bir də ki, səkkizə çatmamış yaşı,
Düz on il təhsilə qarışdı başı.
Sonra da üç-dörd il öyrəndi sənət,
Bunun təsiri də az deyil, əlbət.
Üstəlik bu qədər səyahət etmək
Onda yorğunluğu artırmış, demək,
Az deyil təsiri təbiətin də
Olan qızğınlığın, hərarətin də.
Hələ bu səbəblər qalsın bir yana.
O ki, qəsd edərək bir zaman cana,
Tilsimlər açmağı eylədi adət,
Bu yolda nə qədər çəkdi əziyyət.
Cismində yaralar açdı əjdaha;
Divlərlə cəngini demirik daha.
Bunca atəşlərə düşən bir nəfər,
Təəccübmü olsa bir od, bir şərər.
Bu qədər bəla ki, üz vermiş ona,
Məhəbbət atəşi baisdir buna.
Bu atəş içində yanır məzacı,
Söndürməkdir onun yalnız əlacı.
Bugünkü qurtarır ilk bahar çağı,
Günəşdən od alır lalə yarpağı,

Əsir səmum kimi atəşli yellər,
Səməndər quşu tək çırpınır ellər,
Az sonra gunəşin hərarətindən,
Ulduzlar əriyib tökülüb həmən.
Düzlərdə sürulər istidən mələr,
İlanlar qıvrılıb sərinlik dilər.
Hava dağ üstundə atəş saçandır,
Qaynayan bulaqlar ondan nişandır,
Üfüqdən şəfəq də çəkilmir axşam,
Qızarmış ocaqdır, sanki o göy çam.
Bir qızqın kürədir, bəlkə də, göylər,
Günəş bu kürəyə od nisar eylər.
Kömürü gecədir, körüyu ruzgar,
Qığılcımlarıdır, sanki ulduzlar.
Hər yana baş vuran çaylar su deyil,
Yer üzu istidən tər axıdır, bil.
Bu ğuraq havalar, yaman istilər,
Yəqin ki, Fərhada eyləmiş əsər.
Lakin etmək üçün dərdinə əlac,
Sərin bir məkana vardır ehtiyac.
Dənizlə beş günlük yolda bir yer var,
Ora göndərilsə, oğlun sağalar.
Bir gözəl adadır, ətrafı dəniz,
Vəsfini etməyə ağıllar aciz.
Həmin cəzirədə bir uca dağ var,
Onun dörd yanından axır bulaqlar.
O şəffaf çeşmələr, o xoş mənzərə,
Səma dəryasında bənzər ülkərə.
Yumşaqdır havası o sahillərin,
Dağın da iqlimi keçir çox sərin.
O böyük təpədə bir sərinlik var
Ki, buzla örtülür axan bulaqlar.
Şahzadə o yerə səfər eyləsə,
Qalmaz ürəyində nə qəm, nə qüssə.
Tavansız dimağı gələr qüvvətə,
Mübarək vücudu çatar səhhətə.
Hava təsirindən qorxmayan zaman,

Əlaçını etmək olar çox asan".
Hər nə eşitdisə şah təbiblərdən,
Tamam qəbul edib söylədi: "Əhsən!"
Sonra Mülk-araya tutub üzünü,
Dedi: – "Təbiblərin eşit sözünü!
Neçə gün dənizlə səyahət üçün
Hər nə lazımdırsa hazırlat bu gün!"
Bu uca fərmanı eşidən vəzir,
Lazım olanları sazladı bir-bir.
Tədarük bitincə, əmr eylədi şah,
Gedib şahzadəni etsinlər agah.
Dərya üzərində olacaq səfər.
Cavan şahzadəyə verildi xəbər.
Bilincə əhvalı kədərli Fərhad,
Sevinib xəbərdən qəlbi oldu şad,
Dedi: – "Şaha məndən yetirin salam,
Onun məramıdır məndəki məram.
Çıxa bilərmiyəm ata sözündən.
Bütün qulları tək bir quluyam mən.
Hər nə əmr eyləsə uca hökmdar,
Sözündən çıxmağa qüdrətimmi var?"
Şaha yetirdilər həmin sözləri,
Fərəhdən yaşardı onun gözləri,
Dedi: – "Hazırlansın gəmilər bu gün,
Səfər tədarükü yüklənsin bütün
Ki, çıxaq biz yola sökülməmiş dan,
Könül istəyəni etməli insan!"
Xəbərdar olunca bundan şahzadə,
Oldu sevincləri min qat ziyadə.
Çünki səyahətə çox idi meyli,
Bu səfər qəlbinə oldu təsəlli.
Bəlkə, səyahətdə işlədib hiylə,
Tapar bir bəhanə, ya bir vəsilə,
Çıxarar xaqanı qara şübhədən,
Eylər bir müddət də qürbəti məskən.
Bu iş məqsədinə gəlirdi uyğun.
Odur ki, xatiri şad oldu onun.

Könlundə sevincdən coşdu bir dəniz,
Ancaq bir gəmi tək dayandı səssiz.
Aşıb-daşmadaydı sonsuz xəyalı,
Ardı kəsilməyən dalğa misalı.
Saqi, al şərabı axıt dərya tək,
Onun piyaləsi qayıqdan gərək!
Üzüldu varlığım qəm dəryasında,
Həmin qayıqla sən tez yetiş dada!

## FƏRHADIN XAQAN VƏ MÜLK-ARA İLƏ DƏNİZ SƏFƏRİNƏ ÇIXMASI

Kəlam dəryasında üzən bir insan
Bu məna dürrünü çıxartdı ordan:
Tamam cəm olunca zəruri şeylər,
Xaqanla şahzadə qıldılar səfər,
Ayla günəş kimi o iki sirdaş
Sürdülər atları sahilə birbaş.
Bir anda dənizə dikildi gözlər,
Göründü sularda böyük bir şəhər:
Budur, saysız gəmi durub yan-yana,
Şəhər tək görünür baxan insana.
İki yüz gəmidir-olduqca iri,
Fələk gəmisindən böyük hər biri.
Dorları Ülkərə yaylıq uzatmış,
Dibləri yeraltı öküzə çatmış.
Durmuş dirəkləri ayla yanaşı,
Qəmərin artmışdır bundan təlaşı.
Dorlara çəkilən hər abı yelkən,
Bir nişanə idi sanki fələkdən.
Həmin yelkənləri saxlayan iplər
Günəşin zərəfşan telinə bənzər.
Bir dünya evidir sanki hər gəmi,
Dünyadan da geniş, asiman kimi.
Xalçalar döşənmiş gəmidə, xarrat
Qurub düzəltmişdir şahanə bir taxt.

Hər gəmi tağ kimi düşübdür suya,
Sütunu baş vurur ulduza, aya.
Bir ucu gömülmüş dibsiz dənizə.
Bir ucu dəymədə mavi günbəzə.
Nəhəng sütunlara baxan hər insan
Təəccüb içində qalırdı heyran.
Hər yelkən səmaya bir bayraq olmuş.
Hər dor ağacıysa bir dayaq olmuş.
Onlara qorxu yox oddan, küləkdən,
Asiman tutmuşdur üstündə məskən,
Bir yandan möhkəm ip, bir yandan dirək,
Yelkən günbəzini tutmaqda bərk-bərk.
Yelkəni saxlayan bu iplə, bu ox
Yerin mehvərinə çox bənzəyir, çox.
Bunlardan başqa da var xeyli gəmi,
Hər biri sürətdə yellər həmdəmi.
Hər biri möhtəşəm, böyük saraydır,
Göylər dənizində yeni bir aydır.
Əlavə minlərcə xırda qayıqlar
Sürətdə min tülək tərlanı haqlar.
Yürüşləri iti bir tufan kimi,
Duruşları sabit asiman kimi.
Su üstə o qədər üzürlərdi tez,
Onlara çatmazdı quruda Şəbdiz.
Yolçular yolunu asanlaşdıran
Qayıqlar min beş yüz olardı, saysan.
Bir gəmidə olan şahanə taxtda
Əyləşdi şah ilə oğlu şahzadə.
Çinlilərlə dolub üzən şəhərlər,
Böyük Çin mülkünə oldu bərabər.
Azuqə yükünün hesabı yoxdu,
Könül istəyəndən yüz dəfə çoxdu.
Külli ehtiyatla dolmuş hər gəmi,
Qarunun yığdığı xəznələr kimi.
Elə ki, bütun yük daşındı gəldi,
Gəmilər dəryada yola düzəldi.
Qalxdı gurultudan elə vəlvələ,

Sanki Çin yurdunda qopdu zəlzələ.
Neçə min hünərli dənizçi birdən
Keçdi balıq kimi göy ləpələrdən.
Onların elə cəld atları vardı,
Çapdıqça sulardan od çıxarardı.
Xanın yanındaydı öz məiyyəti,
Bir idi hamının istiqaməti.
Suda on min adam yola düzəldi,
Sanki bütün bəşər cövlana gəldi.
Suya kölgə düşdü sanki cahandan,
Cahan yox, bəlkə də, lap asimandan.
Bulud göy üzünü necə tutarsa,
O cür üz örpəyi örtmüşdü dərya.
Onlar cəzirəyə tərəf tutub üz,
Tamam yol getdilər üç gecə-gündüz.
Gəldikçə dalğalar suda baş-başa,
Edərdi şah ilə oğul tamaşa.
Hərdən cuşə gələn bu dalğalarda
Min qəribə möcüz olurdu peyda.
Dəniz gömgöy idi asiman kimi,
Göy qucmuşdu onu bir canan kimi.
Üzürdü yüzlərcə zərrin balıqlar;
Yəqin ki, onları görən mat qalar.
Nəhəng balıqlar da tək-tək üzürdü,
Görkəmi hər kəsin bağrın üzürdü.
Bu dağ gövdəlilər böyük vüqarla
Yarışa çıxmışdı coşqun sularla.
Arxa hissələri şiş təpələr tək,
Şəffaf naxışları saf ləpələr tək.
Onlar yol aldıqca geniş dəryada,
Ulduzlar axırdı sanki səmada.
Hər biri o qədər şux və dilbərdi,
Sular güzgüsünə sığal verərdi.
Daha da nadincdi kiçik balıqlar,
Onların əlindən su olmuşdu zar.
Qidanı Dəlvdən alan hut kimi,
Alırdı onlar da dənizdən yemi.

Kim saya bilərdi o balıqları,
Ot kimi sonsuzdu sayı, miqdarı
Çanaqlı bağalar üzüb sərsəri,
Günbəz tək cisimlə örtmüş hər yeri;
Puç etməsin deyə cismini sular,
Ona hasar çəkmiş qüdrətli memar.
Səqfi kələf kimi qurulu günbəz,
Hərəkət zamanı uçub tökülməz.
Körpə balıqları ovlar nəhənglər,
Sanki ceyran tutur düzdə pələnglər.
Cismi dağlar kimi olan balıqlar,
Külüng dişlərini eylər aşikar.
Beli mişar kimi görünür iti,
Ömür fidanını kəsmək niyyəti.
Sanki qəm qoşunu siyirmiş xəncər,
Ya dərd qalasına hasar çəkmişlər.
Ağzında dalğanı, eylə zənn edin,
Bir zireh tutmuşdur sanki kəlbətin.
Hələ su itləri, böyük nəhənglər –
Yanında kiçikdir milçəklər qədər.
Sataşırdı gözə heybətli xərçəng,
Üzürdü gah dala, gah yana ləng-ləng.
Toqquşanda ona çanaqlı bağa,
Sanki dağ dəyirdi başqa bir dağa.
Çöldəki quşlardan artıqdı, düzü,
Üzən vəhşilərin suda surüsü.
Əsla dincəlmirdi nadinc dalğalar,
Açmışdı göy toru orda ruzigar.
Boylanıb hər yana şah ilə Fərhad,
Dəniz aləminə baxırdı mat-mat.
Fələk tərs üzünü çevirdi nagah,
Boyük bəlalardan eylədi agah,
Başladı əsməyə qorxunc küləklər,
Bürüdü dənizi qara bir kədər.
Cənubdan baş alıb gələn bir ruzgar
Yolçular canına saldı qorxular.
Görüb bu tufanı gəmi sürənlər,

Dedilər xaqana: – "Ey ulu sərvər!
Bu tufan yüz ildə əsər bir kərə,
Salar yolçuları fəlakətlərə!"
Tez suya saldılar gözəl bir qayıq,
Bütun gəmilərdən sürəti artıq
Ki, tufan artmamış həddən ziyadə,
Bari xilas olsun şahla şahzadə.
Fərhad o qayığa mindiyi zaman,
Gəmidən ayırdı qayığı tufan.
Oğlunu dərbədər salanda dərya,
Min bəla üz verdi yazıq ataya.
Ayırdı onları elə ayrılıq
Ki, vüsal ümidi yox idi artıq.
Getdikcə güclənib coşurdu tufan,
Sanki sarsılırdı kökündən çahan.
Elə dalğalanıb dururdu dərya,
Üstünə asiman uçurdu guya.
Qocaman dalğalar gəlib döş-döşə,
Vuqarla başını vururdu ərşə.
Dağ kimi dalğalar baş vurub göyə,
Bənzərdi hər biri nəhəng körpüyə.
Gah yerin təkindən qalxır göylərə,
Gah göylər taxtından enirdi yerə.
Səma heyran ikən suyun qeyzinə,
Min zərbə dəyirdi hər an bənzinə.
Göylərlə o qədər su açdı cəngi,
Göylərin Nil kimi bulandı rəngi.
Bu haldan qorxuya düşüb ulduzlar,
Hilal gəmisində etdilər fərar.
Göylərə baş verən hər böyük gəmi
Sularda oynardı bir saman kimi.
Atdı hər gəmini bir səmtə ruzgar,
Düşdü bir-birindən uzaq yolçular.
Gəmilər sularla qalxdı lap göyə,
Dorları yaralar vurdu fələyə.
O çağdan göylərin bağrı şan-şandır,
Ulduzlar vurulan zəxmə nişandır.

Elə ki, sularla göylər tutuşdu,
Fələyin o mavi günbəzi uçdu.
Xərçənk bürcü ilə hut bürcü göydən
Enərək dəryanı eylədi məskən.
Günəş də köç etdi bu yeni yurda,
Sanki qərar tutdu inci büllurda.
Göydə mələklər də bir an diksindi,
Yaşılbaş sona tək sulara endi.
Qəza hər gəmini bir yerə atdı,
Gah göyə, gah suya vurub dağıtdı.
Sağ qalmış olsa da, tək-tük gəmilər,
Yoxdu yolçularda duyğudan əsər.
Çəkilinçə göyə gecə niqabı,
Bitmədi dəryanın bu iztirabı.
Qaranlıq qoynuna aldı gündüzü,
Bir qara şal örtdü dəryanın üzü.
Azaltdı, getdikcə fələk rüzgarı,
Dəniz öz yerində tutdu qərarı.
Lakin səyahətə çıxan qafilə,
Bütün ehtiyatı, azuqəsilə,
İtmişdi büsbütün gözdən, xəyaldan,
Suların qoynunda olmuşdu pünhan.
Dəryada çoxları batdı daş kimi.
Nəhəng balıqların oldular yemi.
Çox gəmi dəryaya cumdu həmin gün;
Zəvvarı məhv olub boğuldu bütün.
Əgər yüz gəmidən qaldısa biri,
Yüz insandan biri deyildi diri.
Taxta-para üstə bəzisi, lakin,
Duşmüşdü dalğalar içrə didərgin.
Xaqanla Mülk-ara minən gəmiysə
Gərərək köksünü coşqun dənizə,
Etdi həmləsini dalğaların rədd,
Tufanlar qoynunda qaldı səlamət.
Orda da çoxları verməḍəydi can,
Uçmuşdu çoxunun ağlı başından.
Gəmi bir sahilə gəlib yan aldı,

O Çinə yaxın bir kiçik mahaldı.
Başqa gəmilərdə kim sağ qalıbsa,
Hərəni bir yana atmışdı qəza.
Gəlib çıxmağını ora xaqanın,
Eşidib öyrəndi tez uzaq-yaxın.
Keçən əhvalatdan tutaraq xəbər,
Bəxti qara şahı xilas etdilər.
Huşsuz qalanlara iylədib ətir,
Huşa gətirdilər onları bir-bir.
Başqaları kimi ayıldı şah da,
Keçən fəlakəti tez saldı yada.
Görməyincə gözü oğlu Fərhadı,
Ucaldı göylərə ahı, fəryadı.
Lakin vəzir şahı tutaraq dilə
Dedi: – "Çıxmış olar başqa sahilə".
Şah Sokrat sözünü eyləyincə yad,
Oldu qəm qüssədən, kədərdən azad;
Yenə ömru, günu bilib qənimət,
Qıldı paytaxtına doğru əzəmət.
Saqi, bir cam yetir, duşdüm təvandan!
Həyat dəryasında bezdim bu candan.
Qədəh gəmisində canımı al sən,
Bu qəm dəryasından xilas olum mən.

## FƏRHADIN SINIQ QAYIQDA XİLAS OLMASI

Kim ki, o dəryanı seyr eyləmişdi,
Belə nəql eyləyir bu sərgüzəşti
Ki, sular titrəyib qaynaşan zaman,
Dalğalar ordusu hey coşan zaman,
Fərhadın mindiyi kiçik qayıq da
Oldu parça-parça qarğaşalıqda.
Hər parça uzaşıb bir səmtə getdi,
Bir kiçik parça da Fərhada yetdi.
Sönən həyatına deyib əlvida,
Çox möhkəm dayandı həmin taxtada.

Hey atıb tutduqca sular taxtanı,
Yazığın ağzına gəlirdi canı.
Kükrədikçə dəniz, coşduqca tufan,
O da əl üzürdü candan, cahandan.
Gecə gəmisini batırdı göylər;
Ulduzlar dürrünü gizlətdi səhər.
Dalğalar torunu yığınca tamam,
Fırtına quşları oldular aram.
O sınıq taxtanın düşdü güzarı
Hiçaz sərhəddiylə Yəmənə sarı.
Ruh bədən mülkünə sığınan kimi,
Sığındı taxtaya o da can kimi.
Lakin yoxdu onda ruh nişanəsi,
Duyulmaz olmuşdu çoxdan nəfəsi.
Bu zaman bir Gəmi göründü suda,
Yəmən ölkəsinə gedirdi o da.
Səfərdən gəlirdi bir neçə tacir,
Qaş-daş alverində hər biri mahir,
Gördülər ki, gəlir bir taxtapara,
Vardır üstündə də bir bəxtiqara,
Üzgüçülər düşüb dada yetdilər,
O məçhul adama tərəf getdilər.
Qəşş etmiş gördülər bu növcavanı,
Tufan zərbəsindən bitmiş təvanı.
Tərk etmiş cismini huş da, nəfəs də,
Ölü tək yatmaqda bu taxta üstə.
Dinləyib qəlbini birisi baxdı,
Hələ ölmədiyi meydana çıxdı.
Etdi sağ qalmağı onları xürrəm,
Aldılar gəmiyə onu haman dəm.
Müxtəlif ətirlər iylədib ona,
Şəfa yetirdilər xəstə ruhuna,
Tökdülər ağzına gülablı şərbət,
O verdi Fərhada bir yeni qüvvət.
Dikəlib oturdu, sual eylədi,
Onlar hadisəni ona söylədi.
Fərhad vaqif oldu keçən əhvala,

Tacirlər də onu tutdu suala.
Fərhad cavab verdi: “Bir tacirəm mən.
Xötəndən Yəmənə səfər edərkən,
Yolda gəmimizi qərq etdi tufan,
Batdı var-yoxumuz sularda yeksan.
Mənə nəsib olub bu taxtapara,
Siz isə etdiniz dərdimə çara.
Mən taxtaya pənah aparan zaman,
Uçdu ağıl-huşum, getdi başımdan.
Şüur dimağımı eyləyincə tərk,
Olub keçənləri etməmişəm dərk.
Başımdan çıxarkən huşum dübarə,
Kəm bəxtim yetirmiş məni bu yerə.
Necə gəlməyimdən xəbərsizəm mən,
Şikayətim çoxdur tale əlindən.
Mən ki, əl üzmüşdüm öz həyatımdan,
Kəsmişdim ümidi tam nicatımdan;
Siz ki, qurtardınız məni ölümdən,
Lütfünüzə qarşı minnətdaram mən.
Ömrüm boyu olsam sizə xidmətkar,
Yenə də boynumda minnətiniz var.
Bu zəhmətə qarşı etmək təşəkkür,
Məncə, can verməkdən daha müşküldür.
Əgər bu dünyada ömr etsəm min il,
Yenə razılığım qurtaran deyil.
Qəribəm, xəstəyəm, acizəm, aciz,
Görüm bu dərdlərdən uzaq olun siz.
El yardım əlini uzatmış mənə,
Güc yox, xidmət edəm yüzdə birinə.
Nə qədər diriyəm bəndənizəm mən,
Çıxmaram dünyada bir əmrinizdən”.
Gəmi əhli görüb bu nəzakəti,
Onun sözündəki hüsnü, zinəti,
Bildilər şahlıqdan onda nişan var,
Sözləri dərya tək incilər saçar.
Hamı əsir oldu Fərhada qəlbən,
Yaxşılıq etdilər nə gəlsə əldən.

Təvansız cisminə gəlincə qüvvət,
Göstərdilər ona nəvaziş, hörmət.
Hamısı oldular eşqində şeyda;
Neçə gəmi oldu bu anda peyda.
Gəmilər görüncək başlandı matəm,
Ağlamaq, sızlamaq artıq dəmadəm.
Onlar bir-birindən alıb halallıq,
Fərhadın halına yandılar artıq,
Gəlməyirdi gözə nə mal, nə də can,
Hamı nigarandı Fərhad sarıdan.
Fərhadsa onları tutdu suala
Ki: – "Nədir söyləyin, səbəb bu hala?"
Onlar çavab verib yaş axıdaraq
Dedilər: – "O gələn gəmilərə bax!
Onlar qarətçilər dəstəsidir, bil,
Dərya üzərində gəzib müttəsil,
Çıxanda qarşıya suda bir gəmi,
Şığıyıb üstünə ildırım kimi,
Atırlar gəmiyə atəşli oxlar;
Bu ox hara düşsə, ora od tutar.
Gəmi odlananda yaxın gəlirlər,
Qırıb yolçuları axıra qədər,
Edirlər malları, pulları qarət;
Quldurluq olmuşdur onlara adət.
Bizim dinc yolumuz bir yanda qalmış,
Dərya izimizi bu səmtə salmış.
Bu quldur yurduna kim düçar olsa,
Heç bir ümid yolu yoxdur xilasa".
Bilib macəranı düşündü Fərhad,
Ruh verib onlara qəlbən oldu şad.
Dedi: – "Qəm etməyin, allah-təala
Onlardan yetirməz sizə bir bəla.
Tapılar gəmidə, edirəm güman,
Bir neçə ox ilə, bir ağır kaman.
Bu sözdən hamını bürüdü heyrət,
O hər nə istədi, gətirdilər cəld,
Doğrudur, Fərhada verilən ox, yay

Onun dağ gücünə olammazdı tay,
Lakin olmayaraq o mütəəssir,
Yayı və oxları yoxladı bir-bir.
Bitirincə işi həmin dilavər,
Yanaşdı gəmiyə o yolkəsənlər.
İstədilər yenə od yağdıralar,
Sakit yolçuları yaxıb qıralar.
Fərhad ox tutmayan bir yeri seçdi.
Cəld bir atlanışla oraya keçdi,
Nöyüt qazanını aldı nişanə,
Ora bir ox atdı çox mahiranə.
Ox öz hədəfinə gedib yetişdi,
Neft olan qazanı bir anda deşdi.
Gəmidən od qalxıb yandı, nə yandı
Od içrə ah səsi ərşə dayandı.
Sonra başqa gəmi gəlib yanaşdı,
O da əvvəlki tək yanıb tutaşdı.
İki gəmi əhli yandı sərasər,
Üz qoydu qaçmağa sonra gələnlər.
Gəmilər geriyə qayıdan zaman,
Fərhad beş-onunu batırdı haman
Quldur dəstəsindən bir çoxu öldü,
Çoxu nicat üçün suya töküldü.
Bu hal tacirləri eyləmişdi lal,
Xilas olmasına hamısı xoşhal.
Diz çöküb Fərhada butün tacirlər
Durub dolandılar başına yeksər.
Qurban edərdilər ona bigüman,
Əllərindən gəlsə, can ilə cahan.
Bitmişdi Fərhadın səbri, qərarı,
Əlində deyildi öz ixtiyarı.
Qəlbinə təsəlli etməyirdi kar,
Onlar son mənzilə gedib çatdılar –
Yəmən bəndərinə üz qoydu gəmi,
Çıxdılar sahilə yetişən kimi.
Hamı xilas oldu bu maçəradan.
Yüz min fəlakətdən, yüz min bəladan.

Bir gözəl ev tutub şəhərdə o gün,
Daşındı oraya yolçular bütün.
Belə bir xoş günü bilib qənimət,
Tezcə düzəltdilər böyük ziyafət.
Yəmən yaqutu tək qırmızı meylə,
Dolmuş qədəhləri aldılar ələ.
Fərhadın şərabdan qızışıb başı,
Töküldü mey kimi gözünün yaşı;
Saldı xatirinə keçən günləri,
Cənnət tək sarayı, taxtı, ləşkəri,
Dəryada qəm içrə qalan atanı,
Gözləri yol çəkən yazıq ananı,
Qürbətdə özünün tək qaldığını,
Qəm-qüssə əlində saraldığını.
Gah bu kimsəsizlik qəlbini dəldi,
Gah da xəstəlikdən fəryada gəldi.
Gah canı od tutdu şeydalığından,
Gah ona yandı ki, yox idi canan.
Düşdü hər anda bir özgə aləmə,
Qərq etdi məçlisi dərdə, matəmə.
Onun əhvalını hamı anladı,
Kimi qüssələndi, kimi ağladı.
Yox idi bu dərdi tamamən bilən,
Özü də xəbərsiz idi özündən.
Onların içində vardı tək biri,
Gəzmiş çox elləri, görmüş hər yeri;
Sənət aləmində qazanmışdı ad,
Mahir rəssam idi, o mahir ustad.
Kağızda gəzirkən qələmin ucu,
Sanırdın qüdrətin qələmidir bu.
Hansı bir rəsmini görsəydi insan,
Onun sənətinə olardı heyran.
Qalmamışdı onun gəzmədiyi yer,
Şərqdən qərbə qədər eyləmişdi seyr.
Güzarı düşəndə Xətən yurduna.
Rəssam Mani belə rast gəlib ona,

Ustalıq üstündə girmişdi bəhsə,
Qalib gəlməmişdi heç kəs heç kəsə.
Qələm əhli onu uça tutardı;
Usta rəssam idi, Şapurdu adı.
Qəzadan səyahət vaxtı bu nəqqaş,
Həmin tacirlərə olmuşdu yoldaş.
O, Fərhad halına qalmışdı heyran,
Çünki görməmişdi belə bir insan.
Onun hər sözünə diqqət edirdi,
Bilməkçin dərdini söhbət edirdi.
Dənizdə çənginə olmuşdu heyran,
İndi də ağlına qalmışdı heyran.
Görüncə Fərhadın ahu-zarını,
Qanlı göz yaşını, intizarını,
Tapdı fərasətlə bu hikmətləri
Ki, dəlmiş qəlbini eşqin xəncəri.
Təsəlli verməyə etsə də min cəhd,
Fərhad bu sözlərə vermirdi qiymət.
Onun hər halına yetirərək göz,
Eşqin əzabından saldı o çox söz.
Nə qədər sevgidən açdı hekayət.
O qədər eşq ona etdi sirayət.
İnanıb Fərhadın vurulduğuna,
Min sevda dastanı danışdı ona.
Fərhad olmurdusa bir saat aram,
Yenə də Şapura tezcə oldu ram.
O andan qoyuldu dostluq binası,
Oldu Şapur onun qəlb aşinası.
Onsuz keçirməzdi ötən bir anı,
Dinlərdi dostundan sevgi dastanı.
Şapur danışdıqca, ağlardı Fərhad,
Danışmazsa qəmi artardı yüz qat.
Beləliklə, tapdı özünə həmdəm,
Fikrinə, qəlbinə, sirrinə məhrəm.
Şapur işlədərək min cürə tədbir,
Onun kimliyini öyrəndi bir-bir.

Gizlilik sevməyir meylə məhəbbət,
Fərhad da sirrini açdı, nəhayət.
Şapur məxfi ona verdikcə sual,
Fərhad cavabını verirdi dərhal.
Şapur ki, hər sözə düz cavab aldı,
Sualı bir qat da dərinə saldı.
Dedi: – "Kimlərdəndir de, əslin sənin,
Hansı ölkədədir əsil məskənin?"
Fərhad cavab verdi – "Bir xahişim var,
Çıxsın xatirindən belə suallar.
Bu sirri açmaqdan fayda yox mənə,
Eşitmək bir xeyir verməz həm sənə.
Qaldı, macəramı sual edirsən,
Bunu çox qısaca, nəql edərəm mən".
Fərhad işlətməyib hiylə və tədbir,
Etdi macəranı bu yolla təsvir:
Dedi: – "Mən bəxti kəm, mən evi bərbad,
Yaşardım bir zaman hər kəs kimi şad.
Hər şeydən ucaydı, məncə, ibadət,
Şüarım etməkdi tanrıya taət.
Bir gecə mənə bir bəla yetişdi,
Fələk bir ox ilə sinəmi deşdi.
Yuxuma kirmişdi bir qəşəng diyar,
Görməmişdi gözüm onun tək diyar",
Gər nə görmüşdüsə bəlalı Fərhad,
Bir-bir söyləyərək eylədi fəryad.
Söz yetdi ayüzlü gözəl vəsfinə,
Özündən gedərək yıxıldı yenə.
Şapur bu əhvaldan düşüb təşvişə.
Çarə etmək üçün girişdi işə.
Fərhadın başını alıb dizinə,
Üzünə su səpib, ayıltdı yenə.
Tacirlər qaldırıb qədəh-qədəh mey,
Hissiz qalanadək nuş etdilər hey.
Hamı sərxoş olub qılmadılar fəhm
Ki, nə söz danışır o iki həmdəm.

Şapur görən kimi bu vəziyyəti,
Artırdı Fərhadla sözü, söhbəti,
Dedi: – "Ey gülşəndə uca sərv olan,
Bilirəm ki, sənə zülm etmiş xəzan.
Tanrının təqdiri belədir ki, sən
Məni hər sirrindən agah edəsən.
Sənin axtardığın o xəzinədən,
Bəlkə də, bir soraq verəçəyəm mən.
Bu qədər ki, sənə yaxın həmdəməm,
Gizli sirlərinə bir az məhrəməm,
Qəm etmə, dediyin o şən gülüstan,
O yer ki, yerbəyer verirsən nişan,
O yer ki, deyirsən yox bərabəri,
Dolanıb gəzmişəm mən o yerləri.
O yurdun təsviri bir deyil, mindir,
O cənnət bucağı Ərmən-zəmindir.
Yolun düşsə ora, rəhbərin ollam,
Rəhbərin demirəm, nökərin ollam",
Bu müjdə şad etdi dərdli Fərhadı,
Lakin sözlərinə tez inanmadı.
Şapur anladı ki, bəlalı Məcnun,
Doğru sözlərinə inanmır onun,
Dedi: – "İnanmasan sözümə, Fərhad!
Mən öz dediyimi eylərəm isbat".
Çıxartdı bir kağız, bir də bir qələm,
O yerin şəklini çəkdi həmin dəm.
O qədər düz çəkdi bu rəsmi rəssam,
Fərhad dediyinə düz gəldi tamam.
Şapurun çəkdiyi rəsmi görüb o,
Bildi ki, söyləyir hər sözü doğru.
Yenə canan yurdu düşdü xatirə,
Ah çəkib, vay deyib, sərildi yerə.
Saqi, bir cana gəl bu işrət çağı
Dövran məqsədimdən verir sorağı,
Ərmənin gözəli alır qərarı,
Ver içək şərabı biz ərmənvarı.

## FƏRHADLA ŞAPURUN YƏMƏNDƏN ƏRMƏN-ZƏMİNƏ GƏLMƏSİ

Bələdçi bu yolu eyləyəndə qət,
Etdi hekayəni belə rəvayət
Ki, səhər gözünü açanda Fərhad,
Elədi Şapurun sözlərini yad,
Canlandı gözündə o çəkən şəkil,
Canan ölkəsini gördü elə bil.
Hələ zülmət uçub, açılmamış dan,
Hava sürmə kimi tünd olan zaman,
Şapur hüzuruna yollandı pünhan;
Öpmək istəyərkən ayaqlarından,
Onun səs-küyünə oyandı Şapur,
Gördü ki, parlayır qaranlıqda nur.
Dedi: – "Gəl, ey eşqin, möhnətin şahı,
Gəl, ey eşq əhlinin baş qibləgahı,
Söylə səbəbini bu tez gəlməyin,
Axşamkı söhbəti anmışsan yəqin".
Şapur əhvalatı eyləyəndə yad,
Onun ayağına döşəndi Fərhad,
Dedi: – "Ey, hər sözü qəlbə ruh verən,
Məni sevindirdin o müjdənlə sən.
Həmin sövdalardır könlümə qüvvət,
Həmin söhbətlərdir, bil, mənə məqsəd.
Gərək tez yerinə yetə peymanın,
Tez olaq zəvvarı həmin məkanın".
Eşidib bunları ağıllı Şapur
Dedi: – "Ey aləmə işıq salan nur,
Sən yoldaşım olsan, cənnət olar yol,
Məqsədin bu isə, durma hazır ol".
Səfər tədarükü tez başa gəldi,
İki mehriban dost yola düzəldi.
Şapuru, o qəlbi geniş həmdəmi
"Fərhad izləyirdi bir kölgə kimi.
Beləcə, yolları ölçərək onlar

Getdilər, heç yerdə tutmadan qərar.
Sevdalı aşiqlə vəfalı həmdərd
Bütün yol uzunu edirdi söhbət:
Gah dostluq, yoldaşlıq sədaqətindən,
Gah da birgə işin mənfəətindən.
Gah Fərhad o rəsmi ələ alardı,
Başdan ayağadək nəzər salardı.
Deyərdi: "Qısqanar Çin rəssamları
Görsə sənin kimi bir sənətkarı".
Şapur bu zövqünü görüb dostunun,
Bildi nəqqaşlıqda əli var onun.
Böyləcə iki dost bir neçə gunə,
Gedib yetişdilər Ərmən-zəminə.
Şapur söylədi ki: – "Bax, ey vəfadar,
Budur, sən yuxuda gördüyün diyar.
İndi gəl seyr edək bu gülşənləri,
Axtaraq ürəyin istəyən yeri".
Fərhad bu sözləri eşidən zaman,
Diqqətli-diqqətli gəzirdi hər yan.
Üç-dörd gün hər yana yetirərək göz,
Bir gün şadlıq ilə gəldi üzbəüz,
Aldı ağuşuna onu nagəhan
Güzgüdə gördüyü yaşıl gülüstan.
Tanış gəldi ona o susən, o gül.
Güllərin üstündə sevdalı bülbül.
Bu yerlər huşunu başından aldı,
Ağlının çırağı sönüb qaraldı.
Haraya baxdısa o bəxtiqara,
Gördü, gül aşina olubdur xara.
Sıxıldı yenə də biçarə könlü,
Qaldı qəm əlində avarə könlü.
Bəla vadisinə qoyaraq qədəm,
Əzab zirvəsinə qaldırdı ələm.
Şapura söylədi: – "Bir az dayan, dur!
Dostluğun sirləri sənə əyandır.
Yuxumda gördüyüm o dağ, o dərə,

Çıxdı qarşımıza, bax, birdən-birə.
Yaxınlaş mənə sən, daha məhrəm ol,
Yaralı könlümə indi məlhəm ol.
Yuxumda gördüyüm o daşçapanlar
Odur qarşımızda olmuş aşikar.
Könlüm ora çəkir məni anbaan,
Gəl gedək onlara baxaq yaxından.
O iki aşina, o iki həmdəm
Gedib iş yerinə yetişdi bahəm.
Gördülər bir yığın bəlalı insan
Su arxı çəkirlər dağ arasından.
Qranit daşları yardıqça onlar,
Qopur könüllərdən ahlar, amanlar,
İki yüz daşyonan, əlində tişə,
Çalışır, çarpışır burda həmişə.
O qədər sərt idi lakin qayalar,
Yüz tişə zərbəsi etməyirdi kar,
Qopmurdu noxudca bir daş parçası,
Noxud yox, hətta bir xaşxaş parçası.
İki yüz daşyonan üç il bu qayda,
Külüng çalmışsa da, lakin nə fayda,
Vur-tut çapılmışdı iki yüz qulac,
Onlar da yarımçıq, onlar da qıyqac,
Hər kəs dad edirdi bu iztirabdan,
Gözətçi zülmü də artırdı hər an.
Fərhad bu zəhməti, bu əziyyəti
Görüncə kəsildi səbri, taqəti,
Qəm, kədər yağaraq baxışlarından,
Bu dəstə içinə qarışdı haman.
Dedi: – "Ey mən kimi bəla çəkənlər,
Fələkdən qəlbiniz olmuş mükəddər,
Deyin sirrinizi siz aşikara,
Bu arx getməlidir haradan hara?
Neçin çəkirsiniz bunca bəlalar,
Nə vaxtdan çarx sizə etdi cəfalar?
Görüb halınızı qəlbim alışdı,
Alovu, tüstusü başımdan aşdı".

Görərək Fərhadın gözəl üzünü,
Eşidib ürəyə yatan sözünü,
Bütün daşyonanlar qaldılar heyran,
Ruhlanıb o gözəl kalamlarından,
Baş əyib dedilər: – "Ey cövhəri pak,
Bizi valeh etdi səndəki idrak,
Bilmirik mələksən, yoxsa bəşərsən,
Xuda yarın olsun, dürrü göhərsən,
Biz mələk görməmiş olsaq da, vallah,
Sən kimi bəşər də görməmişik, ah!
Vücudun görməsin dərdi, əzabı,
Sorduğun sözlərin budur cavabı:
Cənnətə bənzəyən bu diyar ki, var,
Olmuş sahibəsi bir gözəl nigar.
Əfridun nəslindən bir hökmrandır,
Şöhrətdə Cəmşiddən alinişandır.
Başında yoxsa da onun qızıl tac,
Bütün tac əhlindən almadadır bac.
Belində yoxsa da gümüş kəməri,
Qızıl kəmərlidir bütün ləşkəri.
Sultanlıq yaraşır gözəl adına,
Ellər Məhinbanu deyirlər ona.
Otuz-qırxa qədər qalası vardır,
Onların hər biri ərşə hasardır.
Hökmü altındadır şadlıq da, qəm də,
Dolu xəznələri təkdir aləmdə,
Cahu-çəlalını deməklə bitməz,
Zinət əşyaları hesaba yetməz.
Varisdir bəxtiyar Banuya yalnız,
Qardaşından qalan gül üzlü bir qız.
İsmət sarayının şahıdır o da,
Dövlət səmasının mahıdır o da.
Vəsfini etməyə bizdə qərar yox,
İsmini çəkməyə həm ixtiyar yox.
Özütək sərvqəd qızlardan özgə
Bir insan görməmiş üzünü, bəlkə.
Gözəl camalını yaxından görən

Varsa da, kənara çıxmır qəsrdən.
Kirpiyi tikandır, çöhrəsi bir gül,
Onuntək bir gözəl tapılar müşkül.
Ona çox hörmətlər eləyir Banu,
Könül otağında bəsləyir onu.
Onunla məclisi gülşən olubdur,
Cahan gözlərində rövşən olubdur.
Bizim qazdığımız bu qocaman dağ,
Bax geniş çöllərdə açıb qol-budaq,
Bir ucu məşriqə gedib çatıbdır,
Bir ucu məğribə kəmənd atıbdır.
Bu dağın şərqində axar bir su var,
O saf su dirilik suyuna oxşar.
Deyirlər adına "həyat çeşməsi".
Dirildir yataqda can verən kəsi.
Arabir seyrinə gələr o pəri.
Pərilər çox sevər sər çeşmələri.
Gül üzlü qızlarla məclis düzəldər,
O gözəl məclisi gül üzlər bəzər.
Dağın qərbindədir qızın məkanı.
Ərmən-zəmin olmuş şöhrəti, şanı.
Cənnət də qısqanır o gözəlliyə.
Yanında bir dağ var baş vurur göyə.
Ay üzlü dilbərin düşmüş ağlına,
O dağda bir saray eyləsin bina.
İndi başa gəlmiş o gözəl qəsir,
Bircə susuzluqdur ondakı kəsir.
Çarə tapmaq üçün bu müşkül işə,
Bütün mühəndislər düşüb təşvişə,
Qərara gəldilər bir arx çəkilsin,
Axsın qəsrə suyu həmin kəhrizin.
Lakin saray ilə suyun arası,
On-on beş ağaça qədərdir azı.
Qarşıda gördüyün xətti, izləri
Çəkmişdir o qızın mühəndisləri.
Əmr olmuş biz kimi natəvanlara,
Bəla dağlarında xəstə canlara,

Yararaq tunc kimi qayalıqları,
Arx açaq bu dağdan o dağa sarı.
Həmin o arx ilə buraxılan su,
Axsın saraydakı eyvana doğru.
Lakin neyləyək ki, bu sərt daşlara
Vurulan zərbələr gəlməyir kara.
Üç ildir can qoyduq bu çətin işə,
Qalmadı sınmamış külüng və tişə.
Üçillik ömrümüz keçdi ən acı,
Arx isə keçməmiş üç yüz qulacı.
Yetsək ömr etməkdə Həzrəti-Nuha,
Ruhumuz bənzəsə ondakı ruha,
Yenə bu qazıntı bitib qurtarmaz,
Onun bitməsinə güman azdır, az,
Odur ki, usanıb bunca əzabdan,
Ahu-zar edirik biz hər bir zaman.
Külüng çalmasaq da, çalsaq da birdir,
Sanki bu qayalar tökmə dəmirdir.
Nə qədər üzrlər gətirdiksə biz,
Əfsus rədd edildi hər xahişimiz.
Halımız bu idi, dedik birbəbir,
Qərəz ki, deməklə bitən deyildir!".
Fərhad eşidincə bu macəranı,
Onların halına yanaraq canı,
Öz-özünə dedi: – "Bu məzlumlara,
Fələyin əlindən bəxti şumlara.
Köks gərənlərə aha, fəryada,
Gərəkdir yetişəm bu gün imdada.
Gizlədə-gizlədə öz sənətimi,
Aparan deyiləm məzara kimi".
Görərək orada kürəylə körük,
Geyindi əyninə bir dəri döşlük,
Körüyü kürəyə bağladı möhkəm,
Ocağın odunu eylədi lap dəm.
Kömürlər dönəndə qızıl közlərə,
Kərkini, külüngü yığdı bir yerə,
Ocaqda onlara yer etdi Fərhad,

Bütün alətləri əritdi Fərhad.
Bir kərki qayırdı on-on beşindən,
Külüng də bu yolla qayrıldı, həmən.
Neçə gürz, neçə də zindan qayırdı,
Bunları sıldırım üçün ayırdı.
Bütün bu şeylərə su verdi Fərhad,
Qarin öyrətmişdi bunları bir vaxt.
Xeyli sevindirdi onu bu əhval,
Ustalar da ona baxırdı kar-lal,
Heyrətlə işinə dikmişdilər göz,
Yoxdu ortalıqda nə söhbət, nə söz.
Heç kimdə qalmayıb külünglə tişə
Fərhad tək başına girişdi işə.
Dağlara vəlvələ saldı həvəsdən,
Aşırdı sel kimi daşı-daş üstdən.
Bir fələk filinin yüküydü guya,
Gülüngün zərbindən qopan hər qaya.
Dəhşətli gərgisi dəysə daşlara,
Zərbindən olurdu daş para-para.
Bu daş qırıqları yağdı yağıştək,
Baxanlar qaçdılar, bundan ürkərək,
Onun zərbəsindən qopan hər səda,
Qulağa çatırdı xeyli uzaqda.
Bir günün ərzində həmin dilavər,
Bir yarğan açdı ki, üç il sərasər,
İki yüz ustanın çalışmasiylə
Gəlməmişdi belə yarğan hasilə.
Onun göstərdiyi bacarıq, hünər
Bütün dağlılara çatdı müxtəsər.
Gözətçilər ilə ustalar bütün
Yığışıb getdilər saraya o gün,
Həmin əhvalatı etdilər nağıl,
Göz bunu görməsə, kəsməzdi ağıl.
Saqi, piyaləmə yaqut şərab tök,
Qəm daşı olmuşdur könlümdə bir yuk.
Bir elə mey ver ki, dadıma yetsin,
Qəlbimdən asılan daşı əritsin.

## ŞİRİNİN FƏRHADI GÖRMƏSİ

Bu dastan sərrafı saçanda gövhər,
Verdi hadisədən belə bir xəbər:
Eşidib bu halı uzaq və yaxın,
O ərmən-zəminə etdilər axın.
O dağçapan nəri görüb əhali,
Məhini bu işdən etdilər hali,
Dedilər: – “Gəlmişdir bir qərib cavan,
Görkəmi hər kəsi eləyir heyran.
O elə sürətlə yarır dağları
Ki, tarix görməmiş bu iqtidarı.
Bəşərə bənzəmir xisləti, tövrü:
Mislini görməmiş fələyin dövrü.
Gövdəsi bir dağdır, özü bir mələk,
Deyir: – “Dağlar mənə baş əysin gərək!”.
Gələnlər etdilər Fərhadı təsvir,
Hər kəs gördüyünü danışdı bir-bir.
Məhinbanu buna təəccüb etdi,
Əvvəl inanmayıb, xəyalə getdi,
Sonra düzgünlüyü oldu aşikar,
Heyrətlər içində qaldı biqərar
Həvva əyləşən tək cənnət bağında,
Əyləşdi Şirinin tək otağında.
Dedi: – “Ey ömrümün bağında zanbaq,
Gizli otağımı bəzəyən çırağ!
Könül gül üzündən almaqda ziya,
Zülfünə can teli bağlıdır guya.
Eşit, gör sənə mən nələr gətirdim,
Qəlb açan, ruh açan xəbər gətirdim.
Yaratmış hüsnünü təkcə o xaliq,
Gedir işlərin də hüsnünə layiq.
Sən ki, arx qazmağı hökm eyləmişdin,
Çapılsın tunc kimi daşlar demişdin.
Bu işi görməkdən açizdi ellər,
Heç kimdə yox idi belə bir hünər.
Doğrudan el üçün bu iş çətindi,

Qəzadan asana üz qoymuş indi.
Deyirlər, bir oğlan imdada yetmiş.
Orda təkbaşına qiyamət etmiş...”
Necə eşitmişdi vəsfini Banu,
O minval Şirinə söylədi onu.
Bunu da qeyd etdi axır sözündə:
“Üç ilin işini görmüş bir gündə”.
Dinləyib deyilən bütün sözləri,
Tamaşa meylinə düşdü o pəri.
Dedi: – “Doğru isə bu deyilənlər,
Gedib baxmaq ona, eyləməz zərər.
Qənimətdir onun seyrinə dalmaq,
Külünk çalmağından bir ləzzət almaq.
Bu tanrı qonağı, bu yeni mehman
Qəribə insandır, qəribə insan!
O bir qərib quşdur, duzağa düşmüş,
Bizim bu gülşənə, bu bağa düşmüş.
Zəhmətə yar olmuş öz marağıyla,
Düşmüşdür kələyə öz ayağıyla.
Bizim bu gulşənə, bu bağa düşmüş.
O bizə hər şeydən gərəkdir, gərək.
Bir arx ki, muzduna yüz xəznə verdim,
Artıq ümidimi sudan kəsirdim,
Şükür, haqq yetirdi məni kamıma,
Onuntək bir şikar düşdü damıma”.
Tezcə at gətirdib gülyanaq nigar,
Məhinbanu ilə yola çıxdılar.
Gedirdi yanınca dörd yüzəcən qız,
O yola çıxmazdı əsla bunlarsız.
Vardı yelgedişli bir kəhər atı,
Salardı heyrətə bu kainatı,
Tək onu minərdi gülüzlü pəri,
Yaxına qoymazdı at özgələri.
Özütək gülrəngli Şirinin atı,
“Gülgün” çağrılırdı onunçün adı.
Onun-yer üzündə bənzəri yoxdu,
Əsən dan yeliydi, süzən bir oxdu.

O yelqədəmlini tez gətirdilər,
Gülkün şəfəq üstə qalxdı bir qəmər.
Tərpətdi atını o sərvi-azad,
Onun arxasınca xeyli pərizad...
Uçub getmədəydi Ərmən atları,
Fərhadın yardığı dağlara sarı.
Şirinin yanınca gedərək Banu,
Sorurdu halını yollar uzunu,
Onların dalınca qohum-əqrəba,
Gəlirdi yollarda at çapa-çapa.
Yeyin sürdüyüçün atını dilbər,
Bürüdü şeh kimi gül üzünü tər.
Elə səyirdirdi həmin pərivəş,
Sanki göy atında çapırdı günəş.
Tökülmüşdü zülfü çiyninə çin-çin,
Dağçapan nərləri zəncirləməkçin:
Guya iki gecə verib baş-başa,
Hüsnün gündüzünə edir tamaşa,
Örtmək istər kimi bulud qəməri,
Tökülmüşdü üzə şəvə telləri.
Ayın ətrafında ulduz misalı
Qaş-daş bəzəmişdi o gül camalı.
Hər inci bənzəyir bir damla suya,
Günün çeşməsindən sıçramış guya.
Fitnəkar qaşları hilala bənzər,
Axacaq qanlardan verirlər xəbər.
Onlar qan tökməyə eyləmiş adət,
Biri o birinə eylər məsləhət:
Bu ittifaq üçün üz səhifəsi
Olmuşdur onların əhdnaməsi.
Gözlər xumarlanıb hərdən can alır,
Hərdən sərxoş-sərxoş xəyala dalır:
Yuxusuz qalmış tək baxırlar bihal,
İçdiyi meydən də dodaqları al.
Saçları andırır müşki-tatarı,
Cansıza can verir gül dodaqları.
Şəkər ləblərinin duzu deyil kəm,

Bu duza qənd çatmaz yığılsa aləm.
Heç kim görməmişdir belə duz-şəkər
Əritməz onları axan çeşmələr.
Üzündə qara xal oğru sayağı,
İstəmiş qənd çala günorta çağı:
Əl atmış şəkərə, lakin həmin dəm,
Yapışmış ayağı şirniyə möhkəm.
O çalmaq istərkən duzu, şəkəri,
Bəlkə də, tutmuşdu onlardan biri.
Ləbin çeşməsindən sular içərək,
Üzünün bağında açmış gül, çiçək.
Gülümsər bu bağın təzə gülləri
Dirilik suyunu içəndən bəri.
Burnu zərifliyin olmuş misalı,
Vardır yanında da bir incə xalı.
Oxşayır o xalı hind tacirinə,
Qatmış qəndlə balı biri-birinə.
Məxmər yanağında təzə qönçələr,
Çəmən güllərinə qısqanclıq verər.
Bəyaz əndamının gümüş rəngi var,
Sinəsi bir gümüş qönçəyə oxşar.
Bir qələm ucudur hər qara müjgan,
Hazırdır qətl üçün yazmağa fərman.
Ağ varaq eyləyib gül üzarını,
Qaraltmış aləmin ruzigarını,
Qəddi azadə bir cənnət süsəni,
Cəmalı behiştin gülü, gülşəni.
Yanan dodaqların alovu daşmış,
Atlas yanaqları odla tutaşmış.
Bu odun şərəri qalxınca göyə,
Gün örtmüş cismini yanmasın deyə,
Nəcib çənəsinin elə xətti var
Ki, onu anlayar tək əhli-hallar.
Günəşin yanında bir hilal kimi,
Buxağı görünür bir xəyal kimi.
Gör tanrı nə cahü-cəlal yaratmış,
Ağzını nöqtəyə misal yaratmış,

Qulağında olan parlaq incilər
Ay yanında qoşa ulduza bənzər.
Əndamilə üzü şümşadla güldür,
Onlara tay tutmaq onu müşküldür.
Vücudu ruhlara verir əzabı,
Olmuş incə beli dərdlərin sapı.
Onun vücudunu qucmaqmı olar?
Əl atsan uçacaq-qanadları var!
Həyat paylamada o gül dodaqlar,
Onlardan söz deyil, şirin bal yağar.
Qönçə dodağında çoxdur məlahət.
Əyandır üzündə min bir lətafət.
İpək libasından qüvvət alır can,
Əlvan rəngi edir yüz ağlı heyran.
Səf-səf kirpikləri min ox yağdırar,
Bahar yağışına bənzəyişi var,
Hər sözü bir yaman bəladır cana,
Hər teli bir şübhə salar imana.
At yürüdükcə dağa səs salır,
Özü gözəllikdən badələr alır.
Sanki bir günəşdir göy ata minmiş,
Ya ki, bir pəridir, div üstə sinmiş.
Belə bir qatilə kim olsa düçar,
Ölməkdən özgə bir çarəsimi var?!
Çevirsə üzünü hansı məkana,
Onun sakinləri başlar fəğana.
Görününcə gözə dağlar çapan nər,
Sürdü öz atını o yerə dilbər.
Çıxıb bir təpəyə hər yana baxdı,
Zamanla məkanı odlara yaxdı.
Gördü, qayaları yaran bir qoçaq
Sərt daşlar bağrında açmadadır arx.
Ona arx söyləmək deyildi şayan,
On dəyirman suyu axardı burdan.
Çalıb külüngünü qayalıqlara,
Hay-haray salmışdı uca dağlara.
Cavan sərvi ikən bir gülüstanın,

Görmüş əzabını min bir xəzanın.
Daşlar, zərbəsiylə gəlib vəhşətə.
Tezcə təslim olur güçə, qüvvətə.
Qaşında əyrilik, dodağında bənd,
Keçirmiş boynuna bəla min kəmənd.
Zəmanə əhlindən böyükdü boyda,
Şan-şərafət izi üzündə peyda.
Vüqarlı başında tac nişanı var,
Üzündə səltənət işığı parlar.
Batmış ayağına min zillət daşı,
Əzmişdir başını məşəqqət daşı.
Alnında zahirdir məhəbbət qəmi,
Çöhrəsində isə bir qüvvət qəmi.
Taqətsiz cismində hicrandan əsər,
Üzündə, dostluqdan, vəfadan xəbər.
Əlində tişə yox, var dəmir əsa,
Elbrus toz olar, bir kərə vursa.
Şirin görüb bunu, nitqi tutuldu.
Heyrətlər içində taqətsiz oldu.
Çöhrəsi qarşıda parlayan zaman,
Qəlbində eşq odu eylədi tüğyan.
Gah axdı göz yaşı məhəbbətindən,
Gah qəlbi sıxıldı can möhnətindən.
Hənuz açılmamış sirlər pərdəsi,
Yaxınlaşdı ona o gül qönçəsi.
Yaqut dodağından mirvarı saçdı,
Məna incisindən belə söz açdı
Ki: – "Ey nadir olan bütün cahanda,
Mislini görməmiş bu asiman da.
Əcəbdir səndəki bu qərib hallar,
Qəlbində zəhmətə böyük həvəs var.
Yoxdur heç bir kəsə səndə bənzəyiş,
Bəşər işi deyil gördüyün bu iş.
Bunu ki, başladın bizdən əmirsiz,
Doldu sevinc ilə bizim qəlbimiz.
Qalmışdıq bu işin əlində aciz,
Göstərdi qüdrətin bir yeni möcüz.

Yüz il təşəkkür də eyləsək sənə.
Bir günlük işinə bəs etməz yenə.
Biz ki, təşəkkürdən acizik, heyhat,
Tanrı özü versin sənə mükafat!”.
Gətirtdi bir tabaq mirvari, almas,
Dedi: – “Əfv eylə ki, muzdun oldu az”
Sonra tabaq üstdən pərdəni açdı,
Başına dürr, gövhər, mirvari saçdı.
Şirin bu igidin məftunu oldu,
Fərhad da Şirinin vurğunu oldu.
Tutuldu nəfəsi, əsdi vücudu,
Köksünü yandırdı qəlbinin odu.
Cismi titrətmədən olmadı aram,
Aramsızlıq onda tapmadı əncam.
Dedi: – “Bu canımı aldı nəfəsin,
Tükətdi ömrümü mübarək səsin.
Bilmirəm hansı bir ayüzlüsən sən,
Bu aşiq könlümü lap üzmüsən, sən.
Məni öz yurdumdan didərgin edən,
Bu qürbət ellərə salan sənmisən?
Tanıdım, səsindən olunca agah,
Ölərəm üzünü görməsəm, ey mah!”
Deyib bu sözləri bir ah qopardı,
Qızın niqabını yeli apardı.
Dünyalar bəzəyi o üz göründü,
Fərhad arzulayan bir qız göründü.
Güzgüdə görərək bir kərə onu,
Olmuşdu eşqinin sadiq məcnunu.
Görüb yar əksini qəşş etsə biri
Görərsə özünü qalarmı diri?
Məst olarsa biri badə sözündən,
İçəndə getməzmi tamam özündən?
Fərhad ki, yarını tanıdı, bildi,
Bir odlu ah çəkib yerə sərildi.
Şirin də görüncə bu macəranı,
Zənn etdi bir anda çıxaçaq canı.
Fərhadın ahı da artdı, çoxaldı,

Göydə ay üzünə ləkələr saldı.
O vəfa şamında qalmayınca nur,
Gəldi pərvanətək yanına Şapur.
Qaldırıb başılı ağladı zar-zar,
Dedi: – “Ey qisməti olan ahu-zar!
Sənə yetməzdimi vətən fərağı.
İndi də ömrünün söndü çırağı.
Vəfa yolunda son mənzilə yetdin.
Yarı bir görməklə, can qurban etdin.
Yüksək kəmalına, fəzlinə əfsus,
Həyanə, səbrinə, əqlinə əfsus.
Əfsus o idraka, əfsus o qəlbə,
Əfsus bu dağlarla girdiyin hərbə.
Heyif o sənətə, o məharətə,
Heyif qolundakı gücə, qüdrətə!
De, hanı səndəki quvvət, iqtidar,
Edərdi dünyanı düşmənlərə dar?
Ey mələk sifətli, sən indi yoxsan,
Neçin bəşər olmur yer ilə yeksan?
Hansı şah başında tac idin əvvəl?
Hansı tac üstündə olmuş idin ləl?
Hansı xalq tutmadı bu matəmini,
Hansı el duymadı sənin qəmini?
Saxlayır yasını de, hansı xaqan,
Hansı ölkə əhli qan ağlayır, qan?
Mən sənə dost oldum, sən mənə yoldaş
Gözüm əsla səni görməyəydi kaş!”
Şapur bu sözləri etdikcə təkrar,
Qızın gözlərindən axırdı yaşlar.
Şapur tapar-tapmaz bir azca təskin,
Çağırdı yanına Məhinlə Şirin,
Fərhad barəsində verdilər sual,
O nə bilirdisə, söylədi dərhal,
Şapur danışdıqca, Şirin ağladı,
Şirinə səs verdi Məhin ağladı.
Qoyaraq Fərhadı bir kəcavəyə
Qayıtdılar qəsrə qəm yeyə-yeyə.

Gətirdi Fərhadı şux nazəninlər,
Gülüzlü, ayüzlü qızlar, gəlinlər.
Taxtı düzəltdilər tez bir buçaqda,
Şahanə bir yataq döşəndi taxtda.
Onu bu yatağa uzatdılar, ah,
O isə heç nədən deyildi agah.
Saqi! Bir huş alan şərab ver mənə,
Unudum özümü, düzüm təranə.
Eşq içrə onsuz da uçubdur ağıl,
Məni bir cam ilə lap duyğusuz qıl!

## ŞİRİNİN FƏRHADI SEVMƏSİ

Bu söz beşiyini bəzəyən ustad,
Həmin əhvalatı belə edir yad:
Fərhad öz ağlını itirən zaman,
Gətirib taxt üstə qoydular haman.
Unutmuşdu bütün canı, cahanı,
Yox idi cismində həyat nişanı.
Yatdı bu hal ilə üç gecə-gündüz,
Gah nəfəs alsa da açmayırdı göz.
Şirin çox yanırdı ona ürəkdən,
Şapur da uşaqtək edirdi şiyvən.
Üçüncü gecəsi ellər yatırkən,
Fərhadın gözləri açıldı birdən.
Sataşdı gözünə o gen barigah,
Gördü yatır taxtda guya ki, bir şah.
Çaşıb bu əhvala, çox fikrə daldı,
Heyrətlər içində lap dona qaldı.
Birdən xatirinə gəldi ki, o ay,
Ay deyil, günəşə gözəllikdə tay,
Onun iş yerinə qılmışdı güzər,
Demişdi Fərhada şirin kəlmələr.
İndi anladı ki, bu ilk görüşdən
Sarsılıb özündən getmişdir həmən.
Həyadan cismini tər bürüyərək,

Saraydan uzaşdı bir ildırım tək.
Çünki anladı ki, o ayüzlü yar,
Ona dar günündə olmuş havadar.
Bir yandan qətlinə verib fərmanı.
Bir yandan dərdinə qılmış dərmanı,
Keçib xəcalətlə biyabanları.
Sevinə-sevinə qaçdı dağ sarı.
Üzündən, gözündən tər axa-axa,
Az sonra yetişdi qazdığı arxa.
Tapdı külünkünü və tişəsini.
Tez davam etdirdi öz peşəsini.
Dedi öz-özünə: – "Nə bəxtiyaram
Ki, canan göstərmiş mənə ehtiram.
Cismim gücdən düşüb bihal olunca,
Nazlı yar başımı eyləmiş uca.
Mən nə cavab verim belə hörmətə,
Necə şükr eyləyim bu mərhəmətə?
Görünür bu arxdır onun arzusu
Ki, tez gəlsin başa, axsın gümüş su.
Ey tez gecən ömür, mənə aman ver,
Bu müşkül iş üçün bir az zaman ver.
Yarın istəyini yetirim başa,
Coşqun ümidlərim çıxmasın boşa!"
Deyib bu sözləri, külüngü vurdu,
Daşları toz kimi göyə sovurdu.
Çapdı bir hünərlə dağları Fərhad,
Yerlər də, göylər də qopartdı fəryad.
Hara vururdusa o, külüngünü,
Səmayə qalxırdı o yerin ünü.
Ahilə külüngün toz dumanları,
Örtdü bulud kimi asimanları.
Toz deyil, ah deyil, bəla yığını,
Tutmuşdu ölkənin hər bir dağını.
Bu qalxan buluddan yağan yağışlar,
Tökürdü dağların başına daşlar.
Hər külüng zərbəsi sərt qayalarda
Güclü bir ildırım edirdi peyda.

Onun bu dağlara divan tutması,
Sıldırım daşları qırıb atması,
Bənzərdi bel ilə palçıq atmağa,
Və ya kürək ilə qar arıtmağa.
İşdən ayrılmırdı gecə və gündüz,
Əsla etməyirdi bir an tənəffüs.
Heyranı olaraq ondakı gücün,
Ellər tamaşaya gəlirdi hər gün.
Kim görsəydi onun dağ yarmağını,
Dişlərdi heyrətdən öz barmağını,
Gələnlər baxmaqdan əsla doymazdı,
Fərhadsa külüngü yerə qoymazdı.
Belə nəql eyləyir söz söyləyənlər:
Hər bir zərbəsilə dağ titrədən nər,
O gün ki, ayrılıb Məhin evindən,
Məhin yox, ayüzlü Şirin evindən,
Çıxıb gecəyarı gəldi o dağa,
Heç kimi salmadı səsə, sorağa.
Yuxulu gözləri açanda səhər,
Onu çox axtarıb fəğan etdilər.
Şapur axtarışa getdi təlaşlı,
Qaldı Şirin isə gözləri yaşlı.
Taparaq Fərhadı Şapur şad oldu,
Hicran tüstüsündə Şirin boğuldu.
Yetdi Şapur yenə öz sirdaşına,
Şirinsə qərq oldu axan yaşına.
Sancıldı bağrına hicran oxları,
Gördü əldən gedir səbri, qərarı,
Bəhanəylə dedi: – “Bu igid oğlan,
Tapmışdı özünə bizdə aşiyan,
Bu iş ki, dağlarda saz eyləmişdim,
Arxlarla su bizə axsın demişdim,
Mətləbim hədərə getməsin deyə,
Tanrı göndərmişdir onu hədiyyə,
O bir ustadır ki, heç düşməz ələ,
Bəxt onu salmışdır bu qərib elə.
Onsuz həmin arxa ümid azdır, az:

Yüz il cəhd eyləsək, yenə qazılmaz.
Bu saat at minib çapmaq gərəkdir,
Onu harda olsa, tapmaq gərəkdir".
Banu görüb onun həyəcanını,
Bildi, nə qayğıdır üzən canını.
Duydu ki, daşyonan öz nəfəsilə
Bu daşürəklini gətirmiş ələ.
Bildi ki, Şirinə etmək nəsihət,
Ancaq vaxt aparar, verməz mənfəət.
Bu işdə hikmətə əl atdı, Banu,
Tapmağa cəhd etdi həmin Məcnunu.
Xəbər gətirdilər ki, Fərhad yenə
Başlamış əvvəlki iş ahənginə;
Eşitcək bu sözü o nazlı ceyran,
Oldu al ləbləri gül kimi xəndan.
Məhzun könlü üçün düşündü çarə,
İstədi Fərhadı görə dübarə.
Gəldi bu qərara: "Bir gizli yerdən
Onu, görünmədən, seyr edərəm mən.
O görərsə məni, olub biqərar,
Gizli sirrimizi eylər aşikar".
Məhinbanu isə etmişdi peşə.
Şirinin yanına gedib həmişə,
Sorardı halını, bilərdi gah-gah,
Gizli qəmlərindən olardı agah.
Öyrənib halını bildi ki, Şirin
Olmuşdur əsiri bir təmiz eşqin.
Məhəbbət könlünə atmışdır kəmənd,
Sarmış yumaq kimi cismini bənd-bənd.
O da öz-özünə deyərdi: "Fərhad,
Olaydı, kaş mənə bir doğma övlad".
Şirinə dəyəli ayrılıq oxu,
Sübhətək gözünə girməzdi yuxu.
Nə dərd söyləməyə həmdərdi vardı,
Nə yemək yeyərdi, nə də yatardı.
Qəlbini açmağa çoxdusa həmdərd,
Buna yol verməzdi həya və ismət.

Desəydi: – “Baş çəkim o igid nərə”.
Uğrardı xəyalı tərəddüdlərə.
Desəydi: – “getməyim”, – gülüzlü pəri,
Artardı könlünün şikayətləri.
Ayrılıq odunda yanırdı canı,
Yox idi dərdinin dava-dərmanı.
Saqi! Xoş ətirli bir mey tök görək,
Könül atəşlidir, söndürmək gərək.
Belə bir şərabə həsrətim çoxdur,
Dərdimin özgə bir dərmanı yoxdur...

## FƏRHADIN ARXI QAZIB QURTARMASI

İncə süslər verən bu həngaməyə,
Belə qələm çəkmiş həmin naməyə:
Fərhad külüngünü aldığı gündən,
Dağlar sarsılırdı guya kökündən.
Seyrə gəlsin deyə o şux göyərçin,
Arzulardı işi tez tamam etsin.
O zaman yenidən görüb üzünü,
Eşidər can alan dadlı sözünü.
O zaman cismini tərk etsə də can,
Yenə bir diləyi qalmaz cahandan.
Əgər gəlməsə də buraya dildar,
Fərhadın hörməti yanında artar.
Bu arxı çəkməyi yar diləmişdi,
Bu iş ən əzablı, ən çətin işdi.
O, bu çətin işi qurtaran zaman,
Eşidəcək yəqin sevimli canan:
Biləcək yerinə yetib murazı,
Fərhaddan nə qədər qalacaq razı
Belə ümidlərlə səhər və axşam
Daşları çapmaqdan olmazdı aram.
Bir mühəndis kimi əvvəlcə arxın,
Yerdə xətlərini çəkərdi aydın:
Dərinliyi iki, eni üç qulac –

Olacaq bir arxa vardı ehtiyac,
Həmin ölçü ilə o dağ çapan nər,
Çəkərdi hər xətti min qulac qədər.
Elə ki, bu rəqəm qazıldı bitdi,
Yenidən o qədər çəkirdi xətti.
Bu min qulac yerdə olan killi daş,
Külüng zərbəsindən olurdu xaşxaş.
İki yüz əvvəlki mahir sənətkar,
Bu sınan daşları daşıyırdılar.
Təmizləyən zaman arxı o dəstə,
Fərhad dincəlirdi bir qaya üstə.
Sonra tişəsinə yenə atıb əl,
Arxın daşlarına verərdi seyğəl.
Ona güzgü kimi cila verərdi,
Kim baxsa əksini orda görərdi.
Sapa düzür kimi inci, mirvari,
Düzürdü yan-yana bütün daşları.
Bəzən külüngünü çalarkən dağa,
Təsadüf edirdi gilə, torpağa.
Su batmasın deyə o yerdə Fərhad,
Cəhdini, səyini edərdi min qat.
Əsrinin o böyük usta memarı,
Yorulmaq bilmədən yonub daşları,
Yığırdı dağ kimi bir an içində:
Hamı bir ölçüdə, eyni biçimdə.
Sonra bu daşları düzüb yan-yana,
Salırdı qazdığı arxı sahmana.
Elə bir səliqə vardı əlində,
Misli tapılmazdı Ərmən-zəmində.
Elə rəbt etmişdi daşları, baxan
Arxı bir tökmə daş eylərdi güman.
Bəzən o dik dağın qayalıqları,
Gücdən salmaq üçün bizim memarı,
Onun külüngünə gərərdi sinə,
Daş köksü dözməzdi fəqət zərbinə.
Od çıxıb Fərhadın hər zərbəsindən,
Dağların bağrına salardı şivən.

Qüvvət kəmərini bağlayıb belə,
Kəmərli dağlara edərdi həmlə,
Enəndə külüngü daşa dalbadal,
Hər dəfə bir qüllə edərdi pamal.
Zərbəsi hansı bir dağa enərdi,
Zirvəsi çöllərə səpələnərdi.
Külüngünü dadan hər daş, hər qaya
Sıçrayıb səmada dəyərdi aya.
Ay da vahiməyə düşərək bundan,
Edərdi haləni özünə qalxan.
Baxıb bu daşlardan qalxan tufana,
Qaçardı ulduzlar hərə bir yana.
Bu parça daşlar ki, göyə uçardı,
Səmanın bağrında yara açardı.
Fələk bu zərbədən qaçsa da birbaş,
Yerə yağdırmağa toplayardı daş.
O vaxtdan göylərdə qalan o daşlar,
Hələ də başlara yağmağa başlar.
Fərhad istəsəydi yerin tozundan,
Göylərdə min saray tikərdi hər an.
Sadəcə arx açan mahir sənətkar,
Yüz Babil sehrini edirdi təkrar.
Əlində bir külünk gecə və gündüz,
Dağları çöl kimi edərdi dümdüz,
Müvazi xətləri çəkərdi əvvəl,
Sonra arxı qazıb verərdi seyğəl.
Bu halla zəhmətə o sinə gərdi,
Bir gün arx xəttini qəsrə yetirdi.
Bir mərmər hovuzla bitirdi onu,
Altmış qulac eni, altmış uzunu.
Bu hovuz bənzərdi kiçik ummana,
Lakin can verərdi suyu insana.
Vardı qəsr önündə bir heybətli daş,
Hər yanı göylərə çəkmədəydi baş.
O daşın kürəvi görkəmi vardı.
Dairəsi beş yüz qulac olardı.
O çevik daşyonan başlayıb işə,

Bu qranit daşa çaldı min tişə.
Onu bir möhtəşəm qəsrə çevirmək,
Qəsdilə hey yonub, çəkdi çox əmək.
Bu işə səy edib bir xeyli zaman,
Qəşəngcə bir saray yaratdı ondan.
Baxırdı hovuza uca tağları,
Durmuşdu günbəzi göydən yuxarı.
Günbəzlər yaraşıq verib eyvana,
Dəhlizlər saçırdı işıq hər yana,
Yenə üç tərəfə üç eyvan vardı,
Tağları Zühəli utandırardı.
Hər otaq zövq ilə səfa qucağı,
Bitib tükənməzdi sütunla tağı.
Dünyanın binəti bu şux imarət,
Bir daş parçasından oldu ibarət.
Eyvanı başa-baş cızıb o memar
Yaratdı divarda gözəl naxışlar.
Çəkdi şanlı taxtı, gözəl sarayı,
Taxt üstə ayləşən misilsiz ayı.
Pərilər baş əyir önündə səf-səf,
Ona xidmət edir yüz qaməti sərv.
Çəkmiş olsa da o hamını cansız,
Şirin başdan-başa can idi yalnız,
Nəqş etdi divara yüz belə timsal,
Özünü, o gözəl eşqində bihal.
Hansı bir lövhədə vardısa o qız,
Öz şəkli baxırdı ona təvansız,
Bu işlərdə yetib Şapur imdada,
Qələm işlətməyi salardı yada.
Şapur qələmilə çəkilən lövhə
Fərhad tişəsilə alardı cilvə.
O, Şirin rəsminə çalsaydı qələm,
Çəkərdi üzünü bu da həmin dəm.
Qəsvir eylədikcə o parlaq ayı,
Ürəkdən çəkərdi Fərhad ah-vayı.
Yaraşıq verərək hey dönə-dönə,
Bənzətdi sarayı Çin məbədinə.

Bitincə saraya gərəkli zinət,
Hovuzun işinə verdi nəhayət.
Bundan da arxayın, əmin olaraq,
Onun dörd yanından çəkdi birər arx.
Onları salmışdı elə bir tövrə
Ki, saray başına vuraraq dövrə,
Tökülər hovuza onların suyu,
Sonra da axardı şəhərə doğru.
Dağlardan uzanıb gələn bu arxın,
Tuli min ağaca olardı yaxın,
Su axıb gedərkən üzü aşağı,
Suvara bilərdi xeyli torpağı.
Elə ki, bu nəhəng arx başa gəldi,
Fərhad su açmağa yola düzəldi.
Bir anda bürüdü kəndi, şəhəri.
Elə can verəcək suyun xəbəri,
Hamı dağa sarı yollandı haman:
İynə salsan yerə düşməzdi, inan.
O qədər camaat gəlmişdi seyrə,
Adam gətirmişdi sanki dağ-dərə.
Fərhad arx boyunca teylənib uçur,
Onu izləyirdi vəfalı Şapur.
Gözündən axıdıb sel kimi yaşlar,
Gedirdi misilsiz böyük sənətkar.
Xəyalında onun ayüzlü dildar,
Viranə könlünə vururdu odlar.
Ayrılıq dərdiylə gözündəki su,
Axıb getmədəydi arxlara doğru.
Bu qəm usandırmış onu özündən,
Axırdı yazıqlıq yaşı gözündən.
Deyirdi: – "Gəlmişdir obalar, ellər,
Nə üçün yubandı o üzü qəmər?
Əgər gəlsə o yar, qalmaz təvanım:
Fəqət gəlməsə də, üzülər canım..."
Bu qayğı salmışdı onu bir hala:
Baxanlar olurda vaqif əhvala.
Məhinbanu gəlib yetişdi durdu:

Onun arxasında böyük bir ordu.
Vardı bir təntənə, bir cahü-cəlal
Ki, bütün dilləri eyləmişdi lal.
Fərhad hər addımı atanda, Banu,
Qaş-daşla bəzərdi onun yolunu.
Başına saçılan dürrü, qaş-daşı,
Fərhad zənn edirdi hicran yağışı.
Göy üzünü tutmuş ulduzlar qədər,
Tutmuşdu hər yanı gənc süvarilər.
Onlar at minməkdə edib rəqabət,
Hər kəs göstərirdi böyük məharət.
Atlar şəklədikcə qulaqlarını,
Fərhad öpmədəydi ayaqlarını.
Görənlər halını-ağladı bir-bir.
Etmişdi hamıya eşq odu təsir.
Dalınca dağ kimi böyuk bir axın,
Yüyürüb yanınca qazılan arxın,
Dəstələr önündə getdikcə getdi.
Bu cahü-cəlalla kəhrizə yetdi.
O qəsdən uzadıb bu keyfiyyəti,
Dedi: – "Bəlkə, gələr cahan afəti!"
Gözündən su axdı, canı od aldı,
Yollara baxmaqdan gözü qaraldı.
Saqi! Şərabı tök, dağıt xumarı,
Bax, öldürür məni yar intizarı;
Hicran xumarlığı çətin bəladır,
Ya vüsal, ya şərab ona dəvadır.

## FƏRHADIN, ŞİRİNİ ATI İLƏ BİRLİKDƏ ÖZ TİKDİYİ QƏSRƏ GƏTİRMƏSİ

Kəlam dağlarında qayalar ovan,
Bu şirin sözləri eyləyir bəyan:
Fərhad ki, ilk suyu açmağa getdi,
Bu ruhaçan xəbər Şirinə yetdi
Ki: – "Qazmış o arxı təmiz və sadə,

Neçə işlər görüb ondan ziyadə.
Bir saray yaratmış, səmayə bənzər,
Günbəzinin ucu ayla bərabər.
Vurmuş divarına gözəl naxışlar,
Hər gözə, könülə səfa bağışlar.
Gördüyü işləri bacarmaz insan,
Sənətinə baxan qalar lap heyran”.
Fərhadın könlündə dağ kimi ələm,
Gözdən sel axıtdı qəlbindəki qəm.
Su açmaq qəsdilə yola düzəldi,
Ahının atəşi tüğyana gəldi.
Şirin də bu odda yanaraq nəhan,
Tez-tez xəbər tutdu öz dildarından.
Elə ki, bugünkü sözü eşitdi,
Huşu başdan getdi, qərarı bitdi.
Tez əmr eylədi ki: “Gətirin bir at!”
Gülgün yəhərləndi o deyən saat.
Yel kimi uçanda bu at çöllərə,
Bənzərdi bir girdə parlaq gövhərə.
Fələyin altında gəzən günəştək,
O gül yarpağını apardı külək.
Banuya bir qasid göndərdi haman:
“Çıxmışam seyrana mən də saraydan,
Bir az su bürcünü etməyə məskən,
Göydə günəş kimi tələsirəm mən.
O dağ çapan igid, o çevik qollu,
Arxa, mən gəlməmiş, buraxmasın su”.
Elə ki, bu xəbər Banuya yetdi,
Şad olub, Fərhaddan təvəqqə etdi
Ki: – “Ey uğrumuzda çəkən zəlalət,
Biz sənin yanında olduq xəcalət.
Bu qədər yol gəldin, bir az nəfəs dər;
Dincəl, gözəl Şirin gələnə qədər,
O gəlir qəlbləri rövşən etməyə.
Sona tək sularda məskən etməyə”.
Sonra nökərlərə üz tutub Məhin
Dedi: – “Dayanmayın, bir taxt düzəldin!”

Taxt hazır olunca həmin hökmdar,
Süslü taxt üstündə tutaraq qərar,
Əmr etdi döşənsin yerə ipək fərş,
Otursun üstündə Fərhad bəlakəş.
Daşyonan baş əyib öpdü torpağı,
Yaxdı ürəkləri qəlbinin dağı.
Oturdu Məhinlə o da üz-üzə,
Qəlbi günəş qadın başlayıb sözə,
Min təsəlli verib eylədi söhbət,
Göstərdi Fərhada ehtiram, hörmət,
O şəfqətli qadın hər nə deyirdi,
Razılıq edərək bu, baş əyirdi.
O dağ qürurilə ötürdü tez-tez,
Bu dinməz dururdu qul kimi aciz.
Arabir ədəblə cavab verirdi.
Sanki hər kəlməsi bir cəvahirdi.
Ağıl nişanəsi çoxdu sözündə,
Fərasət zahirdi gözəl üzündə.
Onlar bu qaydayla tutmuşkən qərar,
Uzaqdan toz-duman oldu aşikar;
Tutdu bu toz-duman göyün üzünü,
Tutdu günəşin də nurlu gözünü.
Dedilər: “Bu toz ki, qalxdı səmaya,
Sürməylə tutiyə qarışdı guya.
Deyəsən, ellərin ceyranı gəlir,
Gözəllik taxtının sultanı gəlir.
Qərq edib günəşi toza-dumana,
İldırım atını sürür bu yana”.
Xalqı dağıtdılar çeşmədən kənar.
Banuyla Fərhaddan uzaqlaşdılar.
Yenə də aşiqi titrətmə tutdu,
Qanını, çəkdiyi ahlar qurutdu.
Şirinin başına andlar verərək,
Məhin verdi ona çox ürək-dirək,
Dedi ki: – “Möhkəm tut, oğul, özünü,
Qəlbinə qüvvət ver, tez sil gözünü.
Dolaşsa bu dəmdə ağıl tellərin,

Puç olar illərcə tökülən tərin.
Etsə divanəlik sənə sirayət,
Gül üzlün ellərdə olar xəcalət;
Çalış ki, ağlını etməyəsən qeyb,
Camaat tapmasın səndə heç bir eyib.
Pərişan eyləmə özünü, məni,
Biz hələ bir yana, o nazəndəni".
Belə nəsihətlər çox etdi Banu,
Möhkəm dayanmağa sövq etdi onu.
Özünü toplayıb dayandı Fərhad,
Yetişdi yaxına həmin pərizad.
Hüsnünün atəşi yaxdı aləmi,
Xalqı saldı oda səməndər kimi.
Sanki saç deyildi alnının üstü,
Yanağı odundan qalxırdı tüstü.
Bu odun alovu tutmuş cahanı,
Tüstüsü qaraltmış yüz xanımanı.
Çox iti gəlmişdi o sərv boylu,
Odlu yanaqlardan axmaqdaydı su.
Bu suda əyandı min bir lətafət,
Ondan könüllərə yetərdi afət.
Qara xal gülüzdə tutub qərarı,
Su basmış bir bağa dönmüş üzarı.
Bu su hər cansıza həyat bəxş edər,
Nə Xızr tapmış onu, nə də İskəndər.
Şəbnəm tək süs verib hüsnün gülünə,
Axırdı zülfünün tər sünbülünə.
Saçın zülmətində yüz min İskəndər,
Tüstüdə səməndər quşuna bənzər.
At üstə qürurla əyləşən o qız
Bəlalar saçırdı cahana yalnız.
Üzündə cunadan vardı rübəndi, –
Sanki ay qabağı buluddu, çəndi
Tapdadıb zamanı atın nalilə,
Gəldi çatdı Şirin bu minval ilə.
Məhin tez Fərhada dedi ki: "Cəld dur,
Başla öz işinə bu gün yekun vur.

O afət buraya edəndə güzər,
Atından düşməmiş sən salma nəzər,
Doğrudur, bu hökmüm olduqca sərtdir,
Neyləyək, indilik bu məsləhətdir”.
Fərhad baş əyərək düşdü torpağa,
Qaldırdı tez onu Şapur ayağa.
Arxa su açmağa yollandı Fərhad,
Gəlib çatdı ora o şux pərizad.
Tərpədib heyrətlə başını hərdən,
Keçirtdi bu gözəl arxı nəzərdən.
Şadlıqdan gülərək həmin nazənin,
Mat qalıb deyirdi: “Əhsən, afərin!”.
Təhsindən özgə bir söz yoxdu onda,
Fərhadsa külünglə durub solunda.
Suyun axarını edərək təyin,
Çalırdı külüngü o yeyin-yeyin.
Əvvəlki yolunu bağladı daşla,
Düşdü təzə yola su iğtişaşla.
Yoxdu bir maneə bu axar suya,
Dəyirman novuyla axırdı guya.
Sanki xalq içinə qasırğa düşdü,
Bir tufan üz verdi, ya qovğa düşdü,
Arxın hər yanında şənlik quruldu,
Neylər dilə gəldi, çəpik vuruldu.
Gözəl müğənnilər düşüb həvəsə,
Suyun nəğməsiylə verdi səs-səsə.
Qəsrə sudan qabaq çatmaqçın Məhin,
Şirinlə atları sürdülər yeyin.
Lakin su almışdı quşlardan qanad,
Çatmazdı dalınca yel gedişli at,
Başladı qaçmağa bütün o yığnaq,
Yıxıldı üst-üstə hey qalaq-qalaq.
Qaçanlar içində vardı Fərhad da,
Qalmışdı gözləri o pərizadda.
Getmişdi Şirinin atı on ağac,
Yolu gah düz idi, gah dağ, gah yamac.
Yenidən atını o səyirdərək,

Yeddi, səkkiz ağac getdi külək tək.
Yükü gümüş olan yelqədəm atlar,
Hər addım başında dayanıb durar.
Elə də Şirinin atı yoruldu,
Dayanıb bir yerdə yeriməz oldu.
Bildi ki, tərpənsə yorğun ayağı,
Dolaşıb yıxacaq o ayqabağı,
Fərhad tez baxaraq atlı dilbərə,
Gördü gül düşəcək küləkdən yerə.
Öpərək torpağı səcdələr etdi,
Yay kimi əyildi o uca qəddi.
Götürdü çiyninə Şirinlə atı,
Əldən buraxmayıb həm ehtiyatı,
Bərk-bərk tutdu atın bacaqlarından,
O qoydu aləmi gücünə heyran.
Sürətlə dırmandı uca dağlara,
Bir tozanaq qopdu, sürmədən qara.
Məhinbanu salıb ona nəzarə,
Bu eşqin dərdinə tapmadı çarə.
Fərhad iki, ya üç ağac yol getdi,
Gəlib o hovuzlu saraya yetdi.
Atıb addımını eyvana sarı,
Düşürdü həm atı, həm şahsüvarı.
Eyvanda sakitcə durub pərizad,
Əyilib hovuza baxdı qəlbi şad.
Fərhadsa qarşıda öpərək yeri,
Nəmli gözləriylə qayıtdı geri.
Yaz yağışı kimi axıdaraq yaş,
Qaçdı Məcnun kimi dağlara birbaş.
Bu zaman çağladı sel kimi gur su,
Baş alıb yetişdi saraya doğru,
O mərmər hovuza töküldü, doldu,
Sonra yan arxlara tərəf buruldu.
Sarayın başında vuraraq dövrə,
Axdı can verməyə yanıq çöllərə.
O arxa ad verdi xalq "Nəhrül-həyat",
"Bəhrül-nicat" dedi hovuza elat.

Saqi! Şərabı et dəniz misalı,
Sal o mey bəhrinə qədəh sandalı,
Nəhr tək mey içmək mənə həyatdır,
Dənizlər qurutmaq ömrə nicatdır.

## MƏHİNBANUNUN FƏRHADI QONAQ ÇAĞIRMASI

Bu mərmər hovuza axanda sular,
Onda bu dalğalar oldu aşikar:
O mərmərlər içrə dalğalanan su,
Xalqa xeyli zaman seyrəngah oldu.
Sevindi Məhinlə qüssəli Şirin,
Sona çatmasına bu müşgül işin.
Onların əmrilə şux saray o gün,
İpək xalçalarla döşəndi bütün.
Yenə nəşə, fərəh həddini aşdı,
Sevinclər sel kimi qaynadı, daşdı.
Lakin ahlar çəkən gül yanaqlı qız,
Ay işığı kimi solğundu yalnız,
Yarını düşünüb intizar ilə,
Keçirdi ruzgarı ahu-zar ilə,
O ayın dərdinə sirdaş Məhin də
Qalmışdı çıxılmaz qəmlər içində.
O şəffaf bülluru möhkəm mərmərə
Qovuşdurmaq üçün tapmırdı çarə.
Gizlində gəzdikcə aşiq sərsəri,
Taqətdən düşürdü o gözəl pəri.
Banu bir gün dedi: – "Ey cismimdə can!
Hüsnünlə şad olur könlüm hər zaman.
Bu şeyda igid ki, çox çəkdi zəhmət,
Yüz xəzinə versək, etməz kifayət.
O ki, rədd eyləyir muzdu inadla,
O ki, maraqlanmır cəvahiratla,
Biz də xoş düşməzmi, edib mürüvvət,
Şirin dillə verək könlünə qüvvət.
Ona təklif edib böyük qonaqlıq,

Ehtiram göstərək şahlara layıq;
Göndərək dalınca neçə elçi biz,
Düzəldək sarayda şahanə məclis.
Ona yer göstərib taxt üzərində,
Ehtiram eyləyək yerli-yerində;
Əgər bu üsulla etsək onu ram,
Gəlməzmi hasilə gözlənən məram?
Təsir etməsə də bu hörmət ona,
Biz ki, borcumuzu yetirrik ona.
Onlar etməsə də könlünü razı,
Bari qurtarar ki, el etirazı".
Bu sözdən laləüz gül tək açıldı,
Banu təklifindən çox razı qaldı.
Verdi fərmanını Banu həmin dəm,
Dedi: – "Nə lazımsa tez etməli cəm!":
Saray adətini bilirdi onlar,
Tezcə hazırlandı lazım olanlar.
Banu əmr etdi ki: – "Günəş doğanda,
Şərab qədəhləri gülsün eyvanda,
Qoy mərmərli hovuz çatsın nəzərə,
Suyu bu məqsədlə çəkdik o yerə.
Qara saçlarını axşam açanda,
Göyün nurlu şamı işıq saçanda,
Tutaq bir qədər də sarayda aram,
Qoy aram olmasın, lakin əldə cam".
Ayırdı bir neçə arif cavanı,
Gedib dolansınlar dağı, səhranı,
Taparaq binəva Fərhadı haman,
Gətirsinlər o gün məclisə mehman.
Həmin gün axtarıb tapdılar onu,
Gördülər bürümüş ahu-zar onu,
Qəm-qüssə odunun qığılçımları
Altında tükənmiş səbri, qərarı.
Onun bu halına qəmgin oldular,
Bütün əhvalatı etdilər izhar.
Fərhad torpağacan əyib başını,
Gözündən sel kimi töküb yaşını,

Dedi: – “Ey sözləri ümid bu cana,
Əbədi həyatdır ümid insana!
Başımın tacıdır ayaq tozunuz,
Hər əmrə hazıram, sözsüz, sorğusuz”.
Xoşlanıb bu sözdən oldular rəvan,
Nəvaziş göstərdi ona hər cavan.
O yerdən saraya çatana qədər
Fərhad bir şah idi, onlar da əsgər.
Sarayda göstərib Məhin ehtiram,
Dedi: – “Taxt üstündə siz tutun aram!”.
Nə hökm edirdisə hörmətli Banu,
Gətirirdi başa qulamlar onu.
Bəlalı Şapura edincə eyham,
Taxtın kənarında tez tutdu məqam.
Məhin əyləşdirib taxta Fərhadı,
Sonra gülə-gülə sözə başladı.
O qədər danışdı o xoşfəsahət,
Qonağın üzrünə qalmadı hacət.
Məhin qonağından etdikcə sual,
Fərhad cavabını verirdi dərhal,
Bu sorğu-suallar sona çatanda,
Xörəklər daşındı ora bir anda.
Yedilər, içdilər məclis doyunca,
Saqi mey payladı süfrə boyunca.
Bu bir ziyafətdi mislini görcək,
Hələ görməmişdir kəcrəftar fələk.
Ruhlar al şərabdan qüvvət alırdı,
Camların yaquta bənzəri vardı.
Kövsər suyu kimi gül rəngli badə,
Alov rəngli ləli salırdı yadə.
Üzüm şirəsindən çəkilən bu ləl,
Yaqut qədəhlərdə gəzirdi əl-əl.
O bir tilsimdi ki, salaraq tora,
Əfsunlar oxurdu ağla, şüura.
İçdi piyaləni ilk öncə Banu,
Sonra Fərhad, Şapur nuş etdi onu.
Bu məclis deyildi, cənnət bağıydı,

Bu badə deyildi, can bulağıydı.
Şirin söhbətlərlə, şirin gülüşlə,
Saqilər məclisi almışdı ələ.
Müğənnilər gözəl nəğmə başladı.
Sonra oğlanla qız durub oynadı.
Orda hazır idi on nazlı dilbər,
Əndamı qızılgül, qəddi sənubər.
Meylini onlara salmışdı Şirin,
Onlardı zinəti hərəmxananın.
Olmuşdu hər biri bir işdə mahir,
Hər biri bir hünər qılırdı zahir.
Şeir dənizində üzürdü biri,
Musiqi təhsili görmüş digəri.
Birisi məntiqdə tapmışdı şöhrət,
Birinin sevgili elmiydi heyət.
Birinin şivəsi elmi-həqayiq,
Bəlağət elminə o biri layiq.
Biri tarixlərdən söhbət açandır,
Biri hikmət içrə fərdi-cahandır.
Biri hesab elmi üzrə alıb ad.
Müəmma seçməkdə o biri ustad.
Onlar bir-birindən qalmazdı dala,
Alimlər heyrandı bu on kamala.
Dilaram, Dilara, Dilasa kimi,
Güləndam, Səmənbu, Səmənsa kimi
Pəriçöhr, Pərizad, Pərivəş qədər
Gözəldi, doğrudan, həm Pəripeykər.
Dolu piyalələr gəzdikcə əl-əl,
Qızışdı məclisdə başlar əlbəəl.
Banu ziyafətdə göstərib kamal,
Bu alim qızlara verirdi sual.
Kamallı Banunun hər sualına
Min cavab verirdi on gözəl sona,
Bilik bazarına bir qovğa düşdü.
Bu haldan Ütarid sorağa düşdü.
Hər gözəl özünün elminə dair,
Hədsiz möcüzələr edirdi zahir,

Onları diqqətlə dinlədi Fərhad,
Bildiyi fənnləri yenə etdi yad.
O, qüvvət almışdı mey kasasından,
Onun hey boşalıb, hey dolmasından.
Təmiz təbiəti, yüksək şüuru
Etmişdi Fərhadı zaman məşhuru.
Döndərib üzünü hər kəsə bir-bir,
Suallar yağdırdı elminə dair.
Kimsə baş açmırdı heç bir sualdan,
Onlar görməmişdi belə imtahan.
Görüncə onları cavabda aciz,
Özü şərh edirdi hər sualı tez.
Çəkməzdi ağlını şüur meyarı,
Köksü xəzinəydi, sözü mirvarı.
İncə kəlamını eşidib məclis,
Qalmışdı heyrətlər içində bihiss.
Məhin də dinləyib onun sözünü,
Mat qalıb, itirdi bir an özünü;
İlahi sirlər duydu sözündə,
Şahanə bir işıq sezdi üzündə,
Şərabdan ay üzü lalə kimiydi,
Üzündə qara xətt halə kimiydi.
Banu elm əhliydi, fənpərvər idi,
Alimlər içində bir sərvər idi,
Tezcə anladı ki, sadə daşyonan
İmtina etmişdir gövhərli taçdan.
Onun böyüklüyü qarşısında bu,
Kiçik olduğunu anladı, duydu.
Birisi şəbnəmdir, o biri gövhər,
Gövhər öz zatını tezcə bildirər.
Fərhad taxtdan enib etdi təvazö,
Banu əyləşməyi qıldı təvəqqe,
O, üzr istəyərək dedi ki: "Qəlbən,
Hər nə əmr eyləsən, minnətdaram mən.
Kirpiyimlə bəla dağını yarmaq,
Yarıb dırnağımla yerdən qopartmaq
Əmr olunsa mənə, qorxmaram, inan,

Bu təklif yüz dəfə çətindir ondan.
Gədayə səltənət taxtı versələr,
Ona quru torpaq daha xoş gələr".
Banu eşidərək bu etirazı,
Cəhd etdi salmağa qonağı razı.
Dedi: – "Taxt üstdə ki, oturmadın sən,
Gərək torpaq üstə qərar tutam mən".
Bəzəkli taxtını yığdırıb Banu,
Xalçalarla əvəz etdirdi onu.
Döşənib bitəndə şənlik büsatı.
Özüylə oturtdu Banu Fərhadı.
Yenə badə camı əl-əl dolaşdı,
Fərhad söhbət açıb, mirvarı saçdı.
Sözündən nə qədər qaş-daşı axdı,
Gözündən yüz onca göz yaşı axdı.
Bürüyüb Şirini ayrılıq qəmi,
Qəmiylə sarsıdıb çərxi-aləmi,
Durmuşdu pərdənin arxasında tək,
Olub keçənlərə göz yetirərək.
Onun da incilər axıb gözündən,
Bəzən az qalırdı gedə özündən.
O qız, pəri kimi gözlərdən nəhan,
Qonaq məclisini süzürdü heyran.
Belə sərt almazın yumşalmasına,
Məhin də baxaraq qalmışdı dona.
Gah bunun göz yaşı başından aşır,
Gah onun ahından aləm tutaşır.
Banu öz-özünə dedi: – "Tapılmaz
Bu dərdli aşiqə bərabər almaz.
İndi bu sirr mənə oldu aşikar:
Sənətdən yaratmış bunu sənətkar.
Əfsus, dərd içində bitmiş təvanı,
Hazırdır cismini tərk edə canı.
Bu insan sifətli mələkdir, inan,
Mələklik duyulur hər bir halından.
Necə ki, ruhuna hakimdir bu hal,
Uzaqdır fikrindən hər çirkin xəyal.

Bu gün bir bəd əməl tutacaq deyə,
Könül yol verməyir qara şübhəyə.
Gözündə, könlündə fitnə-fəsad yox,
Ondan çəkinməyə, məncə, bir ad yox.
Əsir ruhu yanır eşq atəşindən,
Artır, alovlanır, söndürsəm də mən.
Bu dözülməz dərdlə çıxarsa canı,
Yəqin ki, boynumda qalacaq qanı".
Dedi: – "O gözəllər şahına deyin,
Gözəllik göyləri mahına deyin,
Bir az qonaqçıllıq rəsmini duysun,
Gözləri hüsnünə heyrətdə qoysun.
Ruhə mey paylasın gül dodağından,
Etsin cəmalına hər kəsi mehman".
Yasəmən sinəli eşitcək bunu,
Bir fərəh ruzgarı gəzdi ruhunu.
Xuraman-xuraman oldu rəvanə,
Qısqandı nazına çərxi-zəmanə.
Üzündə məhəbbət odundan əsər,
Gözündə oynayır atəşin sellər.
Müjgan oxlarını suvarsın deyə,
Hicrandan göz yaşı almış hədiyyə.
Yarın külüngü tək sivriydi oxlar,
O, dağlar çapırsa, bu, canlar oxlar.
Sinəsindən qopan nalə ruzgarı,
Açır zülfündəki qıvırcıqları.
Hər teli yüz iyman eyləyərək bənd,
Kafir kəməndiylə etmiş kəmərbənd.
Odlu yanağına gözdən axan su
Qəmlərə qərq edib eli, ulusu.
Cəmalı dövranı etmədə heyran,
Dolanırdı onun başına dövran,
Saçır yanaqları bu cahana nur,
Qaşlarının tağı asimana nur.
Canlara od salıb yaqut dodağı,
Dünyaya al şəfəq saçıb yanağı.
Buluddan süzülüb çıxan günəştək,

Pərdə arxasından çıxdı bu mələk.
Zərrələr günəşlə dirçələn kimi,
Canlandı qonaqlar o gələn kimi.
Fərhadı ansızın bir alov sardı,
Ruhu bədənində yanğın qopardı.
Görüncə Şirini çəkdi bir fəğan,
Ahından titrədi yeddi asiman.
Ağlı az qaldı ki, başından çıxa,
Qəşş edib yıxıla yenə torpağa.
Lakin imdadına yetişdi saf mey,
Ağlını əmrinə eylədi tabe.
Yer verdi Şirinə Banu yanbayan,
Əyləşdi orada o nazlı canan.
Günəş ay yanında tutunca məskən,
Fərhad da əyləşdi yaxın bir yerdən,
Hər kəs öz yerində olunca aram,
Əlbəəl tutdular ayağçılar cam.
Pəri qız bir neçə qədəh edib nuş,
Oldu aşiqi tək havalı sərxoş.
Atdı niqabını şərab, bir yana,
Çıxdı pərilikdən, döndü insana,
Dedi: – "Ey zəmanə içində nadir!
Yaranmış varlığın hər şeyə qadir.
Sənin sənətinə diz çökür aləm,
Sənətinə deyil, kəmalına həm.
Tərifini etmək istəsə insan,
Gələr xəyalına günəş, asiman...
Səndədir sənətin gizli mədəni,
Bəladan saxlasın bu dövran səni.
Yolunda xəznələr töksək də bizlər,
Çəkdiyin zəhmətə deyil bərabər".
Belə şirin-şirin danışdıqca yar,
Fərhad divar kimi baxırdı lal-kar.
Pəri qız çox saçıb bu gövhərindən,
Yara mey verməyə qalxdı yerindən.
On qız ki, on işdə olmuşdu mahir,
Çıxıb, tabaq-tabaq əldə cəvahir,

Pəri qız nə yana qoysaydı qədəm,
Ora dürr səpirdi nazlı bir sənəm.
Onlar əllərilə, Fərhad gözüylə,
Otağı qərq etdi yaquta, lələ.
Pəri bu hal ilə eylədi xuram,
Oldu məcnununun önündə aram.
Töküb ləl qədəhə mey yaqutunu,
Dedi: – "Mən eşqinə içirəm bunu".
O şümşad edincə badəsini nuş,
Fərhadın başından uçdu ağıl, huş.
Şirin bir qədəh də töküb haman dəm,
Dedi: – "Sən də mənim eşqimə iç həm".
O meyin iki zidd xisləti vardı:
Həm həyat verərdi, həm can alardı.
Aşiq mey ətrindən olunca sərməst,
Gözəl saqisinə olaraq həmdəst,
Alıb piyaləni eylə nuş etdi
Ki, onun naxışı xəyaldan itdi.
Bu qədəh göylərdən olsaydı dərin,
Fərhad onu dəxi içərdi yəqin.
Elə ki, qədəhdə mey sona yetdi,
Fərhadın ruhu da onunla getdi.
Qurtarıb canını şənlik qəmindən,
Bütün canlıların puç aləmindən,
Zəmanə içində bu nadir insan,
Düşüb torpaqlara qəşş etdi haman.
Qapandı səcdəyə gözəl sənəmə,
Getdi bu aləmdən başqa aləmə.
Qaldırmaq istədi onu pərizad,
Əfsus xəbərsizdi dünyadan Fərhad.
Bu gözlənməz hala tamaşa qıldı,
Şirin də qəşş edib birdən yıxıldı.
Onların ağzına güzgü tutdular,
Gördülər nə onda, nə bunda can var.
Gətir, saqi, gətir can güzgüsünü!
Bəlkə, onda görəm çanan üzünü.
O güzgü cananı əks etdirəndə,
Onlar tək qəşş edib yıxılım mən də.

## FƏRHADLA ŞİRİNİN ZİYAFƏTDƏ SƏRGÜZƏŞTİ VƏ XOSROVUN ŞİRİNLƏ EVLƏNMƏK İSTƏMƏSİ

Bu dastan sapına söz dürrü düzən,
Onu bu zinətlə etdi müzəyyən:
Həmin ziyafətdə iki bəlakəş
Sevincdən yıxılıb eylədikdə qəşş,
Sardı qonaqları yenə iztirab
Döndü al qanlara içilən şərab.
Bir evdə saldılar onun yerini,
Qoydular yatağa nazlı pərini.
Salıb başqa evdə qəm yatağını,
Endirdilər ora bəla dağını.
Vüsala çatmadan hələ bircə an,
Fələk ayrı saldı yarı yarından.
Onlar sübhə qədər huşsuz qaldılar,
Əzab ordusuna tapdaq oldular.
Fərhadın ahı tək salaraq səda,
Əsdi xəfif-xəfif bir badi-səba.
Qaranlıq tozunu süpürdü, atdı,
Sevda tüstüsü də onunla yatdı.
O iki sevdaya, eşqə tutulmuş
Aşiqin başına axır gəldi huş.
Xəcalət içində, əhvalı bərbad,
Bəlalar dağına üz qoydu Fərhad,
Pərisifət dəxi halı pərişan,
Ayılınca etdi çox ahu əfğan.
Məhinbanu görüb bu macəranı,
Sıxıldı ürəyi, qaraldı qanı.
Nə yoldan qaytara bildi Fərhadı,
Nə dincəldə bildi o pərizadı,
Göstərməyim, desə, aşiqə hörmət,
Ona yol verməzdi insaf, mürüvvət.
Göstərim, desəydi, hədsiz ehtiram,
Qorxurdu ola xalq içində bədnam.
Bilirdi eşqinin saf olduğunu,
Sevda bəlasına tutulduğunu.
Odur ki, çağırıb yenə Fərhadı,

Az-az saray içrə məclis qurardı.
Fərhad yar əlindən mey edincə nuş,
Düşərdi yarı da, özü də bihuş.
Yenə ayılınca o qaçar dağa,
Yüz qəm üz verərdi bu ayqabağa.
Bu hal davam etdi bir xeyli zaman,
Nə onda hal qaldı, nə də bunda can.
Nəhayət, rəhmsiz fələk gərdişi,
Çevirdi alt-üstə belə vərdişi.
Bu vaxtlar məğribdə şöhrətli-şanlı,
Dünyaya hökm edən bir əliqanlı,
Ərəbin-əcəmin şahənşah oğlu,
İran da, İraq da əmriçin qulu,
Xosrov adlı bir şah sürürdü dövran.
Diz çökürdü ona zəmin, asiman.
Bütün yer üzünü tutub ləşkəri,
Paytaxtı olmuşdu Mədain şəhri.
Hər yanı tutmuşdu səsi, sədası,
Kəsra babasıydı, Hörmüz atası.
Kəsra axirətə qoyduğu gün üz,
O mülkə şah oldu övladı Hörmüz.
Hörmüzü qoynuna alanda məzar,
Oğlu Xosrov oldu taxtda bərqərar,
Adı Xosrov idi, ləqəbi Pərviz,
Bu adla bu ləqəb məşhur oldu tez.
O, bütün ölkəyə oldu hökmran.
Şahlar nəslindəndi ata-babadan.
Bildi taxt onundur hökmi-qəzadan,
Həm də yeddi deyil, yetmiş atadan.
Hər biri baş əyib qayda-qanuna,
Tapşırmış taxtını doğma oğluna.
O da anladı ki, qocaman fələk
Ona da bir açı mey içirdəcək.
Qəflətən boşalsa ömrünün camı,
Gərək bir övlada çatsın məqamı.
O gündən evlənmək qeydinə qaldı,
İnciyə bənzəyən bir gözəl aldı.

Lakin yaraşmırdı taca bu gövhər,
Onu gəzdirməzdi tac gəzdirənlər.
İstərdi təzədən evlənsin yenə,
Layiqli dürr tapsın tacü-təxtinə.
Bu oldu şüarı onun bu gündən:
"Çəməndə gül bitər, şor yerdə tikən.
Yağış vermədəykən aləmə bəhrə,
Xərçəng mədəsində dönər zəhərə.
İstər tərbiyəni çox et, istər az,
Fitri təbiəti dəyişmək olmaz.
İdraklı dehqan da söyləmiş bunu
Ki, yaxşı torpağa ək öz toxmunu".
Könlündə bu fikir tutunca məskən,
Şikayət eylədi tale əlindən.
Ölkədən ölkəyə salıb elçilər,
Axtardı özünə bahalı gövhər.
İstərdi onunla izdivac etsin,
Gül əkmək istəyən gülzara getsin!
Bu zaman gəzirdi bütün dilləri
Ki: "cənnət bağından gəlmiş bir pəri,
Yerişi tubanı eylər xəcalət,
Çəkər sözlərindən kövsər məlalət,
Sanki günəş enmiş uca fələkdən,
Tutmuş Ərmən-zəmin elində məskən,
O ayla nurlanmış bu gözəl diyar,
Bəllidir, yer üzü günəşlə parlar!
O insan deyildir, pəridir, pəri,
Günəşə ondan da çoxdur bənzəri!
Şahlar nəslindəndir, babası cəmşid,
Şanda, şərafətdə köləsi-xurşid.
O qıza vurğundur nadir bir ustad,
Bütün elmlərdə çıxarmışdır ad.
Xalqdan aralanmış eşqin ucundan,
O eldən gen gəzir, el-oba ondan.
Elə bil, vücudu bir ağır dağdır,
İşi dağ çapmaqdır, qaya çapmaqdır.
Sanma yarır dağı tək tişəsiylə,

Əzir mərməri də əl zərbəsiylə.
Lakin ah çəkməkdən o güclü insan,
Əyilmiş dağ qəddi, olmuş bir kaman.
Tükəndikcə canda taqət, mətanət,
Pərisifət ona köstərir hörmət.
Cahanda təkdirsə o nazlı məşuq,
O mərd aşiqin də bərabəri yox".
Bu sözlər dillərdən dillərə düşdü,
Axır Xosrova da gəldi yetişdi.
Şirinin vəsfini əhli-zamandan.
Eşidər-eşitməz düşdü təvandan.
Könlünü bir alov, bir od bürüdü.
Saldı ürəyinə min tərəddüdü.
O idi, o idi gecə və gündüz
Başındakı xəyal, dilindəki söz.
Lakin dönməmişdi hələ elçilər,
Bəlkə, onlarda var daha xoş xəbər
Nəhayət, qayıtdı onlar da bir gün,
Danışdı Xosrova hər kəs gördüyün.
Ərmən ölkəsindən dönən bir elçi,
Qayıdıb söylədi: – "Tapdım bir inci.
Taclara layiqdir, adı Şirindir,
Yaşadığı diyar Ərmən-zəmindir".
Sonra başqa-başqa səmtə gedənlər,
Hər yana baş çəkib, soraq edənlər
Gəlib söz açdılar o tək maraldan,
Təsvirə sığmayan hüsnü camaldan.
Dedilər: "Behiştin hurisi odur,
Olmuş günəş kimi cahana məşhur".
Xosrov xoşhal idi eşitdiyindən,
Amma gizlədirdi fikrini qəsdən.
Elə ki, tuş gəldi bütün bu sözlər,
Könlündə eşq odu buraxdı izlər.
Bir an dayanmadan gəldi qərara
Ki, səfər eyləsin o xoş diyara!
Yasəmən qamətli sərvi almağa,
Tez güzər eyləsin o güllü bağa.

Birdən səltənəti düşdü yadına,
Bu hal yaraşmazdı şahlar adına.
Büzürgümmid adlı dostu, nədimi,
Ölkənin ən böyük alim həkimi,
Biliyi zəmindən səmayə qədər,
Xosrova hər işdə olmuşdu rəhbər.
Gizlincə yanına çağırıb onu,
Söylədi sevdayə tutulduğunu.
Gizli sirlərini açdı birbəbir
İstədi dostundan bu işə tədbir.
Həkim tez anladı dərd edib tufan,
Daldı düşüncəyə uzun bir zaman,
Dedi: – “Qorxma, şahım, çarə asandır,
Sən heç qüssələnmə, qüssə yamandır.
Elçi getməlidir bir ağıllı şəxs
Ki, ona çatmasın bu işdə heç kəs.
Ürəyi mənalar dürrüylə dolu,
Lakin sədəf kimi ağzı yumulu,
Sədəf tək ağzını açanda hər an,
Söz deyil, dürr saça gərək o insan.
Əsil-nəcabətdə olsun birinci;
Banu sarayına gedərək elçi,
Salamlar yetirsin, müjdə söyləsin,
Onların başını uca eyləsin.
Banu təcrübəli bir hökmrandır,
Pərisifət, dəxi incə qanandır.
Onlar eşitsələr həmin sevdanı,
Əldən buraxmazlar belə faydanı.
Bunu şərəf bilər onlar özləri,
Elçimiz müjdəylə qayıdar geri.
Olsa cavabları bizcə müvafiq,
Hazırlıq görərik biz ona layiq.
Əgər rədd etməyə versələr qərar,
Onun da ayrıca bir əlacı var:
Ona çarə tapmaq deyildir çətin,
Qırar hər maneyi sənin qüvvətin”.
Söyləyib qurtardı sözünü müdrik.

Etdi Xosrov onu ürəklə təbrik.
Büzürk deyən kimi bir şəxs tapıldı;
Eşidib hər sözü itaət qıldı.
Bütün tədbirləri öyrənərək bu,
Vaxtı itirmədən yola doğruldu,
Gecəli gündüzlü xeyli yol getdi,
Axır Ərmən-zəmin mülkünə yetdi.
Gətir, saqi, camı şərabla doldur!
Bil ki, önümdəki dəhşətli yoldur,
Sən hey piyalə ver, alıb içim mən,
Bu qorxunc yolları sərxoş keçim mən.

## XOSROV ELÇİSİNİN ƏRMƏN-ZƏMİNƏ GƏLMƏSİ

Kəlam vadisində edən səyahət;
Verdi bu dastana bu yolla zinət:
Düşünüb yol boyu yüz cürə tədbir,
Saraya yaxlaşdı sirli müsafir.
Xəbər yetirdilər Banuya dərhal
Ki: – "Sənin qapını döyür istiqbal.
Kəsra sarayından bura gələn var,
Göndərmişdir onu Xosrov hökmdar.
Ağıl dəryasıdır o başdan-başa,
Sözləri bənzəyir dürrə, qaş-daşa",
Bütün macəranı dinlədi Banu,
Qonaq mənzilinə göndərdi onu,
Əmr etdi: "Bir gözəl məclis qurulsun,
Məclisdə ləzzətli yeməklər olsun!"
Göndərdi yanına neçə əhli-hal,
Hamı incə qanan, hamı pürkəmal,
Dedi: – "Nəzakətlə öyrənin, bilin,
Nədir bu gəlişdən fikri qasidin".
O dəstə mehmanı dinləyib haman,
Məhinin yanına oldular rəvan.
Xəcalət içində dedi bir vəzir:

“Şirinə elçidir, gələn müsafir”.
Dərin düşüncələr sardı Banunu,
Duydu kəc fələyin yeni oynunu,
Dedi: – “Elçi ilə görüşmək üçün,
Sabaha yaxşı bir hazırlıq görün.
Ehtiram göstərin ona, mehmandır,
Şanlı bir diyardan gələn insandır.
Eşitmək istərəm hər xitabını,
Həm də vermək gərək tez cavabını”.
Saray qulamları dinləyib əmri,
Yer öpüb iş üçün getdi hər biri.
Məhinbanu yenə xəyala daldı,
Heyrət dünyasında tək-tənha qaldı.
Razılıq versəydi həmin sevdaya,
Çatardı, şübhəsiz, böyük faydaya.
Lakin onda neylər bəlalı Fərhad,
Bu fikirdi edən halını bərbad.
Rədd etmək istəsə Xosrovu yəqin,
Bəhanə göstərmək olacaq çətin.
“Oğlana bab deyil” demək yaraşmaz,
Qızı da pisləsə yenə kar aşmaz.
Əgər Banu dəxi olarsa razı,
Necə razı salar güləndam qızı?
Onu zorla belə razı etsələr.
Kim bilir axırda nələr baş verər!
Əgər rədd cavabı alarsa sultan,
Pələngdən ceyrana yetməzmi ziyan?!
Razılıq verərsək biz bu sevdaya
Fərhadın zəhməti getməzmi zaya!
Bu işə bir çarə taparam-deyə,
Daldı Məhinbanu çox düşünçəyə,
Xəyal toxumunu yüz cürə əkdi,
Axır ayüzlünü söhbətə çəkdi.
Dedi: – “Baş veribdir bir iş fələkdən,
Yaxşını, yamanı, özün düşün sən!”
Eşitçək qissəni o pərizada,
Döşəndi torpağa gəldi fəryada,

Dedi: – "Ayaq tozun qibləgahımdır,
Sənin şən sarayın tək pənahımdır.
Yetdi məndən sənə hansı əziyyət?
Sən niyə verirsən mənə xəcalət?
Bu sözü deyinçə qılınc al ələ,
Canımı, cismimi tapşır əcələ.
Hindli tək atəşdə yaq bədənimi,
Yanağım odunda yanan xal kimi.
Alovlar içində alışım, yanım,
Ərşi saçım kimi örtsün dumanım.
Təki, əzabımdan qurtarsın aləm,
Min əzab çəkməsin mənim canım həm.
Fərhadın qüssəsi deyilmidir bəs,
Onun zəhmətinə budurmu əvəz?
Eşqimdən qəşş etmək olub peşəsi.
İnsanı titrədir ahı, naləsi.
Çatmaz qulağına aylarla sözüm,
Görünmür gözünə mehriban üzüm.
Axıdır su kimi gözdən yaşını,
Sel kimi daşlara çırpır başını.
Olur xəyalımı görməklə qane,
Həsrətimdir edən ömrünü zaye.
Uzaqdır gözündən çamalım mənim,
Gülməyir qəlbinə vüsalım mənim.
Mən də ayrılalı o natəvandan,
Bir quru səs qalıb cismimdə candan.
Bizim sevişməmiz çatdı ellərə,
Düşdü ağızlara, düşdü dillərə.
Məndə başqa ərə sanma həvəs var,
İnsanam deyənə birçə yar çatar.
Əgər Banu əlac bilirsə etsin,
Öldürrəm özümü, yoxsa, eşitsin!"
Məhin nəzər salıb o solğun gülə,
Axdı gözlərindən yaş gilə-gilə,
Çarə tapmaq üçün xəyala daldı,
Ona ürək verib, könlünü aldı,
Dedi: – "Ey körkəmi könül mərhəmi,

Görüncə göz səni unudar qəmi.
Bu sözlər nə idi, canımı yaxdı,
Alovu sinəmdə izlər buraxdı?
Bütün sözlərinə şərikəm mən də,
Düzdür sən deyən də, mən düşünən də.
Gülüm, qəm eyləmə, könlünü şad tut,
Şərab iç, kef elə, qüssəni unut.
Bir məclis düzəldib, inan, səhəri,
Elçini üzrlə qaytarram geri...”
Səhər daxil olub məçlisə Banü,
İlk öncə qonağın halını sordu,
Sonra da Xosrova edib dualar,
Soruşdu kefini təkrarbətəkrar.
Vüqarlı başını endirib qonaq,
Əsrin adətincə təzim qılaraq,
Kamallı, camallı Banuya baxdı,
Həm onu bəyəndi, həm tacı, taxtı.
Qəlbində “afərin, afərin”, – dedi,
“Layiqdir şahlığa bu gəlin”, – dedi
Söhbət və ehtiram bitdi nəhayət,
Verildi elçiyə bir xeyli xələt.
Sonra getmək üçün aldı icazə.
Banu: – “Salam yetir”, – dedi – Pərvizə.
Əsil məsələyə keçib axırda,
Dedi: – “Cavab üçün dayan bayırda”.
Müsafir eşidib o son qərarı,
Yer öpüb, oradan çıxdı dişarı.
Banu vəzirləri çağırıb haman,
Etdi məsələni onlara elan.
Dedi: – “Xəbər verin gələn mehmana,
Desin bu sözləri ulu sultana:
Sənin göndərdiyin şadlıq xəbəri,
Başı uca etdi biz həqirləri.
Qara torpaq ikən qaldırıb göyə,
Yetərdin günəşlə bir səviyyəyə
Ancaq bəxt insana yar olmayanda,
Yüz belə hörmət et, ondan nə fayda?!

Yüz il əfsus edib dolansan, inan,
Çətindir dərdimə tapıla dərman.
Sən ki, bizlə qohum olmaq dilərsən.
Şərəfdir bu bizə, nə qədər desən.
Əfsus, baş veribdir belə vəziyyət
Ki, adam deməyə çəkir xəcalət.
Amma tanrı nəyi edərsə təqdir,
İnsan çəkə bilməz o işə tədbir.
Budur müxtəsəri: sənin sevdiyin,
Eşqinə düşddüyün ayüzlü Şirin,
Xeyirxah olsa da başdan-ayağa,
Bir böyük eybi var, gəlməz anmağa:
Eşitmək istəməz evlənmək sözü,
Bu sözü qadağan eyləmiş, düzü.
Sevir ömr etməyi erkək sayağı,
At çapmaq, ox atmaq, quş ovlamağı.
Tapılmaz ölkədə elə bir nəfər
Ki, ona açıqca təklif etsin ər.
Belə bir cürəti göstərən insan,
Əvvəl əl çəkməli öz həyatından.
Tanrıdan verilmiş bu qüsur ona,
Tanrı verən qüsur xoşdur insana.
O, insan deyildir, pəridir, pəri,
Günəş cəmalına çoxdur müştəri.
Bütün aləm onun hüsnünə müştaq,
O isə təkliyi istəyir ancaq.
Bu səbəb üzündən o parlaq qəmər,
Evdə qız qalmışdır bu vaxta qədər.
Xosrov bu əhvaldan olsun xəbərdar,
Sonra nə əmr etsə, ixtiyarı var".
Zamanın xanımı sözü tükətdi,
Vəzirlər elçinin yanına getdi.
Səpərək sözlərin xəzinəsini,
Açdılar önündə sirr pərdəsini.
Qasid söz tapmaqdan qalaraq aciz,
Gəldiyi diyara yol başladı tez.
Gedib çatan kimi öz diyarına,

Yetirdi cavabı hökmdarına.
Eşidib bu sözü hirsləndi sultan,
Elçinin sözünü zənn etdi yalan.
İkinci bir elçi göndərdi həmən;
Yenə o cavabı aldı Məhindən.
Gedib gəldisə də bir neçə qasid,
Yenə bar vermədi bəslənən ümid.
Hirs elə sardı ki, İran şahını,
Tüstüsü qaraltdı gun çırağını.
Dedi: – "Gör ad-sanım nə yerə yetdi
Ki, onlar da məni başından etdi.
Bilirəm, bu sözlər bir əfsanədir,
Bir qadın məkridir, bir bəhanədir.
Bu ləkə yetməzmi, söyləyin, mənə
Özümü tay tutdum hər bir yetənə?
Nə yerə çatmışdır indi macəra
Ki, onlar özünü çəkir kənara.
Bu ki, öz bəxtini tapdalamaqdır,
Bəxti tapdayana nə etsən, haqdır.
Dünyaya bir toyuq oxusa meydan.
Belə bir dünyada yaşarmı tərlan?
Dişi şir xanlığı alarsa ələ,
Aslan nəyə gərək, caynaqlarilə?
Əgər ömrüm olsa, o səfillərə,
O böhtan söyləyən rəzil dillərə,
Bir divan tutaram, mat qalar cahan.
Sallam yurdlarına elə bir tufan
Ki, harda tapılsa o cür səfillər,
Bundan ibrət alar məhşərə qədər!!!"
Deyib bu sözləri, o dəstə-dəstə
Ordular çəkərək çıxdı yol üstə.
Bu məlumdur, eşqə tutulanlara:
Taçidarlıq hara, məhəbbət hara?!
Saqi, piyalə tut, məst olaq haman,
Bir içim mey xoşdur padişahlıqdan,
Ver içim, gəlməsin şahlıq gözümə,
Xalqa zülm edincə, edim özümə.

## XOSROVUN MƏHİNBANU İLƏ MÜHARİBƏSİ

Məna ordusuna verən tərtibat,
Bu meydan içində belə sürmüş at:
Pərviz o cavabdan coşdu, qudurdu,
Çəkdi Ərmən-zəmin mülkünə ordu.
Saysız-hesabsızdı çəkdiyi ləşkər,
Guya gətirmişdi dağ, dərə əsgər.
Toz-duman içinda qaraldı günəş,
Fələyin halı da oldu müşəvvəş.
O salmaq istərdi elə bir tufan,
Mislini görməmiş olsun bu cahan.
Keçdi bir neçə gün yol tamam oldu,
Bütün Ərmən-zəmin qoşunla doldu.
Banuya xəbərə qaçdı oba, el
Ki, "Bütün ölkəni götürdü bu sel,
Sel deyil, müsibət, bəla ümmanı,
Nə ümman, bir böyük qəzəb tufanı".
Bu sözlər Banuda doğurmadı qəm,
O, çoxdan işini tutmuşdu möhkəm.
Şəhər hasarını mahir qələdar,
Göyün hasarına etmişdi oxşar.
O qədər möhkəmdi bu yüksək qala,
Fələk qalasından qalmazdı dala.
Azuqə yolları, taxıl yolları
Çəkilmiş yan-yana kəhkəşanvarı.
Hər qala bürcündə tutmuşdu aram,
Mübariz bir igid, bir yeni Bəhram.
Möhtəşəm divarlar qalxıb göyədək,
Onun dörd yanını bürümüş xəndək.
Hasarın üstündə keşik çəkənlər
Gecə xəndəklərə salanda nəzər,
Sularda əks etmiş görərdi ayı,
Sanki enmiş ora ulduz sarayı.
Bu möhkəm qalada olan ehtiyat,
O qədər boldu ki, insan qalır mat.

Üyütsə dənini əgər dəyirman,
Min il dolansa da ötməz yarıdan.
Yazlıq quzuları yüz mindən artıq,
Qoyun sürüsü də ona müvafiq.
Hədsizdi hər cürə yemək və geymək,
Onları adbaad olarmı demək.
Qalanı ömürlük etməyi təmin
Almışdı nəzərə işgüzar Məhin.
Onunla birlikdə pəri çamallı,
Edərək Fərhadı bu işdən halı,
Bütün fəlakəti verdilər xəbər,
Qalaya gəlməyi xahiş etdilər.
O dağlar sakini, hünər Fərhadı
Qarının sözünü yerə salmadı.
Şəhərə könülsüz döndü o aslan,
Hasar kənarında eylədi məskən.
Orda ucalmışdı yüksək bir qaya,
Əzəmətli başı çatırdı aya.
Oraya çıxdı ki, döyüş zamanı,
Daşqalaq eyləsin gələn düşmanı.
Xosrov da sürətlə gəldi yetişdi,
Qaladan yarım mil aralı düşdü.
Yerbəyer olunca qoşun ərkanı,
Özü seyrə çıxdı, gəzdi hər yanı,
Onun arxasınca min igid oğlan,
Səyirdib atları etdilər cövlan.
Hasar burclarına baxaraq tez-tez,
Fikrində min tədbir tökürdü Pərviz
O böyük qalaya etdikcə nəzər,
Sanırdı yerlərə enmişdi göylər.
Nə güclə almağa gümanı vardı,
Nə geri qayıtsa bir şey çıxardı.
Fərhadsa tutmuşdu daş üstə mənzil,
Almaz tutan kimi baş üstə mənzil.
Xosrov ona tərəf salanda nəzər,
Sancıldı köksünə bir iti xəncər.
Dedi: – “Təəccübdür, kimdir o əjdər,

Görkəmi könlümü qıldı mükəddər,
Sanki adətidir könül qan etmək,
Gedib kimliyini öyrənmək gərək”.
Bir nəfər oraya sürüb atını,
Xosrovun dilincə sordu adını.
Fərhad cavab verdi: “Yox mənim adım,
Adlı-sanlı olmaq deyil muradım.
Elə bir torpağa döndü ki, cismim,
Bu torpaq içində yox oldu ismim.
İçimdə eşq odu tüstülənəndən.
İsmim də, cismim də əl üzdü məndən.
Məhəbbət üstümdən götürmüş adı,
O gündən mən ada, ad mənə yaddı.
Amma dünyada ki, ağılı azlar,
Bu fani yoxluğu zənn edərək var,
Torpaq vücudumu hərdən edib yad,
Deyirlər adıma bəlalı Fərhad”.
Xosrov agah oldu onun sözündən,
Az qaldı bir anda getsin özündən.
Eşitmişdi bu ad haqqında çox-çox,
Gördü sözündə də heç bir qüsur yox.
Qəlbində Fərhada duysa da rəğbət,
Qısqanclıq oyatdı onda məhəbbət.
Dedi: – “Fikirləri gözəldir üzdən,
Əslində zəhərdir, aldanmaram mən.
Nə qədər sözləri olsa da əlvan,
Süslü bir ilandır, xof edər insan.
Düzdür, ifadəsi safdır, rəvandır,
Mənə ki, mənfəət deyil, ziyandır.
Əlindən möhnətdir, qəmdir nəsibim.
Mən bir aşiqəmsə odur rəqibim.
O, şərik çıxmışdır mənimlə mülkə,
İstər çatsın ona həm yar, həm ölkə.
Bu tikən yolumdan alınsın gərək,
O qaya üstündən salınsın gərək,
Onu göydə gəzib yerdə tapmışam,
Gərəkdir əlindən qurtarsın yaxam.

Təmizləsəm bağı həmin tikəndən,
Mənimdir, şübhəsiz, o şux yasəmən.
Deyin beş-on igid səyirdərək at,
Gətirsin yanıma onu bu saat".
Atlılar əlüstü pərvaza gəldi,
Fərhad da ucadan avaza gəldi,
Dedi: – "Ey qorxusuz, şöhrətli sərdar,
Sənə fələk də yar, taleyin də yar.
Bilmirəm Xosrovsan, Xosrov deyilsən,
Mənim sözlərimə bir qulaq as sən.
Hərgah gəlməyimi eyləsən arzu,
Dəvət eləməyin yolu deyil bu.
Zorla gətirməyə bir natəvanı
Neçin göndərirsən on pəhlivanı?
Qəsdin öldürməksə mən binəvanı,
Sənə xeyri dəyməz, mənə ziyanı.
Bil ki, bu dəstənin qanlısı sənsən.
Əlinlə orduna kəfən biçənsən.
Desən, uydurmadır bu sözlər haşa,
Haqqın qüdrətinə gəl et tamaşa.
Gözlə başındakı şiş dəbilqəni,
Bax, bu daşla təbrik edirəm səni!"
Yenə bir daş atıb dedi o aslan:
"Buna bayrağının ucudur nişan!"
İki daş dalbadal sürətlə süzdü,
O iki hədəfi yerindən üzdü.
Dedi: – "Ey bir elin tək hökmdarı,
Saysız orduların böyük sərdarı,
Mənə bu hünəri el eşqi verdi,
Bunu sən də gördün, qoşun da gördü.
Əmr et, atlıların qayıtsın geri,
Qurtarmaz əlimdən, yoxsa, heç biri.
Dəmir dəbilqəni başdan qopardan,
İstəsə başı da qopardar, inan.
Bir bax qoşununda, ey şanlı sərdar,
Çoxdur sənin kimi polad taçlılar.
Zülm etmək istəsə sizlərdən hər kəs,

Haqq ona göndərər belə bir əvəz:
Bir məcnun ataraq qayadan daşı,
Ayırar bədəndən o zalım başı.
Keçirəm qanından, şükr elə buna,
Başını götürüb düzəl yoluna!
Budur son fərmanım, son sözüm mənim.
Varında, canında yox gözüm mənim.
Nə qədər dərdliyəm eşqin əlindən,
Neyləsəm, yanında üzürlüyəm mən.
Kinimi dağlara etsəm əgər faş,
Bil ki, baş qaldırar hər qaya, hər daş.
Düşüncən vardırsa etmə heç güman
Ki, qoşun gücüylə zəfər taparsan.
Haqq yanında bu çür ləşkərin mini,
Bir səhər ahının verməz yerini.
Səni səltənətə çatdıran allah
Mənim nəsibimi torpaq etdi, ah.
Sən taxtlar üstündə ömr sürürkən,
Onu bu torpaqla bir tuturam mən.
Şah hansı bir işdən güdürsə fayda,
Onu özü üçün ar bilir gəda.
Cəfa meydanında at sürən insan
Bir ləzzətmi alır öz tutduğundan?
Səncə yaxşımıdır qılınc çəkərək,
Tuta orduların ərzi duman tək;
Qan töküb ellərə sala vəlvələ,
Özgə torpağını keçirə ələ?
Gör kimin yurdunu bərbad edirsən?
Sevdiyin bir könlü naşad edirsən.
Yar üçün min əzab toru qurursan,
Hələ bir sevgidən dəm də vurursan.
Eşqə can verdiyin budurmu, eyvah,
Bumu vəfa şərti, ah allah, allah!
Bumu eşqlə zar olmağın sənin?
Qüssədən biqərar olmağın sənin?..”
Atdığı daşlarla dediyi sözlər
Göstərdi ki, onda var böyük hünər.

Sardı Xosrovu bir dərin iztirab.
Fərhadın sözünə tapmadı çavab.
Məsləhət bilmədi o dönsün geri.
Yaxud ordusunu çəksin irəli.
Ordusu yanında rəngi tutuldu,
Qala əhlindən də xəcalət oldu.
Başında tunc papaq olub yüz para.
Söz qılıncı açıb qəlbində yara.
Bütün ümidləri mum kimi söndü.
Nəhayət, ordunun yanına döndü.
Saqi! Qəmləri qov, qədəhi doldur,
Sevgidə şah, gəda bir hüquqludur.
Eşq içrə şahlığın gər ləzzəti var.
Bil ki, gədalığın qiyaməti var...

## XOSROVUN MƏHİNBANU QALASINI MÜHASİRƏ ETMƏSİ

Verib söz gəlini hüsnünə zinət,
Kəlam xəridarı edir rəvayət:
Xosrovun əhvalı olduqca düşkün,
Geri döndüsə də ordan həmin gün,
Dərin düşüncəyə, xəyala getdi,
Büzürkümmid ilə məşvərət etdi.
Baş vəzir verərək ona təsəlli
Dedi: – "Çətin deyil bu işin həlli.
Dağlılar çox sevər sapand atmağı,
Sərsərinin sözü olar lağlağı.
Sən belə sözləri qəlbinə salma,
Eşitsən də belə qulaqa alma.
Divanə sözünu aqil eşitməz.
Qəlbini sıxaraq əsla qəm etməz.
İlan zəhərlərmi, de əjdahanı?
İt yoldan eylərmi, söylə, karvanı?
Məsləhət budur ki, bir elçi getsin,
Məhinə bir daha nəsihət etsin.

Duyulsun nitqində kərəm və qorxu.
Hədəylə baş tutar ümidin çoxu.
Şübhəsiz, ayılıb yola gələrlər,
Səndəki qüvvəti, gücü bilərlər.
Bu işi tutmalı çox ehtiyatla,
Mərməri sındırmaq olmaz inadla.
Qala çox möhkəmdir, heç şübhə yoxdur,
Orda azuqə də, sursat da çoxdur.
Sən ki, bu dünyanın xurşidisən, şah,
Əsrin, zəmanənin Cəmşidisən, şah!
Davaya başlasan, gərəkdir o gün
Alasan qalanı ələ büsbütün.
Əgər bu sürətlə almasan ələ,
Arzun yüz ilə də yetməz hasilə.
Bəlkə də, hərb ilə çatmadın kama,
Tədbirlə çatasan onda mərama.
Öncə nəsihətlə sına baxtını,
Başqa tədbirlərin gözlə vaxtını.
Uydurmasa əgər əfsunçu yalan,
Çıxmaz yuvasından əfi bir ilan".
Bu sözlər bitincə, yenə bir nəfər
Məhinin yanına eylədi səfər.
Yetişib qalaya o müdrik insan,
Sözünü bu yolla eylədi bəyan:
"Göyləri əmrinə tabe edən şah,
Fikrindən qəməri eyləyir agah.
Dostluq şeypurunu qaldırıb zilə,
Biz bir oğul kimi gəldik bu elə.
Lakin salmadınız bizə bir nəzər,
İndi nəzər salın barı bir qədər.
Əgər cavabınız əvvəlkidirsə,
Sualımız budur o zaman sizə:
O göylər günəşi, o yasəmən qız
Ömrünü sürməyi sevirsə yalqız,
Ərdən, evlilikdən uzaq qaçırsa,
Bütün kişilərə nifrəti varsa,
Bəs kimdir o dəli, o gic daşyonan?

Sözü başdan-başa baş-ayaq, yalan.
İnsan ikrah edir sir-sifətindən,
Nadanlıq duyulur söz-söhbətindən.
Dövrün bu arsızı o sir-sifətlə,
Çəkib gecə-gündüz ah ilə nalə,
Deyir: Mənəm Şirin eşqinə layiq,
Ona məşuq deyir, özünə aşiq.
Bu haldan yer üzü tutmuşkən xəbər,
Bəs nədən ayüzə eyləmir əsər?
Üstəlik yanına çağırır daim,
Onunla söhbətlər edir mülayim.
Qılır vüsaliylə ürəyini şad,
Hicran bəlasından, qəmindən azad.
Sözünüz su kimi safdırsa əgər,
Ona zidd deyilmi bu hərəkətlər?
Yox əgər yalansa sözünüz sizin,
Sirri nədir bizi rədd etmənizin?
Etiraf etsəniz bu səhvinizi,
Yəqin ki, şanlı şah bağışlar sizi.
Xatasız bir insan yoxdur dünyada,
Xatadan uzaqdır yalnız bir xuda.
Madam ki, qonağıq biz ölkənizdə,
Bir az qonaqcıllıq göstərin siz də.
Bitsin aradakı kinü küdurət,
Yaransın səmimi dostluq, məhəbbət".
Tükətdi sözünü şahın qasidi,
Məhinbanu ona gülərək dedi:
– "Xosrov ki, Fərhadı saymayır insan,
Nifrətlər eyləyir ona hər zaman,
Onun cavabında nə söyləyim mən?
Siz ki, almışsıiız cavab özündən.
Vəsfini söyləsəm onun gər min il,
Çatdıra bilmərəm mində birin, bil.
O, gəda deyildir, bir şah oğludur,
Şərəfdə Xosrovdan, məndən uludur.
Bütün elmlərdən olmuş xəbərdar.
Onun kimi alim bir insanmı var?..

Hansı bir şahda var ondakı vicdan,
Odur üstün tutan gədanı şahdan.
Xosrov ki, söyləyir: ayüzlü Şirin,
Əgər kişilərə bəsləyirsə kin,
Bəs nədən olubdur aşiqi Fərhad,
Nədən bu eşqilə könlü olur şad?
Fərhad bir insandır, heçlik meyindən
İçərək keçmişdir öz mənliyindən.
Yoxluq atəşindən çöp kimi yanmış,
Ömrünün məhsulu oda qalanmış.
Elə məhv olmuş ki, eşqin yolunda,
Mənlik nişanəsi qalmamış onda.
Həqiqət sirrinə vaqif bir nəzər,
Önündə haqq daim təzahür eylər.
Gözəllik şəklində zahir olsa haqq,
Yəqin məhəbbətdə əks edər ancaq,
Fərhad da Şirini sevir Məcnun tək.
Yoxdur ürəyində başqa bir istək.
Görməklə iki-üç dəfə cananı,
Canında qalmamış həyat nişanı
Hər görəndə onu getmiş özündən
Neçə gun ölü tək qalmış o bəzən.
Görənlər yas tutub düşmüş həycana,
Haqq onu yenidən gətirmiş cana.
Gen görüb Fərhadı kindən, məkrdən,
Acımış halına bizim gülbədən.
Canını vəslinə eyləmiş fəda,
Əfsus bəxt gülməyir yazıq Fərhada,
Görüncə cananı qəşş edir tamam,
Gəlincə özünə ayrılır ondan.
Vəhşi dağlar, duzlər olaraq yeri,
Daşıyır çiynində bəla yükləri.
Yarın xəyaliylə edir kifayət,
Dərdü məlalilə edir kifayət.
Şirinsə dözməyib, görüşmək istər,
Bilir ki, onda yox şübhəli hisslər.
Xosrovun fikrincə çirkindir Fərhad

Bilmirəm bu sözə necə verim ad.
Demirəm ona mən gözəl, ya çirkin,
Vardırsa üzünü görməyə fikrin,
Get özün seyr eylə, tərəf görmədən,
Gör Xosrov haqlıdır onda, yoxsa mən?
Üzü gülüstandan dərilmiş güldür,
Nə deyim, get özün həqiqəti gör.
Qaldı, şah ki, deyir, qəlbi açıq, saf,
Bütün günahları edim etiraf,
Mən də son sözümü dedim yerbəyer,
Get olduğu kimi şaha xəbər ver.
Desə ki, yalandır, qorxum yox ondan,
Əgər düzdür desə, onundur Fərman".
Elçi bu sözləri tamam eşitdi,
Üzrxahlıq edib qayıtdı getdi.
Yetişib Xosrovun qərargahına,
Banunun sözünü dedi şahına.
Bu sözdən Xosrovu sardı xəcalət,
Qaldı tərəddüddə bir xeyli müddət.
Bir yandan qəlbində tutduğu məqsəd
Canan tərəfindən edilmişdi rədd;
Bir yandan da rəqib yar olub yara,
Xosrovun qəlbini salmış odlara.
Hirsləndi, taqəti, səbri tükəndi,
Yenə şahlığına baxıb güvəndi.
Şah, qəzəb qılıncı alarsa ələ,
Cani adlanaçaq günahsız belə.
Düşsə qamışlığa nagahan odlar
Bəllidir həm quru, həm yaş od tutar.
Harda aşıb daşsa haqsızlıq seli
Yıxar, həm xaraba, həm abad eli.
Qəzəb ki, Xosrovu yandırdı, yaxdı,
Bütün bu ölkəyə nifrətlə baxdı.
Kəməndə salmağa nazlı şikarı,
Sürdü öz atını qalaya sarı.
Arxasınca qoşun sıx sıralarla,
Dalğalı dərya tək axdı vüqarla.

Qoşun alay-alay sardı qadanı,
Addım sədaları tutdu hər yanı.
Onlar yanaşınca hasara doğru,
Çalındı qapıda döyüş şeypuru.
Elə bil İsrafil suru çalındı,
Qiyamətin günü yada salındı.
Etdi mühasirə qalanı ləşkər,
Sanki çulğaladı dünyanı göylər.
Saqi! Bir cam gətir, göydən gen olsun,
Gül rəngli badəsi şəfəqdən olsun.
Başından min oyun keçən bu qələ
Görək nə musibət çəkəcək hələ...

## XOSROVUN FƏRHADI HİYLƏ İLƏ TUTMASI

Gözəllər yığnağı, göylər hasarı,
Bu sözlərlə açdı gül yanaqları:
Pərviz ki, qoşunla qalanı sardı,
Könlündə ədavət tufan qopardı.
Keşik qülləsinə çatanda ləşkər
Şah dedi: – "Bir xəndək qazsın hər əsgər!"
Qala dövrəsində qala quruldu,
Sanki qalxan üstə zireh vuruldu.
Şəhər əhli olub bundan xəbərdar,
Qalada arxayın tutmuşdu qərar.
Bürclərin üstündə keşik çəkənlər
Gəzirdi axşamdan sabaha qədər.
Dan sökənə kimi məşəllə şamdan
Olurdu göy kimi qala çırağban.
Fərhadın seçdiyi əlçatmaz məkan
Ordu yanaşmağa verməzdi imkan.
İstəsə dörd yana işlədib sapan,
Gələn düşmənləri qırardı ordan.
İldırım qeyzilə süzdürüb daşı,
Əzərdi, olsaydı min aslan başı.

Min addım uzaqda kiçik bir danə
Olsaydı, alardı onu nişanə.
Hədəf xaş-xaş kimi kiçik də olsa,
Dönərdi gözündə bir Elburusa.
O hey sərt qayanı çapıb oyurdu,
Atdıqca, yeni daş hazır qoyurdu.
Qanlı döyüşlərə etsə də nifrət,
Sapan işlətməkdən güddüyü məqsəd
Düşmən qoşununu qorxutmaq idi,
Özünu ölümdən gen tutmaq idi.
Yoxsa istəməzdi o dərdli insan
Versin öz işilə bir kəsə ziyan.
Yetsəydi birinə fələkdən xətər,
Fərhad qəm çəkərdi ondan beşbətər.
Bir fəqir çəksəydi dərd əlindən ah,
Yüz min ah çəkərdi Fərhad da nagah.
Heç mümkün deyildi o qəlbi məhzun,
Tük qədər birinin halını pozsun.
İndisə ölümdən edib ehtiyat,
Bu hədə yoluna əl atmış, heyhat.
Canında canana bəslərkən vəfa,
Düşmənlərə neçə eyləsin fəda?
Ondan qorxar ikən dəhşət saçanlar,
Ehtiram görərdi çox mehribanlar.
Dərdlilər toplanıb başına onun,
Tez yaşı qatardı yaşına onun.
Nəvaziş görərdi gədalar ondan,
Köməklik tapardı, əlil, natəvan.
Tikan batsa idi özgə bir ələ,
Çıxardardı onu öz kirpiyilə.
Belə bir insanı əsrin hakimi,
İstərdi məhv edə bir qatil kimi.
Gecə-gündüz ondan salaraq söhbət,
Baş vəzirlə edib gizli məsləhət,
İstərdi bu işə tapa bir çara,
Fərhadı meydandan ata kənara.
Deyirdi: – “Ordumuz qorxmasa ondan,

Qalanı zəbt etmək olar çox asan”.
Şahın bu qəsdini kim başa düşdü,
Heyrətdən, qəzəbdən təlaşa düşdü.
Bu vaxt bir hiyləgər fitnə yolilə,
Dedi: – “Mən Fərhadı keçirrəm ələ...”
Hiylə işlətməkdə bu məkrli şəxs
Yəqin iblisə də öyrədərdi dərs.
Şah dedi: – “İstərəm o bağrı dağlı,
Gəlsin hüzuruma qolları bağlı.
Əgər sən bu işə bir çarə etsən,
Hədsiz qızıl-gümüş bağışlaram mən”
Bu sözü eşidib dedi fitnəkar:
“Məkrlə eylərəm onu giriftar.
Belə ki, başından uçar ağıl, huş,
Düşər ölü kimi torpağa bihuş.
Əfsus ki, gətirmək gəlməz əlimdən,
Odur ki, bu işə girişmirəm mən”.
Şah dedi: – “Sən onun huşunu alsan,
Yüz silahlı durub pusquda pünhan,
O bihuş olunca çıxıb oradan,
Gətirərlər mənim yanıma əlan”.
Xosrova söz verdi həmin fitnəkar.
Baş əyib düzəldi yola bəxtiyar.
Zahirun göstərib özünü məhzun,
Danışıqda aqil, şəkildə məcnun.
Dərdiyi ətirli bir gülə xəlvət,
Bihuşdarı səpib, işlətdi min fənd,
Yeni yol başladı Fərhada sarı,
Dolanıb sərsəri o səhraları,
Aşiqanə bir ah çəkdi ürəkdən.
Sanki alov çıxdı o bidiləkdən.
Bu qəm naləsini Fərhad eşitdi,
Bir anda səbrlə təvanı bitdi.
Kördü bir qamətin əyilmiş yayı,
Elə bil seyr etdi üç günlük ayı.
Qəlbinin qəmləri köksünü yardı,
Ruhunun alovu könlünü sardı.

Dedi: – "Ey müsibət odunda yanan,
Ahın qəlb odumu artırdı, inan.
Söylə vətənini, söylə dərdini,
Hansı yar bu hala salıbdır səni?
Məhəbbət qılınçı üzərkən məni,
Nədir parçalayan sənin sinəni?
Fələyin zülmündən mən eylərəm dad.
Sən nədən çəkirsən de nalə, fəryad?
Ayrılığın odu mənə olub yar,
Səni hansı bəla yaxar, odlayar?
Eşqin atəşidir mənə od vuran
Nədən tüstü çıxır sənin ahından?".
Fitnəkar çox rəvac görüb bazarı,
Yenidən başladı naləvu zarı.
Dedi: – "Ey aşiqlər nəslinə sultan,
Eşq əhli, yolunun tozudur, inan!
Qəribəm, deyiləm mən də buralı,
Ümiddən, qorxudan könlüm aralı.
Məni yüz zillətlə haqqın rizası,
Fələyin dövranı, çərxin qəzası.
Elimdən, günümdən avarə etdi,
Bir gözəl eşqiylə biçarə etdi.
Uzaqdan görərdim mən o şux gülü,
Bəzən açıq-saçıq, bəzən örtülu.
Doğrudur, hicranla hər dəm yanardım,
Körərkən üzünü çox şadlanardım.
Görum cəza versin Xosrova xuda,
Rədd olsun bu yerdən o böyük bola...
O gəlib şəhəri sardığı gündən,
Sığındı qalaya həmin gulbədən.
Mən isə biyaban içində qaldım,
Yüz bəla, yüz hicran içində qaldım.
Çünki bir qəribəm elimdən kənar,
Nə bir həmdəmim var, nə aşinam var.
Nə zaman yönəlsəm qalaya sarı,
Atılar üstumə bəla oxları.
Açılmaz üzümə bir qapı nagah,

Taqətdən düşərək ölürəm, eyvah!
Dərd başımdan aşır, nə dərmanım var,
Nə də ahdan özgə bir yananım var.
Bildim eşq elinin baş səyyahısan,
Əzab ölkəsinin padişahısan.
Dedilər bu qaya uzərində sən,
Taxt üstə şah kimi, tutmusan vətən.
Gəldim sənə deyəm ərzi-halımı.
Ellər eşitməyən bəd əhvalımı.
Çəkdim eşq əlindən min cürə möhnət,
Gəldim ayrılıqdan edəm şikayət,
Deyəm eşq oduna tutulduğumu,
Qərib olduğumu, xar olduğumu".
Fərhad eşidərək bu ah, fəğanı,
Canına od duşüb qaynadı qanı.
Bu ahın, nalənin mində biri də,
O həssas ürəyi salardı dərdə.
Onun ah-amanı göylərə qalxdı,
Göz yaşı selləri çöllərə axdı.
Dərdini dedikçə gələn o alçaq,
Onun hər qəminə olaraq ortaq,
Bir fəğan çəkərək, bir şivən saldı,
Ki, zəif heykəli torpaqda qaldı.
Atıldı fitnəkar divanələr tək,
Şam üstə dolanan pərvanələr tək.
Qəşş etmiş aşiqin baxdı üzünə,
Guya gətirməkçün onu özünə,
Uqursuz əlində tutduğu gülü,
Ətrinə bihuşdar qatdığı gülü,
Fərhadın burnuna tutdu o İblis,
Ki, tamam tərk etsin onu şüur, hiss.
Qalmadı aşiqdə idrak əsəri,
Lakin o zəhəri çəkməyib geri,
Şüur ordusunu eylədi qarət,
Qalxıb fəryad ilə verdi işarət.
Şapur bir daş üstə yataraq onda,
Bir ilan görürdü öz yuxusunda.

Bu səsdən diksinib həycanla qalxdı,
Təlaşla oradan Fərhada baxdı,
Gördü qəşş eyləmiş o mələk insan,
Nəğmələr oxuyur üstündə şeytan.
Divlər hər tərəfdən töküldü birdən,
Bildi nə baş vermiş o hiyləgərdən.
Gördü fürsət əldən çıxıbdır, heyhat.
Qəşş etməmək üçün göstərdi sübat.
Fərhadın halına töküb göz yaşı,
Sındırdı qayadan bir çaxmaq daşı;
Şapur ki, qayada tutmuşdu qərar,
Ondan alçaqdaydı həmin fitnəkar,
Elə bir qüvvətlə vurdu ki, onu,
Çatdı həyatının bir anda sonu.
Əzildi mum kimi o fitnəkar baş,
Boyandı qanına, yaxında dağ, daş.
Birisi özgəyə yetirsə bəla,
Əlbət, əvəz verər allah-təala!..
Bu zaman pusqudan çıxan yüz azğın
Aldı dövrəsini bihuş Fərhadın.
Biri dedi: – "Belə aparaq bunu",
O biri: – "Yox, – dedi – vuraq boynunu".
Lakin sataşınca hüsnünə gözlər,
Onlarda qalmadı kindən bir əsər.
Böyük ehtiramla qaldırıb ordan,
Xosrovun yanına oldular rəvan.
Fərhad ölü kimi qafil özündən,
Düşüb Şapurun da dünya gözündən,
Ağlaya-ağlaya gəzirdi dağda,
Ona səs verirdi matəmli dağ da.
Belə rəhmsizlik edincə dövran,
Qala əhlini də qapladı həycan.
Lakin gizlətdilər bu sözu qəsdən,
O sərv boyludan, o gül bədəndən.
Dedilər: "Eşitsə, yumub gözünü,
Şəksiz, öldürəcək bu qız özünü".
Düşmənsə Fərhadı əsir edərək,

Bir dağ yamacında saxlamışdı tək.
Xosrova muştuluq üçün getdilər,
Onun sərt könlünü məmnun etdilər.
Saqi! Qədəh gətir, düşdüm tavandan,
Pozdu əhvalımı bu qəmli dastan.
Mey ver, ayıqlıqdan olum azadə,
Olsun sərxoşluğum min qat ziyadə.

## FƏRHADIN XOSROV YANINA GƏTİRİLMƏSİ

Bu sevda yolunu keçən müsafir
Edir hadisəni bu yolla təsvir:
Götürüb Fərhadı bir dəstə cəllad,
Xosrovun yanına gətirdilər şad.
Xosrov bu əhvaldan sevindi əlbət,
Bəxş etdi onlara şahanə xələt.
Məcnunu zəncirə çəkdirdi dərhal,
Əl və ayağına vurdurdu qandal.
Bütün əzasını bağlatdı bir-bir.
Sanki divanəyə vuruldu zəncir.
Təbib çağırdılar; verib dərmanı
Gətirdi özünə o natəvanı.
Göz açıb özünü yad yerdə gördü,
Bütün vücudunu zəncirdə gördü.
Uzanmış əcaib bir hal içində,
Başdan ayağadak qandal içində.
Önündə şahanə, gözəl bir qəsir,
Ətrafında qoşun, mülazim, vəzir,
Saray eyvanında durmuş uca taxt,
Üstündə əyləşib şahi-cavanbaxt.
Kəyan taxtı olub ayaqaltısı,
Başında şah tacı, zər parıltısı.
Fərhad təəccüblə baxırdı ona,
Başında min xəyal, gözündə məna.
Gah qısqanclıq verir ona məhəbbət,

Gah da rəqibinə edirdi heyrət.
Tezcə anladı ki, bəlalı tale
Yeni bir macəra eyləmiş vaqe.
Lakin itirməyib əsla başını,
Qalxıb oturaraq çatdı qaşını.
Riayət edərək qayda-qanuna,
Ədəblə baş əydi sağ və soluna.
Ancaq başlamadı öncə söhbətə,
Bu uyğun deyildi çünki adətə.
Verdi bu əzəmət Xosrova təğyir,
Eşq odu könlünə buraxdı təsir,
Ölüm fərmanını tezcə unutdu
Onu bu yol ilə söhbətə tutdu:
Dedi: – "Ey divanə, haralısan sən?".
Dedi: – "Divanələr tanımaz vətən!".
Dedi: – "Nə seçmisən özünə peşə?".
Dedi: – "Rüsvayi-eşq olmaq həmişə".
Dedi: – "Bu peşəylə pul qazanılmaz".
Dedi: – "Eşq oduna yansan az olmaz".
Dedi: – "Eşq odundan de bir əfsanə!",
Dedi: – "Yanmayanda yox bu nişanə".
Dedi: – "Yanmağını nədən bilim mən?",
Dedi: – "Duymaz onu var-dövlət güdən".
Dedi: – "Nə zamandan sövdalısan sən?".
Dedi: – "Vücuduma ruh girməmişdən".
Dedi: – "Bu sövdadan əl çək, kamə yet",
Dedi: – "Bu sözləri burax, tövbə et!".
Dedi: – "Aşiqlərə nə ağır gələr?",
Dedi: – "Hicran gunü, məhəbbət, kədər".
Dedi: – "Bəs onların nədir həyatı?",
Dedi: – "Görüş günü yar iltifatı".
Dedi: – "Çək söz ilə yarın rəsmini!",
Dedi: – "Dil qısqanar desəm ismini".
Dedi: – "Könlün onun eşqinə yurdmu?",
Dedi: – "O eşqdir cismimdəki ruh".
Dedi: – "Arzunmudur canan vüsalı?",
Dedi: – "Bəsdir mənə ancaq xəyalı".

Dedi: – "Qoy özgəyə gülsun o ləblər".
Dedi: – "O gül dodaq yadı zəhərlər".
Dedi: – "O səndə də tutar qoymadı",
Dedi: – "Həm bu idi könül muradı",
Dedi: – "Qorx köksündə aça yüz yara".
Dedi: – "Kaş qəlbimi edə min para".
Dedi: – "Ömrünü puç edər cəfası".
Dedi: – "Canım olsun onun fədası".
Dedi: – "Məhəbbətdən bir fayda yoxdur",
Dedi: – "Eşq əhlinə bu dəxi çoxdur".
Dedi: – "Yaxşı olar eşqi buraxmaq",
Dedi: – "Bu, aşiqdən uzaqdır, uzaq".
Dedi: – "Dövlət verim, olma əsiri",
Dedi: – "Dəyişmərəm xakə iksiri".
Dedi: – "Dağ çəkəcək hicran sinənə",
Dedi: – "Vəsl ümidi bəs edir mənə".
Dedi: – "Şaha şərik çıxırsan, eyvah",
Dedi: – "Eşq yolunda nə dərviş, nə şah?"
Dedi: – "Bax bu işdən üzülər canın",
Dedi: – "Məhəbbətdə kim güdər canın?"
Dedi: – "Ölkə verim, keç bu həvəsdən",
Dedi: – "Xahişini geri götür sən".
Dedi: – "Cəlb edərəm səni edama",
Dedi: – "Yar yolunda çataram kama".
Dedi: – "Ölüm səndən uzaq deyil, bax!",
Dedi: – "Bu sözlərdən ölüm xoşdur, ah!"
Şah neçə çətinə çəkdi xitabı,
O qədər asanca yetdi cavabı.
Fərhadı mərdanə bir natiq gördü,
O danışmayırdı, gövhər düzürdü.
Xosrovun qəlbinə od düşdü kindən,
Tutuşdu varlığı lap qəzəbindən,
Dedi: – "Mənim kimi şaha bu alçaq,
Zəncirlər içində dustaq ikən bax,
Ömrünün ocağı sönürkən belə,
Nə kəskin cavablar qaytarır hələ.
Gərəkdir verdirəm qətlinə fərman,

Ta ki, ibrət alsın gədalar ondan,
Bir də şah yanında duymadan dəhşət.
Bir söz danışmağa etməsin cürət".
Qəzəbli hökmünü verdi o qəddar:
"Qurulsun qalanın önündə bir dar,
Bağlansın Fərhadın ayağı, əli,
Çəkilsin o dara azğın heykəli.
Sonra yaz yağışı kimi biqərar,
Yağsın üzərinə zəhərli oxlar.
Cəsədi bu halda qalsın neçə gün,
Gəlib gedən onu gözüylə görsün.
Gədalar bu işdən ibrət alaraq,
Bir də padişaha çıxmasın ortaq.
Neçə gündən sonra ocaq yandırıb,
Cəhənnəm odu tək alovlandırıb,
Atılsın vücudu həmin odlara,
Ucalsın alovu boz buludlara.
Onu atəşlərdə qovurmaq gərək,
Külünü göylərə sovurmaq gərək.
İstərəm dünyada izi qalmasın,
Ellərdə, dillərdə sözü qalmasın".
Fərhad bu sözlərdən olunca agah
Gülərək söylədi: "Ey qəzəbli şah!
Təsəvvür etmə ki, yetişdin kama,
Çəkdin rəqibini sən intiqama.
Əmrin məqsədimlə tuşbatuş gəlir,
Sevgidə nə çəksəm mənə xoş gəlir.
Çünki arzum idi eşqdə ölmək,
Şükür, muradıma yetirdi fələk!
Səni cövrü-cəfa hirsə gətirir,
Mənə ləzzət verir, mənə ruh verir.
Hicranın hər anı ölümdən betər,
Hər zaman cismimi parçalar, didər.
Sən ki, asılmama verdin fərmanı,
Əzabdan qurtardın mən natəvanı.
Canım nələr çəkmiş həyatda, eyvah,
Odur ki, dar mənə pənahdır, pənah.

Qurtararsa yaxam bu puç dünyadan,
Amansız əzabdan xilas olar can.
Dedin, oxlasınlar, məni hər yandan,
Səni oxlamamış, bilirəm, hicran,
Amma salmış məni yaman dərdlərə,
Oxlamış sinəmi gündə yüz kərə.
Verdiyin o əmr, o şanlı fərman
Qurtarar canımı bəla oxundan.
Dedin vücuduma atəş vurulsun,
Külüm küləklərlə göyə sovrulsun,
Bilirəm, ayrılıq oduyla hələ
Yanmamış cəsədin, dönməmiş külə.
Məni bir atəşə atmış ki, hicran,
Cəhənnəm sərindir qığılcımından.
Sənin hökmun ilə bu işgəncədən
Qurtarıb, behiştə köç eylərəm mən,
Dedin, sovursunlar külümü göyə,
Xəlil peyğəmbər tək çatdım diləyə.
Vücudum torpağı, çox xoşdur məncə,
Bədən məhbəsində zəncirlənincə,
Gül olub qarışsın əsən güləyə,
Məhəbbət havası sovursun göyə.
Ətirli buluda çevrilə, bəlkə,
Cananın başına sala o kölgə.
Hicranla göz yaşı yağdıraraq gah,
Çəkə şimşək kimi eşq əlindən ah.
O şimşək nur sala yar torpağına,
Yağa yağış kimi bağça-bağına.
Nə cəza düşünsə zalım hökmdar,
Mənə ziyanı yox, bəlkə, xeyri var.
Lakin təəccübdür bir natəvanın,
Bir qərib aşiqin, bir yazıq canın,
Qəlbində sevgidən od kükrəyənin,
Fələkdən başına yumruq dəyənin,
Çərxin cəfasına köküs gərənin,
Ümidsiz sevdayə könül verənin
Eşqini eşidib dildən, ağızdan,

Ona rəqib çıxır bir qanlı sultan.
Görmədən dildarı olaraq aşiq,
Özünü qələmə verməkdə sadiq,
Toplayıb başına yüz min əsgəri,
Sıyırıb qınından qılınc, xəncəri,
Canan diyarına salır iğtişaş,
Başdan tac düşürür, bədəndən də baş.
Silahla, sursatla, bu hay-harayla,
Yüz min qan içici azğın alayla
Edib mühasirə tək bir qəribi,
Özünə ad verib onun rəqibi,
Susamış qanına o binəvanın,
Yüz min əziyyətli bir bağrı qanın.
Nə rica yoluyla ram edir onu,
Nə də bir zərbəylə vurur boynunu.
İki daş, şahı bir hala salıbdır,
İki yüz min qoşunla aciz qalıbdır.
Axır hiylələrə, məkrə əl atmış,
Qəribin huşunu başdan oynatmış;
İşlədib min kələk, min cürə tədbir,
Əl və ayağına vurdurub zəncir.
Qandalla bənd vurub hər bir üzvünə,
Yenidən gətirir onu özünə.
Mərhəmət etmədən ondakı hala,
Tutur rişxənd ilə sorğu-suala.
Tənəli sözləri xəncərdən iti,
Xeyli uzun çəkir şahın söhbəti.
Fərhad da verdikcə düzgün cavablar.
Bununla kifayət etmir hökmdar.
Zövq alır yazığın əziyyətindən...
Əhsən bu qaydaya, qanuna əhsən!
Belə bir cəzadan yaxşıdır ölüm,
Heç kim görməmişdir belə bir zülüm.
Lakin məhv etmədən bu möhnət məni,
Yəqin öldürəçək xəcalət məni
Ki, adil şahımız tələlər qurub,
Olur rəqibinə axırda məğlub.

Belə ədaləti qorusun allah,
Belə şücaətə min bərəkallah!
O vaxt ki, bilməzdim nə sevda, nə yar.
Düşüncə taxtında tutmuşdum qərar,
O vaxt ki, çimirdim ağıl nurunda.
Xosrov döyüşümə çıxsaydı onda,
Olsaydı ordusu yüz bunca, heyhat,
Hər biri qantökən, hər biri cəllad,
Ömür tellərini bir-bir üzərdim,
Şaha igidliyi mən görkəzərdim,
Sönərdi içində qürurlu alov,
Şuçaət rəsmini öyrənərdi o.
İndi ki, həm zəif, həm təvansızam.
Bir qərib aşiqəm, xanimansızam,
Yenə də tutmağa tək məni Pərviz,
Bir dəstə atlıyla qalmışdı açiz.
Özün şahidisən, o daş ki, atdım,
Başından taçını necə fırlatdım.
Əgər alnını da alsaydım nişan,
Canın qurtarmazdı əlimdən, inan.
Keçdim o dəstənin qanından haman.
Onlarla birlikdə sənin qanından.
Ölümdən hamıya aman verirkən,
Ölüm mükafatı qazandım, ah, mən!
Artıq həyat gəzir məndən çox kənar,
Könül hicrandansa, ölüm arzular.
Əcəldən yamandır, məncə, ayrılıq,
Bunu bir də demək artıqdır, artıq.
Lakin Çinə tərəf bir külək əssə,
Bu matəm havası oraya yetsə,
Xaqan xəbər tutar avarəsindən,
Ciyər parəsindən, can parəsindən,
Bilər, oğlu nə cür düşdü qürbətə,
Rast gəldi orada yüz müsibətə;
Öldürdülər onu sonsuz əzabla,
Odda yandırdılar min iztirabla,
Kimsəyə çatmadı dadı, fəryadı,

Nə bəlalər tapdı yazıq Fərhadı,
Şübhəsiz, dar olar gözündə aləm,
Başından ağlını alar qüssə, qəm.
Qəzəb qılıncını çəkib mərdana,
Döndərər qoşunu qara dumana,
Xosrov ölkəsinə eyləyər səfər,
İntiqam eşqilə o çalar zəfər.
Çəksə qılıncını Məşriqdə bir an,
Qalmaz dirilikdən Məğribdə nişan.
Yurdun həsrət qalar insan üzünə,
Daşınar torpağın Çinin düzünə,
Silər Mədaini yer kürrəsindən,
Bir qan dəryasına çevirər həmən.
Qalmaz nə taxtdan, nə tacdan əsər,
Mədain yerində küləklər gəzər.
Qalsa da dünyada ancaq bir nəfər,
Onacan hökm edər o yerdə yellər.
Mən günahsız ollam, Xosrov günahkar,
Eylər ölkəsini xaqan tar-mar.
Versəydi çərx mənə yüz min cəfalar,
Əsla eyləməzdim bu sözü təkrar.
Amma ki, Pərvizin nadanlığından.
Dünyanın sabahkı viranlığından,
Qorxaraq sözümü xeyli uzatdım;
Eşidən deməsin qüssəyə batdım.
Bilsinlər sözümü deyib tükətdim,
Canan deyə-deyə cahandan getdim".
Deyib bu sözləri qalaya baxdı,
Yer öpüb ordunun qəlbini yaxdı.
Dedi: – "Nə bilsəniz eyləyin indi,
Ya asın, ya kəsin, fərman sizindi".
Qurtarınca sözü başlandı şivən,
Sürüyə-sürüyə şahın önündən,
Onu gətirdilər dar kənarına,
"Lənət hakimlərin etibarına!" –
Deyən el-obanı götürdü həycan
Ki, ölür günahsız bu böyük insan...

Fələkdən baş verən bu macəralar,
Canan qalasında oldu aşikar,
Əhali Şirindən, Məhindən xəlvət,
Fərhadın dərdilə oldular həmdərd,
Gördülər aşiqin halı xarabdır,
Boynuna bağlanan qanlı tənabdır,
Hər kəsin gözündən axdı ılıq su,
Onunla ölməyi eylədi arzu.
Bu yandan da Xosrov əyanlarilə,
Başında bir böyük şanlı qafilə,
Bu yüksək insana edirdi heyrət;
Kimdə var ondakı mərdlik, cəsarət?
Gözdən yaş axıdıb bütün xəlayiq,
Dedilər: "Ölümə deyil bu layiq".
Xosrov da təəssüf edirdi pünhan.
Lakin necə dönsün öz fərmanından,
İşə qarışmağı vəzir bilib fərz,
Bir kənara çəkib şaha qıldı ərz
Ki: "Onu öldürmək dəyməz heç nəyə,
Zəncirlə dam yetər bir divanəyə.
Zənnimcə, Fərhadın suçu azdır, az,
Həbs etsək, bizə bir ziyanı olmaz.
Doğrudur, başında divanəlik var,
O, idrak yolundan düşübdür kənar,
Lakin sözlərində gülür həqiqət,
Düşünmək lazımdır bir xeyli müddət.
Uca dağ başında ayırıb bir yer,
Orda əl-qoluna vurarıq zəncir.
İki-üç ay tamam dustaqda qalsın,
Üstünü neçə yüz keşikçi alsın,
Sözündə doğruluq olarsa peyda,
Eyb etməz, sağ qalsın bu dərdli şeyda.
Əgər ki, sözləri çıxsa yalana,
Hər nə lazım isə eylərik ona".
Ağıllı vəzirin dediyi sözdən
Xosrov razı qaldı nə qədər desən.
Var idi yaxında ən uca bir dağ,

Qaldırmışdı göyə başında bayraq.
Üstündə bir qala tutmuşdu qərar,
Ora salınardı cani olanlar.
Div bina etmişdi onu, elə bil,
Odur ki, olmuşdu adı Səlasil.
Səlasil qalası məşhurdu eldə,
Gəzirdi şöhrəti ağızda-dildə.
Fərhadı o yerdə həbsə saldılar,
O gündən qalada keçirdi ruzgar.
Dörd-beş yüz gözətçi sardı o dağı,
Əhatə etdilər tək bir dustağı.
Saqi! Sərxoş eylə, gəl məni sən də,
Zülfün vücudumu salsın kəməndə!
Bəlkə, o zəncirə düşdüyüm zaman,
Bədən zəncirindən xilas ola can.

## FƏRHADIN SƏLASİL QALASINA SALINMASI

Bu səhra içində aqil huşimənd,
Söz divanəsinə belə vurdu bənd:
Ki, Fərhad qalaya edincə səfər,
Sardı zindanını tez gözətçilər.
Qumla almaz tozu səpib yoluna,
Keşik çəkirdilər növbətlə ona.
Xosrov əmr etmişdi bunu lap erkən,
O qaçsa, xəbərsiz keşikçilərdən,
Kiminin boynunu vurduracaqdır,
Kimini qayadan uçuracaqdır.
Onlar bu əmrdən düşüb təşvişə,
Keşik çəkirdilər ona həmişə.
Amma dinlədikcə ahu zarını,
Ahında səslənən intizarını,
Tədricən oldular Fərhada vurğun;
Elə bil Leyliyə vuruldu Məcnun.
Gizlin elmlərə aşina Sokrat,
Vermişdi Fərhada xeyli təlimat.

Bu sirli fənlərdən deyirlər, biri
Əfsunla açmaqmış bəndi, zənciri,
Sarınsaydı biri yüz min yerindən,
Onu qurtarardı sarıqdan bu fənn...
Yolunda rast gəlsə yüz bəndli insan,
Bəndi açılardı hamının o an.
Bu sirli əfsunu bilən hər insan.
Tez xilas olardı həbsxanadan.
Edərdi əmrinə sehri itaət,
Müyəssər olardı ona ibadət.
Gecələr yarıdan ötəndə bir-bir
Fərhad qapıları edərdi təsxir,
Keşikçi sezmədən çıxardı seyrə
Çiçəkli dağlara, yaşıl çöllərə,
Çarpdıqca köksünü daşlara naçar,
Dağların gözündən axardı yaşlar.
Sancdıqca bağrına nalə xəncəri,
Sönərdi köksündə qəm atəşləri.
Çəkərək dağlarda yüz nalə, fəryad,
Qılınclar vuraraq köksünə Fərhad,
Qayıdardı həbsə sökülməmiş dan,
Ellər ayılmamış öz yuxusundan,
Bəlalı aşiqim eldən-obadan,
Bəndi açmağını tutardı pünhan.
Bir kimsə bu haldan xəbərdar olsa,
Bilirdi Xosrovdan alar min cəza.
Şah sorub yerinə yetməmiş tamam,
Edərdi o şəxsi bir anda edam.
Axır keşikçilər duydu bu sirri,
Onun arzusunun olub əsiri,
Bildilər Fərhadı saxlamaq olmaz,
O bir quşdur edər hər yana pərvaz.
Lakin özgələri salmayıb kirə,
Bağlatmış özünü burda zəncirə.
Dedilər Fərhada: "Ey şəxsi-nadir!
Müqəddəs bir işıq üzündə zahir;
Bu zəncir içində bilmirik ki, sən

Nədən Səlasildə tutubsan vətən?
Biz tək adamların yüzünün canı,
Sənin bir tükünün olsun qurbanı.
Allaha tapşırıb biz fəqirləri,
Çıx dolan ürəyin istəyən yeri.
Qoy bizə yetişsin şahın qəzəbi,
Təki, sıxılmasın Fərhadın qəlbi".
Fərhad cavab verdi: "Ey natəvanlar,
Taleyi mən kimi qara olanlar,
Bu hal baş verərmi əhli-vəfadan,
Xüsusən, mən kimi bir mübtəladan,
Ki, əməl bağlayıb, şövqə, muraza,
Neçə yüz məhzunu verəm güdaza".
Onlar istərdi ki, seyr edə Fərhad,
Fərhad da istərdi onlar ola şad.
Gözlər işıq alıb nurlu üzündən,
Zövq alardı hər kəs şirin sözündən.
Axır bir nöqtəyə çatdı vəziyyət,
Yarandı arada dostluq, məhəbbət.
Fərhadı tam azad buraxdı onlar,
Lakin o uzağa etməyib güzar,
Canan qalasına tərəf gedərdi,
Bir an qarşısında xəyal edərdi...
Birdən eşq atəşi çəksə zəbanə,
Başlardı o zaman aha, fəğanə.
Qoyardı zindana tərəf yenə üz,
Yel kimi keçərdi gah dərə, gah düz.
Ona divanəlik etdikcə əsər,
Olmazdı başından əskik vəhşilər.
Vəhşilər sultanı Süleyman kimi
Oldu dilsizlərin yaxın həmdəmi...
O qədər şöhrəti və şanı vardı
Ki, quşlar üstünə kölgə salardı.
Vermişdi eşq ona elə şərafət,
Qılırdı önündə şirlər itaət.
Hərdən bir aslana süvar olurdu,
Qalan vəhşiləri sanırdı ordu.

Görüb pələngləri fikrə dalardı,
Canan itlərini yada salardı.
Qurda ərz edərdi olan əhvalı,
Yaşla islanardı Yusif cəmalı.
Hiyləgər tülkünü tutardı dilə
Ki, yar itlərinə gəlməsin hiylə.
Qolunu boynuna salıb ceyranın,
Deyərdi: – "Bənzəri budur cananın".
Dağlar maralının sevib boynunu,
Sorardı onlardan öz ahusunu.
Dovşan ki, gözləri açıq yatardı,
Bu ona yarını xatırladardı.
Keyik yürüşünə baxdıqca Fərhad,
Canan yürüşünü eyləyərdi yad.
Deyərdi humaya: – "bir xəyal kimi,
Apar yar itinə sümüklərimi".
Öpüb qanadından göyərçinlərin,
Deyərdi: – "Naməni yara yetirin".
Uçsaydı qırqovul önündə nagah,
Uçardı köksündən hicranlı bir ah.
Qara qarğalara deyərdi zar-zar:
"Canan saçlarının sizdə rəngi var".
Tutini sorğuya tutardı bəzən:
"Nitqi o yardanmı öyrənmisən sən?"
Basaraq bağrına qara tərlanı,
Söylərdi qəlbini yaxan bəlanı.
Görüncə qumrunu artardı dərdi,
Ona öz qəmini bəyan edərdi.
Nə işlər gəlibsə dərdli başına,
Rəvayət eylərdi hop-hop quşuna.
Söylərdi halını şeyda bülbülə:
"Məhəbbət odunda dönmüşəm gülə".
Göydə yarasalar çığrışan zaman,
O, yar cəfasından açardı dastan.
Verib yüz nəğməylə leylayə peyğam,
Hicran söhbətini söylərdi tamam,
Nə vaxt ki, gün şərqə işıq yayardı,

O da öz köksünü parçalayardı.
Baxıb şərqə tərəf başlar fəğanə,
Çəkərdi bülbüllər kimi təranə,
Deyərdi: – “Ey səhər, eşqə düşən mən,
Bəs nədən yaxanı cırmadasan sən?
Günəşin halıma var oxşayışı;
Solğun çöhrəsindən axır göz yaşı.
Sənin də ürəyin yanır mən kimi,
Ahım tək soyuqdur səhər nəsimi.
Canındanmı bezdin hicran əlindən,
Ki, ahın seçilmir sabah yelindən.
Ey səhər, “Sən kimi yanıram”, – desən,
Nədir o qığılcım, o duman, o çən?
Sən ki, dərd əhlisən, gəl mənə rəhm et,
Fəryadımı eşit, imdadıma yet.
Səhər gülüstanda güllər açanda,
Gül üstə sünbüllər ətir saçanda,
O sərv qamətlim bir dəstə qızla
Çıxsa gül yığmağa işvəylə, nazla,
Yetirsin ahımı yara saf mehin,
Axan göz yaşımı andırsın şehin”.
Günün ilk şəfəqi ərzə düşəndə,
Deyərdi: – “Dərdimi nurlandır sən də.
Bilirəm, mənim tək eşqə yanırsan,
Onunçün bu cürə alovlanırsan.
Bəlkə də, mənim tək arzudan uzaq
Gəzirsən, gözündən yaş axıdaraq.
Bəlkə, fələkdəndir mən tək əzabın,
Onunçun yanaraq tükənir tabın.
Desən ki, ayrılıq görməmişəm mən,
Bəs nədən sarılıq yağır üzündən?
Cünunluq, oduna tökməyirsə yağ,
Nədən axşam-səhər olmuş yerin dağ?
Məntək deyilsənsə qayğu içində,
Nədən gah oddasan, gah su içində?
Hər bir nişanədə həmdərdsən mənə,
Qəlbi möhnətlilər sığınsın sənə.

Yolun düşsə yarın pəncərəsindən,
Bəxt kimi gir evə, nəzər yetir sən.
Mehribanlıq göstər, hörmət əyan et,
Mənim yanmağımı ona bəyan et.
Üzümün rəngini rəngində göstər,
Qəm qoşunum qədər dağıt zərrələr".
Səhər çevrilənə qədər gündüzə,
Gah onu, gah bunu tuturdu sözə.
Günəş yüksələndə uca dağlara,
Dönürdü aşiqim əsən ruzgara.
Ahı andırırdı al şəfəqləri,
Sanki sökülürdü qızıl dan yeri.;
Yer dəhşət duyurdu səmum ahından,
Odundan qorxurdu yeddi asiman.
Ayağına batan hər kəsək, hər daş,
Ayağı üstündən çıxarırdı baş.
Çırparaq köksünü qayalıqlara,
Edirdi bağrını hey para-para.
Açırdı cismində eşqin xəncəri
Yaralar üstündə yara izləri,
Vururdu qəlbinə o çərxi-namərd
Kəmənd üstdən kəmənd, bənd üstdən də bənd.
Ələm səhrasında ağladıqca zar,
Ağlardı onunla quşlar, balıqlar.
Matəm qılıncını hər endirəndə,
Yarğanlar açırdı dağda, çəməndə.
Ahının xəncəri açdığı yara
Yurd olurdu dərdə tutulanlara.
Qayalar ahından sınar, tökülər,
Yüz parça olardı tunc qranitlər.
Göz yaşı selləri axıb düzlərə.
Açırdı yolunda yüz dərin dərə.
Sinəsindən qalxan tüstü, şərabə,
Dönürdü buluda və şimşəklərə.
Ahıyla yumşaldıb bütün dağ-daşı,
Olmuşdu onların qüssə yoldaşı.
Könül fəryadını edərdi təkrar

Sıldırım qayalar, dumanlı dağlar.
Şəfəqdən rəng alan qırmızı lalə
Olmuşdu əlində qanlı piyalə.
Onu ağzınacan dolduraraq hey,
İçirdi durmadan şərab peyapey.
Bu şərab Fərhadın qanlı yaşıydı,
Yaxud saf ləl idi, yaqut daşıydı.
Saqi! Bir çam yetir asiman kimi,
Olsun gülgün meyin rəngi qan kimi.
Badə tapılmazsa, tök zəhər, ya qan,
Bu hicranlı həyat yamandır, yaman!

## FƏRHADIN AĞIR DUSTAQ HƏYATI

Bu qəm məçlisində şərab paylayan
Belə zinət verib məclisə hər an:
Möhnət dəryasının böyük nəhəngi,
Bəlalər dağının igid pələngi,
Cünun vadisindən, divanələr tək,
Cilovsuz at kimi baş alan külək,
Əzab dəryasından badələr içən,
İztirab dağından şüursuz keçən,
Zillət kahasında yatan əjdaha,
Qəm camında zəhər nuş edən dəha,
Qəlbi hicran ilə qəm atəşgahı,
Yüz ocaq yandıran hər könül ahı,
Ahıyla aləmə qaranlıq salan,
Muradı sübhündən gecə ayrılan,
Göyə göz yaşıyla göstərən imdad,
Ümid qəsrin edən sel ilə bərbad,
Hicran gecəsinin bir dərdinakı,
Sevda yollarının yazıq həlakı,
Tale qılıncına sinə gərən zat,
Yəni bəxti qara, bəlalı Fərhad,
Bu sonsuz hicrana tutulan zaman,
Ayrılıq dərdinə tapmadı dərman.

O gündən yar oldu ah ilə zara,
Keçdi bu surətlə ruzgarı qara.
Axşam da inləyib sabaha qədər,
Qopdu sinəsindən odlu nalələr.
Deyirlər, çəksən də gündüz yüz fəqan,
Bir gecə fəryadı yamandır ondan.
Bu hicran çağında ona hər axşam,
Toxuyardı əzab, zülfilə bir dam.
Zülmət ölkəsinin hər gecəsində
Düşməzdi yadına vətəni Çin də.
Qaranlıq aləmə çəkib qara rəng,
İntizar əhlini eyləyər diltəng.
Odur, zülmət gəzir göyləri sərgəş,
Görünmür aləmə can verən günəş.
Ziya İskəndəri düşmüş səbrdən,
Kəsmiş ümidini Xızri-kəbirdən.
Göylər yandıraraq, sanki cahanı,
Külüylə qaranlıq etmiş havanı.
Bəlkə də, kül deyil, hisdir bu zülmət,
Aləm hislə vermiş özünə zinət.
Bu zülmət Zərdüştün ocaqlarından
Qalxan tüstüdən də yamandır, yaman.
Ulduzlar elə bil bərkinmiş göyə,
Durmuş səyyarələr, sabitik deyə.
Fələk qatır kimi palçığa batmış,
Əl-qolun sallayıb, rahətcə yatmış.
Özünü kor bilib gözlülər də həm,
Qapqara yuxular görməkdə aləm.
Gizlənmiş daryada balıq, göydə quş,
Gecə canlıları dünyanı tutmuş.
Sanki eyləmişdir gün canını tərk,
Onu dəfn etmişdir yerə kəc fələk.
Əza saxlamağı qılıb bəhanə,
Qapqara bir libas geyib zamanə.
Həsrət çəkənlərə səmadə ülkər.
Etmiş şüasını bir iti xəncər,
Bir sürmə çəkmişdir şum səhərçağı.

Qaradan seçilmir gözünün ağı.
Gözlər o sürmədən elə olub təng
Ki, aləm görünür ona sürmə tək.
Ah, bu uzun gecə, bu qara zülmət
Məhşər günü kimi tapmır nəhayət,
Yenə yarasalar avaza gəlmiş,
Bir şikar eşqiylə pərvaza gəlmiş.
Qonub göy qübbəyə bayquşlar yüz-yüz,
Görünər gözünə hara tutsan üz.
Keçə tüstüsündə gözdən yayınır,
Gözləri ulduz tək alışır, yanır.
Buna gecə demə, de qəm zindanı,
Vardır bu zindanda yüz möhnət kanı.
Fərhad ayrılıqdan düşmüşdü dərdə,
Canından usanmış, halı pəjmürdə.
Dərdi əsər edib asimanlara,
Edir öz köksünü göy də yüz para.
Qəsd edir çanına qara bir duman;
Belə sərt gecəni görməsin insan!
Məşəqqət daşından əzilmiş başı,
İncimiş başından məşəqqət daşı.
Dağları gəzməkdən ayağı qandır,
Ayağı qanından dağ al-əlvandır.
Əzilmiş vücudu qəm pəncəsində,
Həsrətin, hicranın işgəncəsində,
Tükənib bitmişdir taqəti, səbri;
Bir sümük qalmışdır, bir də bir dəri.
Ərimiş vücudu olmuş bir fanar,
Vücud fanarında can şami yanar.
Kədərlər almışdır tale daşından,
Olub parça-parça, bəlkə də, şan-şan.
Onu çox incitmiş qəzavü qədər,
Açmış qəm dağına çarpaşıq izlər.
Ruh uçub göylərə, dayanmış ürək,
Baş düşüb kəmərə ölmüş ilan tək.
Üzmüşdür cismini əcəl xəncəri,
Görmuş dönə-dönə ölüm məhşəri.

Anbaan başını çırpıb daşlara,
Yaralar üstundən açmışdır yara.
Cismində o qədər qızdırması var
Ki, atəş görərsə, təskinlik tapar.
Vücudu torpağa düşsəydi belə,
Torpaq həmin saat dönərdi külə.
Hər dəm əldə edib bir cür bəhanə,
Onu torpaqlara salır zəmanə.
Qızğın dodaqları qabarcıqlıdır,
Ağzı zəhər dadır, zəhrimar dadır.
Təlxikam etməyə onu hər zaman,
Zəhərlər tökülür çarxın ağzından.
Bu möhnət geçəsi öz adətiylə
Onu yükləyirdi yüz möhnət ilə.
Hicran qoşunları axın edərək,
Başının üstündən keçirdi sel tək.
Min bəla görünür, hər dəm gözünə,
Bir saat gəlmirdi ağlı özünə.
Nə zaman əhvalı olsaydı bərbad,
Yanıqlı bir səslə edərdi fəryad:
“Ey zülmkar fələk, ey kinli qəza,
Vücudum xakini döndərdin toza.
Varmı zülm etməkdə sənə bərabər,
Bunca cəfa etmək yetməzmi məgər?
Əcəl qılıncını tez siyirəydin,
Məni bir vuruşda yerə sərəydin.
Bir qərib, bir xəstə deyilmiyəm mən?
Dərd çölündə Məcnun deyilmiyəm mən?
Bir allah bəndəsi düşərsə dərdə,
Ona nəzər salan başqa nəfərdə
Gərək kərəm olsun, rəhm olsun bir az,
Yoxsa, min bir cəfa etmək yaraşmaz.
Söylə, abrın, həyan haraya getdi?
Qızğın məhəbbətin sonamı yetdi?
Neçə belə gecə görəcəyəm mən?
Çıxacaq hər dəfə can bədənimdən?

Nə yaman gecədir, görmür göz-gözü!
Sanki qara gəlmiş ömür gündüzü.
Bu gecə qoynunda min qara div var,
Onlara yem etdin məni aşikar.
Yoxsa, gərdişdənmi yorulub qaldın?
Və ya bəxtim kimi yuxuya daldın?
Hanı hər günkü tək xuramın sənin?
Diləklər mədəni axşamın sənin?
Bəlkə, mən atanda nalə oxların,
Ondan zədələnmiş sərt ayaqların?
Ölmüş deyilsənsə bir tərpən, fələk!
Səhər müjdəsini gətirsin külək!
O aydan ayrıldım, halıma rəhm et.
Zülmət gecəsində bir dadıma yet”.
Bu halda ay doğub ərşə ucaldı,
Gün kimi dünyaya bir şölə saldı.
Fərhad görüb onu qalxdı yerindən,
Ay kimi ayılıb yer öpdü həmən.
Dedi: – “Ey gecəmi çilçıraq edən,
Ölüm saatında dadıma yetən,
Nə olar rəhm edib canımı alsan,
O yarın kuyində torpağa salsan.
Məni sürüklərkən əcəl məzara,
Axır salamımı yetir sən yara”.
Diqqətlə göylərə nəzər salarkən,
Ütarid gözunə sataşdı birdən.
Dedi: – “Ey dostların halın nəqş edən,
Göylər varağında qələm işlədən!
Nə olar, bir qara mürəkkəblə sən
Başımdan keçəni təsvir eyləsən?
Günəş qərq edəndə səni nuruna,
Qəmimdən bir kitab bağlasan ona”.
Görüncə Zöhrəni fəğan edərək,
Əyib qamətini çənkü kəman tək,
Dedi: – “Ey dünyaya fərəh göndərən,
Nəğməsi qəlb açan, ruha dad verən!

Şənlik ahəngini dayandır bir az,
Qoy mənə yas tutsun sinəndəki saz.
Canan məclisində olsan nəğməxan,
Həlak olmağımı yara et bəyan”.
Boş görüb dördüncü günəş bürcünü,
Dedi: – “Ey uca göy, sən o şux günü
Nazlı günüm kimi niyə gizlətdin,
Hicran geçəsini hüdudsuz etdin?
Göstər günəşini, nurlansın hər yer,
Mənim də ayrılıq gecəmə son ver!”.
Görüb beşinci burc qəhrəmanını,
Söylədi Mərrixə öz hicranını:
Ey mərdlik, ey döyüş eyləyən şüar,
Qılınc oynadanda nər qəhrəmanlar,
Et öz qılıncını qanımla rəngin,
Bu həyat qeydindən ver mənə təskin.
At cansız cismimi rəhgüzərinə;
Qoy ətim yem olsun yar itlərinə”.
Süzüb Müştərini altıncı qatda,
Dərdini ona da söylədi hətta:
“Ey şərəf bürcündə aşiyan tutan,
Səadət taxtına, tacına sultan,
Dua et, tanrıdan alım bir murad,
Möhnət gecəsindən tez olum azad.
Vüsal səhərinin nurları yetsin,
Həsrət axşamının dumanı getsin”.
Yeddinci bürcə də sataşıb gözü,
Zühəl ulduzuna dedi bu sözü:
“Ey qürur dənizi, ey vüqar dağı,
Sən də bacarırsan ruh oxşamağı.
Vüçudun ağırdır hicran dağı tək,
İnsan səbri kimi yüruşun də ləng.
Ayrılıq canımı almışdır, heyhat!
Mənə dərd çəkməyə səbat ver, səbat!”
Tapsaydı dürrünə bir özgə mücrü,
Tutardı sorğuya o yeni bürcü.

Hər bürcdən sorardı öz dilbərini,
Səadət günəşi, bəxt ülkərini.
Doqquzuncu bürcə sataşdı gözü,
Sabit ulduzlarla başladı sözü
Ki: "Ey göz yaşıma bənzər ulduzlar,
Olun göz yaşım tək sizlər də səyyar.
Bir gözəl eşqində düşüb avara,
Bu məhzun könlüm ki, oldu yüz para,
Demirəm hər biri bir ovuc qandır,
Ömrün gül çağından qalan nişandır.
Eşidin bu sevda avarəsini,
Alın hər biriniz bir parəsini,
O yarın kuyinə güzar eyləyin,
Başına gül, çiçək nisar eyləyin.
Gül yarpağı tökün siz asimandan.
Yox, yağış yağdırın üstünə qandan!
Onun ki, həsrəti almış canımı,
Bari qanım tutsun o cananımı".
Qəm-qüssə əlindən edib şikayət,
Çəkib sübhə qədər sonsuz əziyyət,
Bu yaman dərdlərdən aman eylədi,
Qiyamət qoparıb fəğan eylədi.
Özünə verdiyi bunca əzabdan,
Düşüncə taqətdən, düşüncə tabdan,
Qəşş edib yıxıldı... üstündə aləm
Qaralar geyinib saxladı matəm.
Ulduzdan göz yaşı tökdü fələklər,
Cırdı yaxasını nazənin səhər...
O qəm gecəsində can etdi fəda,
Günün doğmağından artıq nə fayda?
Bumu ədalətin, qocaman fələk!
Zəhərləyib, sonra verirsən tiryək.
Gətir, saqi, mənə can tiryəkini,
Yaşamaq sevdası bürümüş məni.
Yox, hicranla keçən ömür-gün yetər,
Tiryəki at yerə, zəhər ver, zəhər!

## FƏRHADIN ZİNDANDA SƏRBƏST HƏYATI

Qəmlə qələm çəkən bu səhifəyə,
Qüssədən yaratdı belə hekayə:
Fərhad öz-özünü bilmədən bir an,
Bəla zindanında sürəndə dövran,
Onun gizli sirrə yol tapmasından,
Xəbərdar olmuşdu hər bir nigahban
O heçlik bürcündə ulduz tək yanar,
Vəfa sədəfində dürr kimi parlar;
Muqəddəs məşəldən əxz eyləmiş nur,
Könlü kəramətdən rövşən olubdur.
Açar hər qandalı o istəyəndə,
El yolunda salmış özünü bəndə.
Onu keşikçilər edəndə azad,
Oldu bu əhvaldan könülləri şad.
Lakin uzaqlara salmayıb güzar,
Fərhad yaxınlarda gəzib dolanar.
Çünki bundan xəbər tutarsa Pərviz,
Onların qanını tökərdi, şəksiz.
Əfsus ki, Fərhadın bənddən xilası,
Gözətçilər ilə dostluq binası,
Hökmü pozmaları bu yolla bir-bir,
Oldu başdan-başa Xosrova zahir.
Öncə tutmaq üçün onlara divan,
Hökmün qılıncını çəkdi qınından.
Sonra bu əhvaldan olub xəbərdar,
Gördü ki, cəzadan ona xətər var.
Belə sahibdilə yanaşsa qafil,
Tanrı eylər onu, əlbəttə, zail.
Fərhadın halına nəzər salanda,
Qəribə fikirlər oyandı onda.
Bildi el yolunda bu mərd sərsəri,
Qorxunc intiqamdan durmazdır geri,
Dedi: – "Məsləhətdir yumub gözümü,
Tamam bilməzliyə qoyum özümü".

Elə ki, dustağı qandallı gördü,
Onunla özünə təsəlli verdi.
Deyirlər o gün ki, yazıq Fərhadı
“Adil” şah məkrlə tutub bağladı,
Gərərək köksünü dərdə, bəlayə,
Şapur da özünü saldı cəfayə,
Rahətlik görmədən öz yatağında,
Cismi külə döndü dərd ocağında.
Ucaltdı naləni asimanlara,
Daşla sinəsini etdi yüz para.
Gəzib ağız-ağız çatdı hər elə
Ki, Pərviz işlədib yüz cürə hiylə,
Tutmuş xəyanətlə bir vəfadarı,
Qurdurmuş Onunçün intiqam darı;
Görməkçin meydanı rəqibdən xali,
Onu məhv etməkdir fikri, xəyalı.
Onun dəfi üçün yüz çarə etmiş,
Yerindən, yurdundan avarə etmiş.
Bildilər ki, Fərhad gərdənində bənd
Nə yolla eyləmiş şahlara rişxənd.
Xosrovun nə yolda olmuş xitabı,
Necə vermiş ona Fərhad cavabı.
Bu acı sözləri eşidincə şah,
Yenidən qətl üçün hökm etmiş, eyvah!
Fərhad bu hökmə də qoymamış məhəl,
Onu sarsıtmamış bu vaxtsız əcəl.
Onun şah nəsilli, xaqan nəsilli,
Olduğu, söhbətdən olmuşdur bəlli.
Xalq içində böyük ad-sanı varmış,
O, söz gəzdirməkdən uzaq qaçarmış;
Odur ki, el ona bəsləyir hörmət.
Oyanmış qəlblərdə Xosrova nifrət.
Vəsfində şairlər yazıb şerlər,
Müğənnilər ona mahnı deyirlər.
Dərd əhli ah çəkib çox aşiqanə,
Müğənnilər kimi edir təranə.
Fərhadın can yaxan möhnəti bir-bir

Nəğməyə çevrilir, dillərdə gəzir.
Xosrov tutmuşsa da o mərd insanı,
Söhbət əsnasında qaralmış qanı.
O gündən Fərhadı gözlə görən yox,
Öldümü, qaldımı, – xəbər verən yox.
Bu sözlər dillərdən dillərə keçdi,
Axır Banuya da gəlib yetişdi.
Dadına çatmadı nə ağıl, nə hiss,
Göz yaşı içində qaldı köməksiz.
Çox əzab çəkirdi bu işdən Məhin
Ki, xəbər tutmasın ayüzlü Şirin.
Bilirdi bu sözlər çatsa ol aya,
Verəcək ömrünü tezcə fənaya,
Onsuz da qəmgindi o nazikbədən,
Xəbərsiz kimiydi hər an özündən.
Qəlbinə damdı ki, o qərib əsir
Düşmənlər əlində olmuş dəstigir.
Cismini ipəklə gizlədən kimi,
Şirin də gizlətdi kədəri, qəmi.
Sirrini etməyib heç kəsə elan,
Yandı için-için ah alovundan.
Bu hicran ahının tüstü-dumanı,
Zülmətə qərq etdi bütün cahanı.
Bir gün dərdi, qəmi başından aşqın,
Hicran dəryasında qalmışdı şaşqın.
Könlü ayrılıqdan xeyli sınıqdı,
Darıxıb sarayın damına çıxdı.
Ki, təmiz havada bir nəfəs alsın,
Bir az qönçə kimi könlü açılsın.
Çatdı qulağına bir yanıqlı səs,
Qüssə nəğmələri oxurdu bir şəxs.
Bu nəğmə Şirinə eylədi əsər,
Yenidən könlünü etdi mükəddər,
Onun sözlərilə maraqlanaraq,
Diqqətlə nəğməyə asırdı qulaq.
Bir qəm dünyasıydı hər misra, hər beyt,
Fərhad dastanını etmədəydi qeyd.

Fərhad nə görmüşsə namərd fələkdən,
Xosrov işlətdiyi min bir kələkdən,
Xülasə, baş vermiş hər macəradan,
Bəhs edib, söz açdı həmin nəğməxan.
Bu qəmli nəğməni eşitdi dilbər,
Elə bil, bağrına saplandı xəncər.
Çəkdi ürəyindən elə güclü ah
Ki, söndü aləmə nur verən çıraq.
Döydü öz-özünü o birdən-birə.
Çırparaq başını yerlərdən yerə.
Göz yaşı selindən yarandı yüz göl,
Sarı gül üstünə tökdü qızılgül.
Qandan xına yaxdı hər şux barmağı,
Döndü kəhrəbayə yaqut dodağı.
Gözlərində coşan qanlı göz yaşı,
Axdı yanağının qanına qarşı.
Cırdı əynindəki ipək libası,
Sanki parçalandı gülün yaxası.
Onun hər yerindən qan axdığından,
İpək paltarları oldu əl-əlvan.
O öz yaxasını cırıb töküncə,
Göründü gül üstə iki tər qönçə.
Qönçə yox, bənzərdi iki peykana;
Köksü qəm oxundan almış nişana.
Soyuq ahlarının gülgün şəbnəmi,
Olmuş nərgiz gözün al rəngli nəmi.
Sünbül saçlarını töküb gül üstə,
San geçə zülməti düşüb gün üstə.
Ayı, günü örtən o zülflər də
Çəkmiş çöhrəsinə bir qara pərdə.
Üzündə göz yaşı olmuşdu buxar,
Ona od vurmuşdu ətirli saçlar.
Ayüzlü o qədər ah-nalə qıldı,
Axırda qəşş edib yerə yıxıldı.
Banuda qalmayıb qərar, ixtiyar,
Onun başı üstə ağlarkən zar-zar,
Şapur-o, yüz bəla görmüş cahandan,

Onların dadına çatdı nagəhan.
Sevincdən axaraq gözünün yaşı,
Yer öpüb, diz çökdü Banuya qarşı.
Dedi: – “O göy taxtlı, ulduz süpahlı.
Şahanə simalı, ismət pənahlı,
Yəni ki, məhəbbət mülkünün şahı,
Bəla göylərinin nurlu səyyahı,
Şah ilə şah olan, dərvişlə dərviş,
Xəstə qərib Fərhad, etməyib təşviş,
Düşmən tələsinə şikar olanda,
Bir şeytan məkrinə düçar olanda,
Şükürlər olsun ki, o tor quranı,
Cildini dəyişib şikar vuranı,
Bir böyük daş ilə eylədim candan,
Cəhənnəmə sarı tez oldu rəvan.
Fərhad gözlərimdən getdiyi gündən
Ağlar guşələrdə saldım yurd, məskən.
Cürətim çatmadı dadə yetməyə,
Onu fəlakətdən xilas etməyə.
Dünənki günədək düşərək dərdə,
Dolanıb gəzirdim xərabələrdə.
Qalada qalmaqdan gəlib zinhara,
İstədim buradan çıxam kənara,
Xeyli dolaşaraq uca hasarı,
Nəhayət, qaladan çıxdım dışarı.
Gəzib axşam, səhər mən oymaq-oymaq,
İstərdim Fərhaddan alam bir soraq.
Pərviz ordusuna yanaşıb axşam,
Tutub hər dəstənin yanında aram,
Gəzib məclisləri, qəmxanələri,
Dinlədim söylənən əfsanələri.
Görünür, bitmişdir fələk nifaqı,
Çatdırmışdır sona bu ittifaqı.
Eşitdi qulağım bu gün nagəhan,
O qərib xəstədən, xanımansızdan
Ən yeni xəbərlər gəzirdi eldə,
Min şayiə vardı ağızda, dildə.

Suala tutdumsa orda hər kimi,
Sözləri düz gəldi durnalar kimi.
Aşikar oldu ki, o hələ sağdır,
Daim seyrəngahı səhra və dağdır.
Onu qorxutmayır rəhmsiz yağı,
Olmuş yad gözlərin nurlu çırağı.
Duyub görkəmində qüdsiyyətdən iz,
Onu öldürməkdən çəkinmiş Pərviz.
Amma söyləmiş ki: "Ey böyük insan,
O yerdən bir addım kənara çıxsan,
Səni zəncirlədib, gözətçiləri
Odda yandıraram mən diri-diri".
Bu qorxu üzündən Fərhad şikəstə,
İstəməz bir kəsə özünün üstə
Xosrovun tük qədər qəzəbi yetsin,
Bir kəsin qətlinə baislik etsin.
Onunçün o dağda, istər-istəməz,
Dolaşıb uzağa getmək istəməz.
Elə ki, əhvalı öyrənib bildim,
Öncə hüzuruna xəbərə gəldim.
Bildim camaatın yalan sözündən
Ki, çox söz uydurur onlar özündən,
Fərhaddan daha çox Banu çəkir qəm.
Bir matəm evidir gözündə aləm.
Bildim ki, gözəllər şahı Şirin də
Qalmış qəm dağları rəhgüzərində.
Dedim, qoy sevinsin o qönçəyi-tər,
Şeyda bülbülündən gətirdim xəbər.
Sizin də sözünüz varsa Fərhada,
Yetirrəm yerinə necə olsa da.
Nədir Fərmanınız bu sadiq qula,
Bir sözünüz yoxsa, düşümmü yola!".
Məhinbanu ona cavab verərək,
Dedi: – "Ey özü xoş, sözü mübarək,
Xeyirxah ağzından çıxan hər kəlmə,
Yaralı könlümçün döndü məlhəmə.
Fərhad hicranından olmamış azad,

Qəlb sənin hicrinlə çəkər oldu dad.
Şükür, gözlərimiz gördü üzünü,
Elə bil, görürük onun özünü.
Əgər gedər olsan, çox sözümüz var,
Nə yerlərə sığar, nə göylər tutar”.
Sonra söhbət açıb o gülbədəndən
Dedi: – “Heç bilmirəm qəşş etmiş nədən?:
Deyib ağlaşdılar həm o, həm də bu,
Məhzun Şapur ilə şikəstə Banu,
Olub-keçənləri yad eylədilər,
Fələyin zülmündən dad eylədilər.
Söhbət açmaqdaydı Şapur Fərhaddan,
Məhinbanu isə şux pərizaddan.
Bu qəmli dastana sərf oldu çox vaxt,
Lakin ayılmadı Şirin qarabaxt.
Burnuna ətirlər tutub dəmadəm,
Onu da şüura gətirdilər həm.
Göz açıb görüncə Şapuru məhzun,
Düşdü xatirinə sevdiyi məcnun
Qopdu sinəsindən bir elə əfğan,
Ahından od tutub alışdı dövran.
Dedi: – “Söylə, Şapur, öz macəranı,
Niyə tək qayıtdın bəs Fərhad hanı?
O gün ki, ayrılıq üz verdi mənə,
Eşqimin sazını tapşırdım sənə.
Hanı əmanətim, söylə bir bunu?
Bumudur dostluğun qayda-qanunu?
İstəsən, ölməyim bu həsrətlə mən,
Bir xoş xəbər danış o sevgilimdən.
Tez söylə, yubansan çıxacaq canım,
Yəqin bil, boynunda qalacaq qanım”.
Məhinbanu dedi: – “Ey cismimdə can,
Qəlbim qüvvət alır gül dodağından,
Bir az iztirabın taparsa təskin,
Xeyli söz danışar bizim bu miskin.
Könlün hər birindən yüz sevinc alar,
Həm əski, həm yeni yaran sağalar”.

O göylər günəşi bunu eşitcək,
Yalvarıb göz yaşı axıtdı sel tək.
Dedi: – “Ey misli yox, yeganə nəqqaş,
Dar gündə, var gündə mənimlə qardaş,
Üzrə vaxt qalmamış, tez ol, tez buyur!”
Söhbətə başladı bəlalı Şapur,
Fərhadın halından nə bilirdisə.
Birbəbir söylədi gözünərgizə.
Ən axırda dedi: – “O indi sağdır,
Amma həsrətinlə sinəsi dağdır.
Getmək üzrə ikən yanına mən zar,
Dedim, öncə səni edim xəbərdar.
Əziyyət bilməsə, bəlkə, Şirin də,
İki-üç söz yazar öz barəsində.
Gedib möcüzələr göstərərəm mən,
O cansız aşiqə can verərəm mən”.
Pəri üzlü dedi: – “Çox minnətdaram”
Sonra bir xəlvətdə olaraq aram,
Qəm dolu bir məktub yazıb qurtardı,
Onun hər kəlməsi cazibədardı.
Qayıdıb Şapura tez təqdim etdi,
Şapur alıb onu gözlərdən itdi.
Fərhad o yerdə ki, tutmuşdu məskən,
Oraçan yüyürdü gizli hər kəsdən.
Çatdı, bir səhər ki, gecəsi Fərhad
Dan atana qədər etmişdi fəryad,
Qəşş edib qalmışdı bihiss, bişüur,
Yanaşdı tez ona ağıllı Şapur.
Bir halda gördü ki, görməsin heç göz:
Nə cismində can var, nə ağzında söz.
Şapur ki, Fərhada gəlib yanaşdı,
Ordakı vəhşilər, quşlar uzaşdı.
Şapur əlləriylə tutub başını,
Fərhadın üstündə tökdü yaşını.
Göz yaşından gülab səpib üzünə,
Gətirdi axırda onu özünə,
Gözlər bir-birinə sataşan zaman,

Birlikdə çəkdilər qorxunc bir fəğan.
O vəfalı dostlar quçaqlaşdılar,
Anıb dərdlərini çox ağlaşdılar.
Görüb onlardakı ahu fəryadı,
Dərələr ağladı, dağlar ağladı.
Öpüb Şapur onun ayaqlarından,
Qoynundan məktubu çıxartdı haman.
Alanda naməni Fərhad sevdalı,
İncəldi qaməti qələm misalı.
Başlayıb oxudu o dərdli məcnun.
Yazılan məktubda bu idi məzmun:

## ŞİRİNİN FƏRHADA MƏKTUBU

Cahana tanrıdır salan həngamə,
Həmdilə başlandı bu qəmli namə:
Etmiş vəfalını cəfayə məzhər,
Hicranın camından içirmiş zəhər.
Görüb eşq əhlində təmkini-ali,
Təcəlli eyləmiş onda cəlalı.
Eşqin şimşəkilə döndərib gülə,
Sərvi, xarü xəsi verib ağ yelə.
Məhəbbət selləri edəndə bidad,
Yıxılır viranə, sökülür abad.
Qəm yeli talana başlasa əyər,
Bədənin şöləsi şam kimi sönər.
Möhnət tüstüsünə rəvac verəndə,
Göz yaşı axıdar kor da, görən də.
Qəm daşı qəzəblə başlasa kinə,
Bərabər sınacaq-yaqut, ayinə...
Səmanın bağrını döndərər qana,
Kəhrəba saralıb dönər samana.
Bülbülü ağladar, o, güldən ötrü,
Gül də köynək cırar bülbüldən ötrü.
Ondadır zərrənin hər iztirabı,
Onunla parlayır günəş kitabı.

Yazıb bu sözləri saldı nizamə:
Möhnət yazısıdır bu qəmli namə,
Demə ki, şəmidən pərvanəyədir,
Səməndərdən, yanan odxanəyədir.
Yəni mən xəstənin zəif canından,
Məlalət qələsi pasıbanından,
Sənədir; olmuşdur qələn qəm dağı.
Ey dağlardan uca sonsuz fərağı.
Necədir əhvalın, bikəs qəribim?
Vüsal dövlətindən ey binəsibim!
Söylə tükəndimi səbrin, qərarın?
De görüm necədir o cismi-zarın?
Necəsən düşəli ağır qürbətə?
Taqətin qaldımı acı firqətə?
Üzəli qəlbini hicran, necəsən?
Olalı varlığın al qan necəsən?
Ürəyin saçımı yada salırmı?
Dünyan gecə kimi heç qaralırmı?
Qaşım mehrabını yad eyləyən dəm
Ay kimi, qamətin, heç olurmu xəm?
Gözümçün dönəndə ürəyin qana,
Söylə başlayırmı bəla tüğyana?
Kirpiyim qəmiylə nalə edərkən,
Hər tükün olurmu söylə bir tikən?
Gözüm qarasını ananda, ey yar,
Cismində artırmı sızlayan dağlar?
Yanağım düşəndə de xəyalına,
Göz yaşı axırmı gül cəmalına?
Xalım açan zaman qəlbində yara,
Gətirirmi səni milçəklər zara?
Hicrimdə gözündən su tökülürmü?
Günəş ruxsarına baxıb gülürmü?
Saçırmı gözlərin ləlim üçün yaş,
Lələ çevrilirmi o yaşla hər daş?
Xəyalən görəndə məni gözünlə,
Dinib danışırsan heç öz-özünlə?
Anıb dişlərimi çəkəndə nalə,

Soyuq ahla olur göz yaşın jalə?
Düşəndə yadına şirin dəhanım,
Vardınmı heçliyə, a mehribanım!?
Afətin bu telmi, zənəxdanmıdır?
Biri zəncir, biri, de, zindanmıdır?
Sırğamçın göz yaşın ulduz olurmu,
Gözlərin ləba-ləb yaşla dolurmu?
Qəddimin hicninə dözülməz deyə,
Ahın ucalırmı sərv tək göyə?
Gəzişim gözündə canlanan zaman,
Ruhun tamaşaya olurmu rəvan?
Könlün qəm yeyəndə incə belimdən,
Nazik olursanmı söylə telimdən?
Gümüş vücudumu ananda barı,
Qəmlənib oldunmu qızıldan sarı?
Söylə bir olanda səhra, dağ yerin,
Sal qayalarmıdır yatacaq yerin?
Yoxsa, dövlət quşu qalxıb həvayə,
İndi bayquş salır başına sayə?
Cüyür, keyikmidir yol göstərənin,
Yoxsa, qulanlardır səməndin sənin?
Oldun Süleymanı əgər zamanın,
Getmə xilafına əhdin, peymanın.
Durur qulluğunda vəhşi heyvanlar,
Olmuşdur qapında mülazim onlar,
Əmr fərmanına müntəzir hər an,
Qurulmuş çadırın quş qanadından.
Tapdın Süleymanlıq məqamı əgər,
Bilqeys ehtiramı demirəm göstər,
Onun tək olmasam əzizin sənin,
Barı olum sadə kənizin sənin.
Məndən uzaqdırsa Bilqeyslik əgər,
Olmuş Süleymana tabe pərilər.
Məni salmasan da Bilqeys tək yada,
Heç olmasa olum bir pərizada.
Nə olar hər zaman zülm edən fələk,
Bizi hicr əlində qoymayaydı tək!

Mən sənə mehriban yoldaş olaydım,
Könül söhbətinə sirdaş olaydım.
Gündüz yaxın olub günəştək sənə,
Gecələr dönəydim ancaq kölgənə.
Batanda əlinə bir qara tikən,
Çıxaraydım onu kirpiyimlə mən,
Qəmdən içən zaman peydər-pey əyaq,
Başın olmayaydı qoynumdan uzaq.
Yolunu xaru xəs tutmuş görəndə,
Süpürəydim onu saçımla mən də.
Sezəndə, könlündə qüssədən qubar,
Car olaydı iki gözümdən sular.
Möhnətin gecəsi göstərəndə üz,
Edəydim üzümlə dünyanı gündüz,
O şirin canına gün qəsd edincə,
Saçımla gündüzü edəydim gecə.
Üzümdən çəkməmiş o gül üzünü,
Ah silə bilsəydim ağlar gözünü,
Cünun duasına olanda mayil,
Boynuna olaydı qolum həmayil.
Əgər – eyləsəydin ayna xəyalı,
Mən ayna edəydim şirin cəmalı.
Yanğıdan ürəyim su istəyəndə,
Edəydim ləbini bir çeşmə mən də.
Sənə, yalnız sənə həmdəm olaydım.
Gecəli-gündüzlü məhrəm olaydım,
Axşam məclisində olub yanar şam,
Gündüzlər olaydım yaxın bir adam.
Əfsus, bizimlə çərx kəc rəftar etdi,
Hicrə ömrümüzü giriftar etdi.
Eləsə qəlbini insan yüz para
Fələk bidadına olarmı çara?
Onun bidadına kim olsa naşad,
Qıyacaq özünə, edəcək bidad.
Görürəm sən necə bəndi-bəlasan,
Bəndi-bəlalara çox mübtəlasan,
Dərdincə dərdlərin imkanı yoxdur,

Bəla möhnətinin payanı yoxdur.
Fəqət insanlara bu dəxi məlum:
Dönür əllərində xarə olur mum.
Sənin dərd çəkməyə cürətin vardır.
Səbrin, təhəmmülün, taqətin vardır
Bilirəm hiçrimdə çox natəvansan.
Amma, cəsarətli bir pəhləvansan,
Tuğyan eyləsə də hicran məlali
Ah çəkib edirsən könlünü xali.
Zülm odu göstərsə varlığına kin,
Verir göz yaşların qəlbinə təskin
Dərdin cuşa gəlib tufan edəndə,
Onu rəf edirsən fəğan edəndə,
Sinənə vuranda qüssə daşını,
Özün rəf edirsən öz təlaşını.
Nə etsən deyirlər düzdür, elədir;
Çünki aşiqlərin işi belədir...
Fəqət mən zəifəm, mən şəkəstəyəm.
Bəlalər əlində canı xəstəyəm.
Hicr xəncəriylə doğranmış canım.
Yüz parə olmuşdur tabım-təvanım.
Ayrılıq odunda yanan könüldür,
Keçib yanmağından, o, indi güldür.
Eşqinin alovu canda tutaşıb,
Yox tutaşıb demə, başımdan aşıb.
Ləlilə gözlərim köhərkan oldu,
Sanki nisar üçün bir imkan oldu.
Ərköyün olsa da hər qadın əgər,
Azadə olsa da, o sərvi-dilbər,
Aydan gözəl olsa gülgün camalı,
Ondan da şirinsə şirin xəyalı,
Xoşdur yarə etsə o dilrubalıq,
Etdim əfsus sənə mən bivəfalıq.
Bu zəbun mənliyim yaxşı bilir haqq,
Yarın sövdasiylə xəstədir ancaq,
Onun hicranında çatılmış qaşım,
Sevda atəşilə hərlənir başım.

Nə var eşq oduna canımın tabı,
Nə çəkir varlığım ağır əzabı.
Aciz qarışqanı əzsə bir ayaq,
Yüz əjdaha onu eyləsə tapdaq,
Madam bir zərbəylə məhv olub gedər,
Əjdər çəngəlindən, tutarmı xəbər?
Əgər göy gurlayıb çaxarsa şimşək,
Dözərmi tufana incə gül-çiçək?
Kim ki, bu dünyada zari-bidildir,
Bidillik onunçün daha müşküldür.
Bir yandan yüz dəfə o əfsus deyir,
Bir yandan utanır yar, namus deyir.
Min yol gecə-gündüz yaxşılıq etsə,
Varmıdır mənası ar-namus getsə?
Bu iş yer üzündə çətindir, əlbət,
Ki, aşiq namusa etsin riayət.
Göylərin dəlinsə niqab pərdəsi,
Ahından, açılmaz hicab pərdəsi.
Demirəm qəlbində yox qubar sənin,
Mənim dərdim qədər dərdin var sənin.
Fəqət yüz bu qüssə, bu ələm ilə,
Bu dəryalar qədər dərdü qəm ilə,
Düşəndə yadıma sən, bir də qürbət,
Üz verir canıma yüz min əziyyət.
Ananda eşqini yanır bədənim,
Ötür fələkləri ahlarım mənim.
Əridi günlərim fəqan içində,
Ömrüm getdi bada hicran içində.
Başımdan yağılar qapıb aldı tac,
Mülkümü, yurdumu eylədi tarac,
Özüm, təbələrim bir bayquş kimi,
Dağlarda-daşlarda qaldıq quş kimi,
Bu yerdə şah ilə təbə ki vardır,
Düşmənin əlində əsiri-zardır.
Tutulanlar edib təslim can, öldü,
Qurtulanlar dəxi qorxudan öldü.
Eşqimin üzündən solur torpağım,

Qarqışdan qızarır üzüm, qulağım.
Eldən həya edib qəsd etdim cana,
Banudan utanıb gəldim cəzanə.
Lakin yüz belə qəm, yüz möhnət olsa,
Cövri-cəfa olsa, əziyyət olsa,
Səni bircə dəfə görərsəm hərgah,
Dərdim sevinc olar şahiddir allah,
Mən ki, bu gün ölüm yatağındayam.
Yataq deyil, məzar torpağındayam,
Vusal ümididir yaşadan məni,
Ümidlə yaşadır yaradan məni.
Öldürsə aşiqi qəmin, firqətin,
Onu dirəldəcək yenə vüslətin.
Aşiftə namədən öyrən halımı,
Mən onda demişəm öz əhvalımı.
Oxu, məzmunundan tutaraq xəbər
Kərəm eylə, mənə yaz bir cavab ver.
Məktubun hər zaman mənə can verər,
Ələmdən-qüssədən o aman verər.
Məndən halı olmaq istəsən hərgah,
Cavabı müşküldür, şahiddir allah.
Elə ki, oxudu məktubu bədhal,
Elə bil, qızardı od üstündə nal,
Özündən xəbərsiz qopardı fəğan,
Yerində hərləndi o zaman-zaman,
Coşdu cünun kimi, bağrı qan oldu,
Gah özünə gəldi, gah huşdan oldu.
Oldu ahu-nalə etmək adəti.
Qalmadı dərdinin şərhə taqəti.
Bu zaman qələmə Şapur atdı əl,
Müşk ilə kafuri yığdı mükəmməl.
Divanə özünü saldı nizamə,
Ta ki, çatdı başa bu dərdli namə
Dedi: – “Şapur, tez ol, yetir canana”.
Döndü dərd əlində bağrı al qana.
Şapur o naməni alaraq ələ,
Şirinə verməyə döndü ağ yelə.

Tapıb o dilbəri yer öpdü əvvəl,
Sonrasa kağızı verdi əlbəəl.
Şirin məktub ilə getdi xəlvətə,
Ürəyi dözmədi dərdü-möhnətə.
Aldı qərarını ələm dastanı,
Belə yazılmışdı o qəm dastanı.

## FƏRHADIN MƏKTUBU

Onun adıyladı bu qəm savadı,
Nəqşindən yaranıb aləm savadı.
Hüsnün yansın deyə şamı, çırağı,
Sevdayla qərq etdi nura torpağı,
Yandırdı sevginin dudimanını,
Qaraltdı dərd yeli xanimanını.
Hüsndə döndərmiş kimi günəşə;
O günə zərrədir bu el həmişə.
Kimi zərrə kimi etmişdir aşiq,
Sərgəştəlik olmuş ona yaraşıq,
Mülkündə hər kimə verməyib bəhər,
Ona qürbət meyi olmuşdur zəhər.
Yurdunu, yarını salıb zəvalə,
İçirmiş hicrdən ona piyalə.
Hər kəsə qürbəti məskən edibdir,
Ona insanları düşmən edibdir.
Hər kimlə dostluğu edibdir o şad,
Elin qəzəbindən qılmışdır azad.
Çıxarmış eli qəm həngaməsindən,
Bəxtəvər eyləmiş yar naməsindən.
Bəlanın dağını o xarə etmiş,
Orda aşiqləri avarə etmiş.
Məhəbbət çölünü tutmuş bəlalar,
Olmuş qarıncası qorxunc bir əjdər.
Naməni başlayıb belə, nəhayət,
Dönük iqbalından etdi şikayət:
Möhnət atəşinin dastanıdır bu,

Qüssə tüstüsünün nişanıdır bu.
Tikəndən sərvədir, yasəmənədir.
Duzəxdən cənnətə, göy çəmənədir.
Cəhənnəm sözünü bir tərəfə at,
Ahımdan cəhənnəm olur bu həyat.
Yəni mən zəifdən, mən natəvandan,
Ürəyi qüssəli mən xəstə candan,
Könlü bəla olan şirin canına,
Can qurban eyləyən can alanına,
Ona ki, həddim yox canan deməyə,
Sadə canan deyil, həm can deməyə.
Lakin mən cünunam, bəli, məzurəm,
Cünunluğum ilə yalnız məşhurəm,
Neyləyim, afətim mənim pəridir,
Pəri yox, şuxların bir sərvəridir.
Madam divanəyə çox yaxınam mən,
Gəl belə heyrətə düşmə sözümdən.
Dəlilə bir yanda eləsən söhbət,
Verməz ağıllılar ona əhmiyyət.
Deyirəm pəridən mən bir əfsanə,
Nə olar yanılsa məgər divanə.
Leyli tək pəridən danışıram mən,
Məcnun tək qəlbimi açmayım nədən?
Nigarım, məhvəşim, sən ey pənahım
Gözəllər içində ey ulu şahım!
Demə, huzurunda göhər saçıram,
Ancaq itlərinə könül açıram.
De onlar yaşayır nə halət ilə,
Fərağətlə, yoxsa məlalət ilə?
Gecə astanada edəndə fəryad
Bu zavallı iti edirlərmi yad?
Həlqə vurduqları bəzən olurmu?
Heç məni axtaran gəzən olurmu?
Gah da savaşanda quduzlar kimi,
Yada salırlarmı quru cismimi?
Kötək, daş yeyəndə bəzən başları
Duyurlar başıma dəyən daşları?

Su deyib, çıxanda çölə dilləri,
Bilirlər göz yaşım tutub çölləri?
Səkban eləyəndə onları əsir.
Düşürəmmi yada boynumda zəncir? –
Nəşələnən zaman boyunbağından
Boynu bağlı məni anırlar bir an?
Yatanda kandarda axşam yan-yana,
Deyin, yer qalırmı mən natəvana?
Verirkən ömrümə möhnətlər qəza,
Barı tuturlarmı mənimçün əza?
Görüb əllərində rəngi-hənanı,
Bilirlər o rəngdir gözümün qanı?
İplə bağlananda öz boyunları,
Boynum yüz bəndlidir duyurlar barı?
İçlərində zəif birisi vardı,
Mən kimi qüssəli, məhzun olardı.
Zavallı bir sümük, bir də dəriydi,
Məşəqqət ipinin düyümləriydi.
Üzünə qulağın tuturdu pərdə,
Həya eyləyərdi durduğu yerdə,
Sürüyüb gəzərdi öz quyruğunu,
Çəgirdi ardınca daima onu...
Çibinlər cismini yaralayanda,
Qonardı üstünə qarğa bir anda
Cismi bağrım kimi yüz parə idi,
Dərd çölündə mən tək biçarə idi.
Mənim varlığımı hicran yaralar,
Onun vücudunu qotur parçalar.
Mənim axan qanım tökülmür düzə.
Onunki aşikar görünür gözə.
Mənimtək solğundur zəif bədəni,
Dörd gözlə daima o gəzər səni.
Girərdik bəhsə biz vəfa yolunda,
Qızğın yarışardıq sövda yolunda;
Tapdı varlığımda oxşar bir sifət,
Qurdu astananda mənimlə ülfət,
Necə rəhm eyləyir ona ağalar,

Olmuşdu eləcə mənə lütfkar.
Mən onda görəndə səxa nişanı,
Sevib bağlamışdım mehrinə canı.
Gözüm yaşlarına nə vaxt baxardı,
Onun da gözündən qan-yaş axardı.
O, mənə rəfiqdi, mən rəfiq ona,
Olmuş rəhm eyləmək bir təriq ona.
Zəifdi, necədir bəs halı, ya rəb?
Keçir bu it kimi əhvalı, ya rəb?!
Astananda pənah tapıbsa əgər,
Məni axtarırmı hər axşam-səhər?
O yenə dərd ilə alovlanırmı?
Görəsən, həsrətlə məni anırmı?
Qanlı yarasını yalayan zaman,
Bilirmi tapmıram mən dava-dərman?
Qapına ayağı görən gedirmi,
Gedirsə bu iti o yad edirmi?
Sən özün qəbul et bu qurbanımı,
Necə fəda edim itə canımı?
Səndən nə həddim var xəbər tutum mən,
Onunçün tuturam əhval itindən.
Sən öz məktubunda xəznə açmısan,
İncilər, göhərlər, ləllər saçmısan.
Üzür istəməyə imkanım hanı?
Etdim hər sözünə fəda bu canı.
Deyirsən qəmlərə getdi təvanım,
Bu sözlə alışıb odlandı canım.
Ölsəm də qəlbinə heç qəm gəlməsin,
Əziz xatirinə ələm gəlməsin.
Mənə yazırsan ki, sən natəvansan,
Lakin qəm çəkməyə bir pəhləvansan,
Dağ sənin tişənlə bir sərnigundur,
Şirlər də pəncəndə zarü zəbundur;
Əfsus məndə elə halət qalmayıb,
Heç nəfəs çəkməyə taqət qalmayıb.
Zəif qarıncadan acizəm indi,
Əridib şam kimi məni qəm indi.

Hər kəsək əlimdə bəla dağımdır,
İp əjdər görünür, gör nə çağımdır?
Mənə tabü-təvan sənin qəmindir,
Canımın qüvvəti ələmlərindir.
Canımın alsa da tabü-təvanı,
Eşq edər qarınca hər əjdahanı.
Qarınca olarsa eşqin pamalı,
Düşün gör necədir onun əhvalı?
Yazırsan ki, taxtım, tacım çəlalım,
Ordum, təbələrim, dövlətim, malım,
Eşqə qurban gedib olundu talan,
Düşmənin əlilə edildi viran.
Dərdi-qəm içində Məhinbanu, mən,
Kənara qoymuruq ayaq qələdən.
Nə yazım sözünə cavabdır, deyə,
Aciz də deyiləm cavab verməyə,
Bütün yazdıqların düzdür, doğrudur,
Görünür, allahın istəyi budur.
Nə bəla üz versə ancaq qəbul et,
Tək bu dərmandadır əlacın, əlbət.
Bilirəm, vətənin çəkib min bəla,
Olub rəiyyətin dərdə mübtəla;
Qoşun, təbə ki var, müti insandır.
Can ilə baş ilə sənə qurbandır.
Məni də onlardan biri zənn elə,
İstəsən, hamıdan alçaq say hələ.
Əgər sən insafı qoysan araya,
Təhəmmül eyləsən bu macəraya,
Ya olsan belə bir qismətlə razı.
Dərdim dərdlərində olmat məvazi.
Əgər sən layiqsən desən möhnətə.
Fələk onları da salıb zillətə,
Fəda hamısına bu canım olsun,
Yolunda həyatım qurbanın olsun.
Əgər eyləməsə bunlar kifayət.
Boynuma yüklənsin cürm, cinayət.
Yolunda torpaqdan olsam da alçaq,

Torpaqdan gəlmədim dünyaya ancaq.
Mənim də varımdır yurdum, diyarım,
Öz evim, öz günüm, öz ixtiyarım.
Atam adlı-sanlı bir xaqan idi,
Neçə iqlim üzrə böyük xan idi.
Mənim də parlardı gün kimi baxtım,
Fil sümüyündəndi qurulu taxtım.
On iki min şəhər Xətadə-Çində,
Yaşardı hökmümlə nemət içində.
Vardı buna layiq çahü-cəlalım,
Təbəm, səltənətim, dövlətim, malım.
Sevdanın talanı yetincə mənə,
Düşüncə məcazı eşqin bəhrinə,
Bəlalilər içrə biçarə oldum,
Yurdumdan, mülkümdən avara oldum.
Mənə tabe olan minlərlə insan,
Tökür göz yaşları bu ayrılıqdan.
Atam ilə anam müsibət çəkir.
Neçə min şəhərim əziyyət çəkir,
Onları zamana saldı dustağa,
Cismimi döndərdi qara torpağa.
Hadisə daşından, dərdə bax ki, sən
Torpağım toz olur,sovrulur yerdən.
Əgər qismətimdir məhəbbət mənim,
Yazılmış baxtıma müsibət mənim,
Tənə qılıncımı endirim kimə?
Töhmətmi yağdırım özüm-özümə?
Mən deyil, yüzlərlə mənim kimilər
Qəzanın əlində arpaya bənzər.
Nə qəza göndərsə yerə asiman,
Ona bais deyil dünyada insan.
Nə edim, cünunam, bağrım köz oldu,
Bu üzdən biliyim quru söz oldu.
Mən ki, itirmişəm öz kamalımı,
Necə şərh eyləyim indi halımı?
Dəliyəm, deyiləm özümdən agah,
Nə yazım, səhv etdim, əstəxfürüllah.

Gəl bu namədəki xətanı əfv et,
“Qələm yox dəliyə” demişlər əlbət,
Qələm səhifədə ancaq seyr etdi,
Odur ki, söz dəxi xeyirlə bitdi.
Oxudu məktubu o pəri peykər,
Bürüdü qəlbini tutqun fikirlər.
Namə bir ip kimi canını sardı,
Alıb taqətini əldən, apardı.
Sevincdən səcdəyə düşməyə gəldi,
Kəmanə çevrilmiş qəddi düzəldi.
Ahının alovu göyləri aşdı.
Bu odla qərarı, səbri tutaşdı.
Açıldı hər ləhzə könlü oldu şad,
Ki, sağdır, yaşayır bəlalı Fərhad.
Hicrində eylədi nalə bir zaman,
Göylər də, yerlər də yandı ahından.
Məktubu söylədi Məhinbanuyə,
Halından gəl onun agah ol deyə.
Banunun namədən oldu bağrı qan,
Eləyə bilmədi dərdinə dərman.
Fəqət agah oldu nəsli uludur
O şah nəsillidir, xaqan oğludur.
Şirin, Məhinbanu verib baş-başa,
Onun əhvalına yandılar qoşa.
Göstərib Şapura xeyli ehtiram,
Verdilər yenidən ali bir məqam.
Soruşub durdular yenə Fərhadı,
Şapur danışdıqca onlar ağladı...
Nə xoşdur canandan əl üzən əgər,
Bir gün gözlənmədən eşitsə xəbər...
Ümidsiz olsa da Nəvai, tarı!
Ümidlə yaşamaq olsun şüarı.
Saqi! Piyalə ver bir dəm ayılma!
Məni bu dərdlərdən naümid qılma!
Yalnız ümid ilə məni şad eylə,
Çatdır muradıma, gəl azad eylə.

## ŞAPURUN TUTULMASI

Bu gizli nüktənin müşkülgüşası,
Mənanın olmuşdur bir rəhnüması.
Ki, Şapur o iki zar natəvandan,
Şikəstə cisim ilə incikli candan,
Verdi bir-birinə şövq naməsi,
Yenə də başlandı eşq həngaməsi.
Xosrov xəbər tutdu "bir nəfər rəsul,
Rəsul deyil, bəlkə casus bir füzul,
Dəlidən xəbərlər aparır aya,
Cavabla məcnunu salır sevdaya.
Eşqin aləmində qızarsa bazar,
Bundan ortalığa yüz fitnə çıxar.
Sevgi səhrasından divanə Fərhad,
Fitnə qələsindən həmin pərizad,
Min bir hiylə qurub gələr qərarə,
Üz qoyub gedərlər özgə diyarə;
Xosrov tozlarına çatmaz, o zaman
Varmıdır mənası olarsa nalan?
Əgər taparsa da çəkərək zəhmət,
Axır sərəncamı olar müsibət.
Əgər dəli Fərhad minsə atını,
Mindirsə tərkinə öz həyatını,
Çevrilsə meydanda onlar ağ yelə,
Olmaz hərifləri min Rüstəm belə:
O vaxt ki, çıxmışdı qaladan dağa,
Məcnun tək çıplaqdı başdan-ayağa,
Nəsibi hicrlə ahdı, amandı,
Qom daşı altında qəddi kamandı,
Ancaq bir daş alıb atdı düşmana,
Bu daşla ordunu saldı həycana.
Əgər gərdunpeykər atın belində;
Görünsə qan tökən qılınc əlində,
Xosrovun qisməti tək zəval olar,
Bütün əməlləri xamxəyal olar",
Xosrov qulaq asdı bu əfsanəyə,

Düşündü bir tədbir o divanəyə
Şah qərar verdi ki, pusqular qursun,
Kinli keşikçilər gizlində dursun,
Fərhadın yanından qələyə qədər,
Gözətçilər durub hər axşam-səhər.
Saxlayıb hər keçən yolçunu dərhal
Axtarıb, yoxlayıb, versinlər sual.
Hər kimdə olarsa, deyilən nişan,
Yaxud ələ keçsə şübhəli insan
Onu yetirsinlər həmən Pərvizə,
Pərviz nə eləyər aydındır bizə.
Üç gündür çıxmışdı Şapur ki, getsin,
Yer öpüb Fərhadı ziyarət etsin.
Şirinin məktubun alaraq ələ,
Dönmüşdü səhərlər əsən ağ yelə.
Uçurkən o belə ruzigar kimi,
Aldılar üstünü boran, qar kimi.
Axtarıb məktubu tapdılar ondan,
Xosrovun yanına oldular rəvan.
İlkin hökmdara təzim etdilər,
Şapuru, məktubu təqdim etdilər.
Şah verdi onlara bir xeyli ehsan,
Çünki etmişdilər muşkülü asan.
Məktubu hökmdar əlinə aldı,
Qələm tək başını aşağı saldı:
O qara xətlərdən şahın əlüstü,
Ucaldı başından bir qara tüstü.
Oldu hər kəlmə bir möhnət qarası,
Bəla bazarının mişkin sevdası.
Duydu nişanədir sevda əhlindən,
Yox, savad-əzəmidir, səhv dedim mən.
Bəli, bir dərdü qəm nişanıydı o,
Mehrin, məhəbbətin dastanıydı o.
Söyləyirdi keçir hicrin xəzanı,
Yetişir vüsalın bahar zamanı.
Hər sözü etibar, vəfa deyirdi.
Məhəbbət ətriydi, gülümsəyirdi.

Tamam hekayəti məhrəmanəydi,
Hər biri ülfətə yüz nişanəydi.
Hər kəlmə dil açıb sanki can deyir.
Aşıq dildarına can qurban deyir.
Keçən məktublardan var onda söhbət,
Əvvəli, axırı mehrü-məhəbbət.
Hər sətri əhd ilə, peymanla dolu,
Təkcə peyman deyil, imanla dolu.
Orda çox yazılır hey Pərviz deyə,
Gah zalım, gah cahil, gah xunriz deyə.
Deyilir Ərməni eylədi viran,
Əlilə ölkələr olundu talan.
Edilir eşqinə min tənə, töhmət,
Deyilir, sevdadan açılsın söhbət.
Əldə qılınc, vurur eşqdən o laf,
Eşq əhli olarmı söylə nainsaf?
Nə üzlə eşqdən o söhbət edir,
Aşiqlik özgədir, şahlıq özgədir.
Aşiq edər canı canana qurban,
Canan deyər, canım o cana qurban.
Pərviztək aşiqin iqbalı dönsün,
Çevrilsin hicrana vüsalı dönsun.
Allah əsirgəsin, görüm dünyada
Göz açıb irməsin əsla murada.
Məqsədi aləmdə əgər vüsaldır,
Onunçün vüsalım bir xam xəyaldır.
Olmuşdur bu işdə səyi, himməti,
Heç kamə yetməsin bu məhəbbəti.
Nə qədər cismində mənim ki, can var,
Tərlan qələsinə qoymayacaq sar.
Qəza etsə məni əlində dustaq,
İnsan qaça bilməz ölümdən uzaq,
Xəncərlə edərəm çanı yüz para,
Vəslə yol verməərəm o zülmkara...”
Gəzdikçə kağızı qanlı gözləri,
Oxudu çox belə ağır sözləri.
Belə dərd oduyla alışdı canı,

Sarsıldı möhnətlə qəlbi-virani.
Əgər insaf ilə edib təhəmmül,
Oldu agah hər nə yazmışdı o gül,
Gördü ki, həqq onun tərəfindədir,
Səvab mütləq onun tərəfindədir.
Ancaq ki, səltənət, namusla, şöhrət,
Bir də ki, arzısı, hərçayı şəhvət,
İnsafdan Xosrovu uzağa saldı,
Qəlbini dumanlı fikirlər aldı.
Əmr etdi Şapuru eylədilər bənd,
Atdı özünə də qüssə, qəm kəmənd.
Büzürkümmidi o, dəvət eylədi,
Ona əhvalatı söhbət eylədi.
Söylədi: “Az qalır ki, çıxsın canım,
Gözümdən axmağa meyl edir qanım.
Mənim bu dərdimə gəl eylə çarə,
Yoxsa, dönəcəyəm bir gül qübarə.
O divanə kimi devlər bağlayan,
O çünun dev kimi coşub çağlayan,
Ovlamış sevdiyim gözəl rənanı,
Belə dev azdırar ancaq insanı.
Ölürəm üz verib bu möhnət mənə,
Aciz olsam gülər camaət mənə.
Bundan qəribə şey varmıdır məgər
Gülsün, ağlamasın halına ellər?
Zülmümlə dərdlilər qoparsa fəryad,
Bununla xatirim olmayacaq şad,
Məcnun günahsızdır aydın-aşkardır;
Ona qıymağımın günahı vardır.
Fikir kəməndini açıb üz görüm
Göstər bu zülmətdə bir gündüz görüm”.
Birlikdə çox belə söhbət etdilər,
Onlar bir-birinə çox zidd getdilər,
Bir tədbir qurdular axırda belə
Tədbir yox, etdilər əl fitnə felə:
Tapsınlar axtarıb elə bir insan,
Fikri hiylə olsun, xəyalı yalan.

O ölüm kabusu yola düzəlsin,
Birbaşa Fərhadın yanına gəlsin.
Söyləsin ki, “Xosrov Ərməni aldı,
Çatıb istəyinə, qələbə çaldı,
Günü Şirin ilə işrətdə keçir,
Məhinbanu ilə piyalə içir.
Həmtay edib Banu onu dilbərə,
Elə bil birləşir şəhd şəkərə,
Tutmuş o Xosrovu Fərhaddan artıq.
Rəvamidir ona olasan aşiq?!
Səni tərk eylədi sən dəxi tərk et,
Yeri öz ölkənə, öz mülkünə get”.
Xoş nəticə verər tədbirin sonu,
Bu sözlər soyudar Şirindən onu.
İnciyib o çıxıb bir yana getsə,
Başını götürüb, divanə, getsə,
Ondan olarlarsa naümid, əlbət,
Aradan qalxarsa hərgah əziyyət,
Onda göstərilər bir natəvanlıq,
Eyləyər Xosrona ay mehribanlıq,
Bu ox ürəyinə eləməsə kar,
Verərik başqa bir tədbirə qərar.
Riştəyə bu sayaq hiylə düzüldü,
Şah badə istədi, mey kimi güldü.
Durma, qədəh gətir saqi, qəmim var!
Müsibətzadəyəm öz matəmim var!
Məlalət qəsd edir bu cismi-zarə
Qədəh tut, əlimdə qalmadı çarə!

## QARININ FƏRHADI ALDATMASI

Matəmi saxlayan ağı çağırdı,
Sözün surətini o belə cırdı:
Pərvizin felilə işə girdilər
Bir hiyləgər tapıb tez gətirdilər,
O qəddi yay kimi bir pirəzaldı.

Fələk piri kimi hər sözü aldı.
Məkrdən üzündə xətt vardı çin-çin,
Dilinə ömründə gəlməmişdi çin.
Saz eyləyən zaman hiyləni o şum,
Xarə dönüb olur əllərində mum.
Fəsadla başlasa gizli tədbirə,
Verər atasına qızını ərə.
Nə zaman ovsunla evdən gedərdi,
Günəşi, Zühələ gəlin edərdi.
Fələklər adına söylərdi xala,
Fəsad mat qalardı ondakı hala.
Xalanı qız eylər tədbir edincə,
Qadınlar bakirə eylər hər gecə.
Bəylər aldanardı belə oyuna,
Ərəstu özü də uyardı ona.
Fəsada başlasa qurumuş çanı,
Bir sözlə pozardı yüz xanimanı.
Hökmlər çıxarır noxud falından,
Şübhələnməzdi xalq zərrəcə ondan.
Elmilə qoyardı yüz Boqratı mat,
Noxudu ulduzdu qurardı büsat.
Zülm qılıncını şəstlə vurardı,
Fərhadın qolunu qarıb qırardı.
Axtarıb tapdılar həmin qarını,
Şah ona söylədi öz qərarını.
Eylədi könlünü vədələrlə şad,
Zülm üçün yönəldi o fitnə-fəsad.
Fərhad oxşasa da polad bir dağa,
Əfsunla sərməyə onu torpağa,
Neçə gün o səhra, dərə, düz getdi,
Gah axşamlar getdi, gah gündüz getdi,
Nəhayət, yetişdi uca bir dağa,
Bir dağ ki, Fərhadı salıb dustağa.
Rəvan olub qarı yetişdi ona,
Könlündə dəhşətli, qorxunç əfsana.
Boynunda bir uzun təsbehi vardı,
Məkrini bununla daim sayardı.

Başında pəhrizdən sadə bir ləçək,
Əyin paltarının yamağı kələk,
Sanki Məryəm durub səhərçağında,
Gəlib aram tuta Sina dağında.
Elə ki, o qarı yaxına getdi,
Salamla qəddini Fərhad dal etdi.
Ona hörmət ilə verərək sual,
Sordu məqsədini tutdu hal, əhval.
Yerində qıvrıldı qarı nal kimi,
Yalanlar söylədi şirin bal kimi.
Dedi ki: "Zəifəm həm xəstəcanam,
Elmdən ayrılmış bir natəvanam.
İllərdir ki, yerim bir xəlvət idi,
Sənətim tanrıya ibadət idi,
İşim yoxdu mənim bir insan ilə,
Ünsiyyət qurmuşdum yaradan ilə.
Nə qədər sakitdi, əmindi Ərmən,
Ömrümü sürürdüm bu niyyətlə mən.
O zülmkar şah ki, Pərvizdir adı.
Yandırdı yurdumu onun fəsadı.
Zövqə həsrət qaldı ellər vətəndə,
Bilirsən nə olub yəqin ki, sən də.
Dəyişdi Ərmənin çünkü əhvalı,
Bu miskin qarının döndü iqbalı.
Kimsədə qalmadı dinə rəğbət heç,
Dedim ki, ertəni eyləməyim geç,
Gəzim bir kaha ki, çox kənar olsun,
Yanında bir çeşmə onun car olsun.
Girim o kahaya əbədilik mən,
Orda uzaq olum insan gözündən.
Ömrümün quşuna əcəl etsə zor,
Qoy hamin mağara olsun mənə gor.
Düşüb bu niyyətlə gəzdim dağ, dərə,
Gəlib çıxdım həmən sən olan yerə,
Əlimi yumuşam, düzdür, ömürdən,
Qalım son günləri bu yerlərdə mən.
Vəfa qalmamışdır fani dünyada,

Vəfasız insanı nə salım yada.
Qara daşda vəfa, bəlkə də, çoxdur,
İnsan övladında amma ki, yoxdur".
Həmin bu əfsunu eşitdi Fərhad,
Aldandı, xatiri xeyli oldu şad,
Qarının durduğu torpağı öpdü,
Müqəddəs saydığı ayağı öpdü.
Dedi: – "Tovfiq nuri səndə əyandır,
Qəlbin həqiqətlə dolu cahandır.
İnsanla qurmadın sən ki, ittifaq,
Həqitət səndədir, qəlbindədir haqq.
Bəli, insan oğlu çox bivəfadır,
Yenə də gəzdiyi mehri-səfadır.
Ölkəndə üz verib yəqin fəlakət.
Dərdli, qubarlıdır ürəyin, əlbət.
Söylə! Ərməndə bir qəzami vardır,
Ki, qəlbin bu qədər dolu-qubardır?"
Qarı "düzdür – dedi –fikrin ay bala,
Sübutdur sözlərin haman suala.
Ölkədən eyləmiş vida amanlıq,
Amanlıq yerinə gəlmiş yamanlıq,
Tutmuş məmləkəti bəlavü afət,
Aşkar oldu hər şey bu gün, nəhayət,
Məhinbanu ilə Xosrov barışdı,
Coşub mehribanlıq həddini aşdı.
Sürdü evlənməyi ortalığa şah,
Banuya xoş gəldi haman bu nigah,
Başladı hər tərəf işrət büsatı,
El qənimət bildi eyşi, nişatı.
Fisqü ficur oldu hər yanda əyan,
Dini-islam çıxdı bu gün ortadan.
Ölkə başdan-başa oldu meyxana,
Min zərbə vuruldu əhli-imana,
Əhli-din dolanır çöldə, çəməndə,
Yollanıb gəlmişəm buraya mən də
Mümkun deyil buna etməmək heyrət;
Nəcib sifətləri atdı cəmaət.

Allah da ortaya bir cəfa saldı,
Ümidi hamının əlindən aldı.
İşıq saçan zaman nemətin şamı,
Ələmlər bürüdü haman axşamı.
Şirin adlı gözəl vəfalı pəri
Matəm içindədir o gündən bəri.
Nikah əmri nə vaxt aşikar oldu,
Şirinin nəsibi ahu-zar oldu,
Ölüm qılıncını çaldı canına,
Qıydı həyatına, halal qanına.
Bir də, deyirlər ki, içmişdir zəhər,
Ki, Pərviz balından görməsin bəhər.
Belə həlak edib o sərv özünü,
Bəqa diyarına saldı izini.
Ona aşiq imiş bir qəlbi naşad,
Bir qərib dərdimənd, şöhrəti Fərhad
Hicriylə qıyaraq o, cana getdi,
Eşqilə göz yumub cahana getdi;
Getdi həsrətilə ahla, fəğanla,
Vüsal arzusuyla, əhdü-peymanla.
Üzdü el əlini o şux nigardan,
Belə yazılıbmış pərvərdigardan.
O, bir sərv idi ki, Ərməndə bitdi,
Gəldi dünyaya pak, təmiz də getdi.
Fərhadı anaraq eylədi fəğan,
Verdi həyatını yolunda qurban,
Ölürkən dilində Fərhaddı fikri,
Ürəyində həmən naşaddı zikri,
Pərvizin kamını verməyib, haman
Fərhadın adıyla köçdu dunyadan",
Yalan qılıncını sıyırıb qarı,
Çulğadı hiyləgər ahı dağları,
Həmən əfsanəni danışdı, durdu,
Fərhadın qəlbinə min yara vurdu,
O, nağıl etdikcə Fərhad saraldı,
Elə bil gözləri yuxuya daldı.
Qarı ahlar çəkdi azı min kərə,

Yerdən toz qaldırdı uca göylərə,
Qızardı ahilə uçan buludlar,
Yandı alovlanıb alışdı otlar.
Çılğın bir nərəylə səsləndi Fərhad,
Dedi: – "Könlüm evi edildi bərbad,
Bir quru canım var, aldı yar onu,
Aldı, atəşlərə saldı yar onu.
Duysun ki, nuş etdi könül qanımı,
Buraxsın möhnətdə üzgün canımı".
Söyləyib dünyadan əbədi getdi,
Ədəm diyarına hərəkət etdi.
Dağlarda göz yaşı döndü sellərə,
Ahı əsər etdi əsən yellərə.
Ömrünün qəsrini sökdü həmən su,
Bu suda qərq oldu həyat ordusu.
Saqi! Badə gətir, dur gəl can kimi,
Olsun şərabının rəngi qan kimi,
Nohəylə mey içdim, bəsdir dünyada,
Köçməliyəm tutub matəm Fərhada.

## FƏRHADIN ÖLÜMÜ

Qəm məktubu yazan iti qələmlə,
Matəm tutub qara geymişdir belə:
O, hicran dağında dönən şikara,
Elə ki kar etdi vurulan yara,
Keçdi ağır zərbə düz ürəyindən,
Doğradı bağrını onu böldü tən.
Çalışdı qalxmağa ahi-fəğanla,
Yıxıldı torpağa yaralı canla.
Əcəl varlığını talan eylədi,
Gözündə aləmi zindan eylədi.
Çırpdı vücudunu o sal daşlara,
Qıydı varlığına dərdli biçara.
Bəlalı başını daşlara çaldı,
Vurduqca hər dəfə bir yara aldı.

Gəzdi ağlayaraq hər addımbaşı,
Qurusun beləcə, bəlkə, göz yaşı.
Aldı məlhəmləri atdı bir yana,
Qəlbini qərq etdi axan al qana.
Keçdi məlhəm çağı, yara bitişməz,
Gəldi əcəl oxu para bitişməz.
Açdı sarıqları çıxmadı səsi,
Fəvvarə eylədi yüz qan çeşməsi.
Atdı pambıqları dözdü zəvalə,
Yarandı dağlarda yüz qanlı lalə.
Alıb yarasından sapları açdı,
Sovurub yellərə, çöllərə saçdı.
Cana rəxlə vurdum mükəmməl dedi,
Can quşu uç dedi, ölüm gəl dedi.
Əcəl sinəsini yüz parə etdi,
Can quşu uçmağa o çarə etdi.
Könlünün tüstüsü qalxdı səmayə
Saldı qəm buludu ətrafə sayə,
Gəzib dağda-daşda zar-zar ağladı,
Etdi göz yaşları nisar ağladı.
Cismində yaradan açıldı güllər,
Bu qan qönçəsilə bəzəndi çöllər.
Tökdü bu qönçələr gül yarpaqları,
Bu güllər yandırıb yaxdı dağları.
Dərd gülü yayıldı dağlara, düzə,
Dövran alov rəngli göründü gözə,
Dedi: – “Üz başımı, ey çərxi-dövran!
Məni tərk eyləmiş sərvi-xuraman.
Çıxar gözlərimi, bəla xaqani,
Bir də görməyəcək onlar cananı,
Sən ey qəm qılıncı, doğra dilimi,
Çünki itirmişəm öz sevgilimi.
Çək mənə, ey fələk, sən də göz dağı,
Gəldi nalə dəmi, dərdü qəm çağı.
Sındır ayağımı bəla daşları,
Getməyə qalmadı səbri, qərarı.
Bircə sözüm vardır: canımı yandır,

Canansız nə həyat? Axır zamandır,
Ey əcəl, sinəmi yüz min parə et,
Əziyyət üstündən yetir əziyyət.
Əzabla könlümü min parə eylə,
Onu ədəm sarı avarə eylə!
Fələk, apar məni gəl bu diyardan,
Üzülmüş əllərim vüsali-yardan!
Mənə həmdərd idin, sən ey məhəbbət,
Sayəndə görməzdim zülm, zəlalət,
Ey hicran, gəl dağıt başımdan qəmi,
Var ol ki, aşiqin oldun həmdəmi!
Çarə eylə eşit, qorxma ahımdan,
Qüsurum olmuşsa, keç günahımdan!
Çağla göz yaşları, üzərimdən aş,
Üzümə varını etginən şabaş!
Ey ahım, cananın hüzuruna get!
Apar ruhimi də, göstər mərhəmət!"
O baxdı səhraya, süzdü hər yanı,
Dedi: – "Qəm əhlinin sən ey məkanı!
Ey könül həmdəmi, ey sadə torpaq!
Ucasan hər şeydən dünyada, torpaq!
Çox cəfalar verdi ayağım sənə,
Dərdü qəm yedirib tapdağım sənə.
Göz yaşım bağrını sel kimi yardı,
Yürüdüm, toz-qubar aləmi sardı.
Zamandır, zülmümdən indi azad ol,
Qurtarıb cəfamdan sevinib, şad ol".
Səhra qüssələndi tutub yasını,
Cırdı dərələr tək öz yaxasını.
Fərhad şiş dağlara saldı diqqətin.
Dedi: – "Ağır yükü sən ey xilqətin!
Yönəlmisən göyə, uca başlısan,
Əzəldən dünyada ağır daşlısan.
Qoynun yurdsuzlara gözəl pənahdır.
Daşların xəstəyə istinadgahdır.
Mən sənə vermişəm xeyli əziyyət,
Çəkirəm görəndə səni xəcalət.

Arabir bağrını tişəm yarıbdır.
Arabir külungüm toz qoparıbdır.
Üzün göz yaşımdan olub qan kimi,
Ahım sarıb səni bir duman kimi.
Əfv et, günahıma gəl bir qılınc vur,
Bağışla aşiqi axır çağımdır".
Fərhad fəğan ilə duşdü yüz halə,
Əks-səda verdi dağ, çəkdi nalə.
Parça-parça oldu bağrının başı,
Qan ilə elədi göhər, ləl, daşı,
Söylədi gərdunə ki: "Ey sitəmkar!
Tale ulduzumla həmkarlığın var.
Şüarın hər zaman cövr, cəfadır,
Dözürəm niyyətim, rəyim vəfadır.
Əgərçi vermisən əziyyət mənə,
Çəkdirmişəm mən də çox zillət sənə.
Həm əfğanım ilə pərişan oldun,
Həm ahın odunda bağrı qan oldun.
Qubarım üzündə açmışdır yara,
Ahım günəşini eyləmiş qara.
Demə ulduzların ziyafəşandır,
Ahım odlarından o, bir nişandır.
Bu gün nə ahım var, nə əfğanım var,
Nə ahı-fəğanda bir nişanım var.
Dərbədər aşiqəm torpağa döndüm,
Sən yanma, şam kimi mən dəxi söndum.
Yoxladım, gəl məni yox oldu tut sən,
Əgər varsam belə yox say, unut sən!"
Bu sözlə fələyin dərdləri aşdı,
Şəfəqdən canında odlar tutaşdı,
Tapmadı yolunda bir istiqamət,
Ona etdiyindən çəkdi nədamət.
Fərhad külüngünə dedi: – "Əsirim!
Əzablı günlərdə ey dəstgirim!
Sənə eyləmişəm çox sərzənişlər,
Səndən yetib mənə çox pərvərişlər.
Başını vurmuşam illərlə daşa,

Salmışam canını dərdə, təlaşa.
Davamlı olmusan möhnətimdə sən,
Durmusan daima xidmətimdə sən.
Az dağlar üstünə qalxıb getmədim,
Ey tişə! Sənə də az zülm etmədim.
Azad olursunuz möhnətlərimdən
Cəfamdan, çövrümdən, şiddətlərimdən.
Ancaq rəhm eyləyin bu gün halıma,
Acıyın ürəkdən bu məlalıma,
Bağışlayın sizə vermişəm cəfa,
Qoyun minnət mənə, göstərin vəfa".
Vurdu külüng, tişə özünü daşa,
Matəm tutub fəğan qıldılar qoşa.
Belindən asılı tifillər kimi,
Dil açdılar dərdli könüllər kimi;
"Səninlə varmışıq hər zaman dağa,
Səninlə girərək qara torpağa".
Fərhad baxdı dağa, baxdı çöl sarı,
Gördü heyvanları, vəhşi quşları,
Dedi: – "Olmuşsunuz munis yar mənə,
Gecəli-gündüzlü havadar mənə.
Zülm-nifaq deməm heyvanda vardır.
Sizdə yoxdur əsla, insanda vardır.
Vəfa mayəsi var xilqətinizdə,
Mehri-məhəbbət var tinətinizdə,
Başımdan aldınız qürbət dərdini,
Ülfətlə qovdunuz firqət dərdini.
Mənə güc verdiniz, qanad çaldınız,
Siz mənim başıma sayə saldınız.
Çox əziz mehriban qardaş oldunuz,
Həm qohum, həm də ki, sirdaş oldunuz.
Sizinlə duymadım ki, mən qəribəm,
Kimsəsiz, yalnızam, bir müztəribəm,
Ahımdan çəkdiniz xeyli əziyyət,
Lakin etmədiniz əsla şikayət.
Boynumda haqqınız çoxdur, qoy deyim
Sizdən hansı dillə üzür istəyim".

Söyləyib hönkürdü, zar-zar ağladı,
Heyvanlar duyaraq könül dağladı,
Hamı nalə ilə bağrını yardı,
Səs-səsə ağladı, şivən qopardı.
Sanmayın vəfasız insanlar kimi,
Onlar ağladılar heyvanlar kimi.
Fərhadın gözündən süzüldü qanı,
Dəldi vücudunu dərdin peykanı.
Qurtardı aləmlə söz-söhbətini,
Düşündü bir qədər öz xilqətini,
Yetib axır zaman anladı Fərhad,
Etdi atasını soyuq ahla yad,
Anası gözünün içinə baxdı,
Car oldu çeşmindən qoşa çay axdı.
Başına elə bil qılınc çaldı göy,
Elə bil canını çəkib aldı göy.
Dedi: – "Zəhərlədin güzəranımı,
Əcəl! Nə durmusan, gəl al canımı!
Söylə, bu üz-üzə gəlmək neçindir?
Başımı qılıncla bölmək neçindir?
Bu zərbəyə məruz qalmaq nədəndir?
Pambığa çaxmağı çalmaq nədəndir?
Düşdü yada atam, anam, yoldaşım,
Nədən yer altına girməyir başım.
Bu necə rəftardır, etdin, ey fələk?
Pozuq xatirimi pozmaq nə demək?
Bu nə insafdır, ey zamanə, bir din!
Mənə zəhər dolu peymanə verdin.
Vurdun açıq başa şəmşir, nə olsun?
Öldürdün min dəfə, de bir nə olsun?"
Çatınca bu yerə dərdli sözləri
Etdi qan yaş üzə cari gözləri,
Dedi: – "Səni tari, badi-səba, get,
Çin, Xəta mülkünü eylə ziyarət!
Demirəm xaqana söz aç oğuldan,
Danış qürbətdəki bu xəstə quldan,
Əvvəl öz başını get qurban eylə!..

Sonra ərz-halim aç, bəyan eylə!
Söylə ki, avara bixanimanın,
Bağrı xunabədən bir qətrə qanın,
Aləmdə ümidsiz, şərməndə öldü,
Üzünü görmədən Ərməndə öldü.
Bağrının al qanı axdı gözündən,
Köçdü bəla görüb dünya üzündən;
Pərviz hiylə qurdu, məkrü al ilə.
Yaman rəftar etdi bu minval ilə.
Əgər o düzlükdə çəksəydi hesab,
Verərdim mən ona yaxşı bir cavab.
Lakin əyriliyi o ayin etdi,
Doğrudur söyləyib, yalan yeritdi.
Dünyada xilqətən düz olan insan,
İnanar eşitsə quru bir yalan.
Demə ki, mənə o kafər eylədi,
Nə eylədi qəza-qədər eylədi.
Bir arzum var mənim Bəhram dilavər,
Həmdəmim, həyanım, dostum o yavər,
Ordu cəm eyləyib bu yana gəlsin,
Zərbələr vurmağa düşmana gəlsin;
Gəlsin də eyləsin Xosrovu candan,
Günahsız qanımı qoy alsın ondan.
Badi-səba! Bu söz yandırsa şahı,
Başından od çıxsa, ucalsa ahı,
Cırsa yaxasını o bəxtiqara,
Özünü çırparsa əgər qumlara,
Beləcə ağlarsa avarasına,
Bağrının tikəsi can parasına.
Butam, deyib yerə vursa başını,
Endirsə köksünə cəfa daşını,
Torpağa tacını vurmağa qoyma!
Taxtını sındırıb qırmağa qoyma!
Dilimdən söylə ki, ey ulu xaqan,
Tanrı təqdirinə neyləsin insan?
İşim sevda imiş bu təbiətdə,
Yazılmış alnıma ölüm qürbətdə,

Haqqın yazdığına de, çara varmı,
Ovdan can qurtaran biçara varmı?
Bu yazı alnımda hökmi-qəzadır,
Haqqın hər qəzası ömrə rizadır.
Fələk nakam etdi Fərhadı hərgah,
Bu cahan mülkündə ömr eyləsin şah.
Hücrə yıxıldısa, qəsr abad olsun,
Səbzə qurudusa, sərv azad olsun.
Anamın bağrında açılsa yara,
Qəmindən başını vursa daşlara,
Düşsə vaveylası əgər hər yana,
Yayılsa fəryadı bütün cahana,
Xitab etsə mənə o, quzum deyə,
Ansa kimsəsizi, yalnızım deyə,
Ah çəkib qəlbini əgər qanatsa,
Həya pərdəsini üzündən atsa,
Bəlalı oğlunu gətirsə yada,
Doqquz pərdəsindən çıxsa dünyada,
Canım oğul deyib açsa sözünü,
Uğrumda əl atıb cırsa üzünü,
Yolub saçlarını yellərə atsa,
Müşkü əllərilə kafura qatsa,
Alıb nəfəsimdən tüstü gedərsən,
Onu çulğamağa örtük edərsən.
Deyərsən, ey üzü ruhum qidası,
Qubarı gözümün ey tutiyası!
Yetər bu qəm salır üstümə sayə.
Tanrı əta qıldı gəldim dünyayə,
Çatdın sən arzuna, könlün oldu şad.
Munisin kəsildi bir yaxşı övlad.
Qəmimdən olmadın dilxoş bircə an,
Dolandım aləmi sərgəştə, nalan.
Uşaqların yeri çəmən, bağ oldu,
Mənimsə qismətim dərə, dağ oldu,
Qaldı qəmlərimlə o cismi-zarın,
Dağımdan utanmaq oldu şüarın.
Yaqut istəyirkən aldın xarə sən,

Tapdın gün istərkən atəşparə sən...
Böyüdüyüm zaman biçarə oldum,
Diyari mülkdən avarə oldum,
Başım cəfa gördü çərxi-fələkdən,
Çəkdin fərağımı sən də ürəkdən,
Döndərdin ömrünü qübarə, yandın,
Bəs deyilmiş, yenə, dübarə yandın?
Bu ziyan yetər ki, hər dərdə dözdüm,
Gözümün yaşilə Kəbəmi pozdum.
Bir də qoy gəlməyim mən öz halıma,
Alışıb yanmasın el əhvalıma.
Sən də bu dərdimdən çəksən iztirab,
Mənə qismət etsin ahi bu əzab.
Salma dərgahından kənarə məni,
Yaxma cəhənnəmi odlara məni.
Bəhramla, Mülk-ara bilsələr əgər
Mənə bir gecədir hər aydın səhər,
Onlara tökdürsə qan yaş dərdü-qəm,
Qaranın üstünə çəkib al rəqəm,
Matəmlə geysələr hərgah zil qara,
Əgər üz verərsə əza onlara,
Gecə keçməmişdən hələ yarını,
Cırıb tökərlərsə paltarlarını,
Əgər özlərini vursalar dağa,
Dağa yox, çırpsalar quru torpağa;
Sən Mülk-aranı eyləyib təskin,
"Bağlamaz ağıllı, de, qəzaya kin".
Mənə asimandan yetişib qəza,
Görməsəm də ona vermişəm riza;
Sonra da Bəhrama salamımı de,
Belə aç könlümü, pəyamımı de.
De ki: – "Ey canına bağlı bu canım,
Şagirdim, övladım, ruhi-rəvanım!
İstəyirsən olsun xəstə canım şad,
Səndən razı qalsın həmişə Fərhad,
Gecikmə bir saat, bir dəm dayanma!
Qəzəblə coşmaqdan zərrə usanma!

Tez bu tərəflərə əzmü cəzm elə,
Ordu cəm eyləyib çevril ağ yelə,
Bu işlə rahəti-canımı istə,
Tapıb qatilimi, qanımı istə!
Sonra zəfərlərlə qayıt dön geri,
Get xəbərdar eylə bizim elləri,
Söylə: muradımın nə olduğunu,
Mənim əvəzimdə bilsinlər onu,
Hər nə əmr eyləsə, o şahi-dövran,
Dursunlar əmrində onun hər zaman,
Xəta ki, cənnətdən o bir nişandır,
O, cənnət kimidir, töhfəsi candır.
Əgər seyr eyləsə orda nəzərin,
Düşsə xəlqə tərəf yolun, güzərin,
Orda cənnət kimi dörd bağça-bağ var,
Behiştə bərabər dörd qəsr, otaq var.
Hökmümlə göylərə onlar ucalmış,
Şöhrəti aləmə səs-səda salmış.
Əgər günün biri oraya getsən,
Yol keçib bir zaman oradan ötsən,
Bahar bağçasında hər addım başı,
Axıt gözlərindən gülgün göz yaşı.
Yox əgər dolansan o yay bağını,
Xatırla qırılmış şax budağını.
Güzarın düşərsə xəzan bağına,
Solğundan salam ver sən torpağına.
Seyrəngahın olsa qış bağı hərgah,
Anıb ahlarımı qopar sovuq ah.
Qələminə təqdir afərin deyə,
Xətanın nəqqaşı mahir Maniyə
Söylə ki, işlədib əməlli sənət,
Vermiş o dörd qəsrə əlilə zinət.
İşləmiş Yunana at sürməyimi,
Vuruşub əjdaha öldürməyimi,
İkinci, Əhrimən ilə savaşda.
Qanlar tökdüyümü torpaqda-daşda,
Üçüncü: meydanda hünər saçmamı,

İskəndər tilsimin qırıb açmamı,
Girib mağaraya mən əjdər kimi.
Dördüncü: Sokratla görüşməyimi,
Ki, bu cahan mülkü bina olandan,
Belə bir hünəri görməmiş insan,
Hər nə ki, səylə çəkmiş otağa,
Yusun dönə-dönə başdan-ayağa.
Siz də evin alın müxəlləfatın,
Tullayın sulara, atəşə atın!
Madam, bada getdi bəlalı canım,
Cahanda qalmasın adım, nişanım.
İtdi yer üzündən gücüm-qüdrətim,
Divarda qalmasın əksim, surətim,
Mən ki, aparmadım bir şey məzara
Sən çəkdin onları niyə divara?
Yenə də Qarunə məndən salam de!
Nə peyğam söyləsəm bir-bir tamam de!
Söylə ki: daşları çapdım sökərək,
Tökdü öz başıma onları fələk.
Gərdiş yağdırarsa yüz minlərlə daş,
Nə eyləyər onun altında bir baş?!
Fələk tək dağları uçurub saldım,
Qəzadən mən özüm altında qaldım.
Ömrümün axırı yetişən zaman,
Türbəmin hər daşı, oldu bir dağdan.
İndi bu yaxşıdır, qəmlər dağıyam,
Qəm dağı altında yer dustağıyam.
Bəli, söyləginən sən o nəqqaşa,
Başda ləqəbimi yazmışdı daşa,
Söylə qoy bu adı yüz parə etsin,
Özüm tək ismimi avarə etsin.
Madam daş altında qalıram özüm,
Niyə daş üstündə yazılsın sözüm?
Dolan səhraları, şəhərlərə get,
Bütün aşiqləri tez xəbərdar et,
Söylə: “Fərhad öldü, köçdü qəlbi zar,
Xosrovdan yetişdi ona bu azar.

Deyirdiniz Fərhad sultanımızdır,
Bizlər rəiyyətik, o xanımızdır,
Zülmlər çəkərək o sultan getdi,
Köçdü nakam aşiq, dünyadan getdi.
Yığılıb bir yerə ordular kimi,
Ona əza tutun tacidar kimi.
Bahar buludu tək boran yağdırın!
Xosrovun üstünə peykan yağdırın,
Ahu fəğan ilə döndərib gülə,
Tacını-taxtını sovurun yelə.
Sonra da ağlayın bu natəvana,
Xosrovun malını verin talana.
Vəfa qəsrin edin bu yolla abad,
Ruhumu eyləyin beləliklə şad.
Səba, Şapurun da hüzuruna get,
Murada yetməyən dostu agah et,
Söylə, qanlar içdin həmdəmliyimdən,
Dərdü-qəmlər yedin məhrəmliyindən,
O gün ki, sən mənə olmusan həmdəm,
O zamandan bəri yedin dərdü-qəm.
Vəfa ayinini eylədin şüar,
Qoy versin əçrini o pərvərdigar.
Həmişə vaqif ol qəbrim daşından
Ayağın çəkmə gəl türbəm başından".
Yetirəndə bura Fərhad nəvani
Yetişdi ağzına incimiş canı.
Olub bu halından bir anlıq agah,
Söylədi ki: lahövl, əstəğfürullah.
Üzülmüş vücudu canana yetdi,
Bəla atəşləri o cana yetdi.
Yaxdı vücudunu döndərdi gülə,
Cahanda yanmayıb bir aşiq belə.
Dilindan düşmədi dildarı bir an,
"Yarıma qurbanam" deyib, verdi can.
Bəlanın canına bəla yetişdi,
Zəmanə əhlinə qovğa yetişdi.
Eşqin sinəsinə vuruldu yara,

Başdan ayağadək geyindi qara,
Dərdü bəla ilə ağladılar qan,
Qurdular o gecə şamü qəriban.
Bunlar o aşiqin canını aldı,
Özləri Fərhadsız matəmdə qaldı.
Heyvanlar bu halı alıb nəzərə,
“Füsunkar qarını yıxdılar yerə,
Gözündən bir gilə yaş axıtmadan,
Çilənmədən yerə bircə damcı qan,
Onu dağıtdılar qisas aldılar,
Dağlara, daşlara səda saldılar.
Demə ki, dünyada insan yaxşıdır,
Vəfasız adamdan heyvan yaxşıdır.
Saqi! Durma, zəhər dolu cam gətir,
Sirab eylə məni, biaram gətir.
Qazanım eşqdə Fərhad kimi ad,
Edim o nakamın ölümünü yad.

## XOSROVUN QALİB GƏLMƏSİ

Yolçusansa əgər yükünü bağla!
Deyilsən əbədi dost bu torpaqla.
Cahan rüb adını nə üçün almış,
Çünki üç hissəsi sularda qalmış.
O kəsin nəsibi yalnız qayqudur,
Ki, son düşərgəsi dəryadır, sudur.
Əsdirsə hadisə coşqun bir külək,
Qərq etsə o rübi sularda fələk,
Yer demə, buraya xərabə söylə,
Vardır oxşayışım hübabə söylə!
Hübab su üstünə günbəz nişandır,
Üfləsən o haman, su da hamandır.
Bir ev ki, edilir bərbad bir anda,
Ağıllı tikərmi onu cahanda?
Belə imarətdə yaşamaq olmaz,
Orada kimsənin kefi çağ olmaz.

Bir ovuc torpaqdır, hübab deyildir,
Torpağın su içrə işi müşküldür.
Qumu sən tullasan suyun üzünə,
Dibə çökəcək o, nə etsən yenə.
Aşiyan başına dönən quş kimi,
Dönər yer başına çərx uçmuş kimi.
Bu tabaq kimi çərx quş kimidir, bax.
Daima quş kimi vurur mayallaq.
Quş qonar yuvaya, bəzən ram olar,
Fələk nə ram olar, nə aram olar.
Göyərçintək gəzər daim çölləri,
Dəlili göy rəngdir əzəldən bəri...
Göyərçin deyil, bir quşxanadır bu,
Ulduzdur gəl demə sən, danədir bu.
Bu quşbaz dediyin mahir qəzadır,
O, hər nə eləsə yalnız riza ver!
O, göyərçin tutan səyyadə bənzər,
Xeyr səyyadə yox, cəlladə bənzər.
Ay, günəşdir onun, təşti, şəmşiri.
Acıyıb, qoymaz o, kimsəni diri.
Qəsdi yer üzündə gülü zarədir,
Bağrı çox dilbərin parə-parədir.
Bu məşhurdur cəllad min yol töksə qan,
Eləyir qılınçı torpaqda pünhan.
Fələk min nəfəri gündə qətl edər,
Günəş qılıncı odda gizlədər.
Min adam öldürmək madam işidir,
Ona kim söyləyir ki, nər kişidir.
Nə qədər şah olsa, şahzadə olsa,
Əgər evli, subay, azada olsa,
Öləcək fələyin əlində ancaq,
Nə məndə, nə səndə baş qalmayacaq.
Təmiz olsa belə insan göhəri,
Ondan zülm görüb əzəldən bəri.
Yaqut dunyada pak hər zaman olmuş,
Əlindən onun da bağrı qan olmuş.
Günəş ki, nur alır ondan kainat,

Fələk örtür onu torpaqla heyhat!
Bir an şad olmağa zalımin biri
Al qanla doldurur piyalələri.
Yüz təmiz cövhəri eyləyir ki, xak,
Bir bəngi sevinib olsun fərəhnak.
Qırır ağacları meşədə, dağda,
Onu atəşpərəst yaxsın ocaqda.
Fərhadın axıtdı qızıl qanını,
Ki, Xosrov xoş sürsün öz dövranını.
Xülasə, nə deyim, Fərhad bağrı qan,
Fəna məclisinə olanda rəvan,
Özünü heyvanlar öldürdü qəmdən,
Çoxu naxoşladı dərddən, ələmdən.
Həlqə vurub onun dövründə onlar
Əza saxladılar edib ahu-zar.
Aldılar araya onu sərbəsər,
Yol tapa bilmədi ora bir nəfər.
Bu zaman bir yazıq, miskin, natəvan,
Elindən, yurdundan didərgin olan,
Gedirdi yanına çəkib min zəhmət,
Şad ola Fərhada etməklə xidmət,
Azca yaxınlaşıb, donub qaldı mat,
Əsla görməmişdi belə əhvalat:
Özünü daşların içinə saldı,
Fərhadın halına heyrətdə qaldı.
Elə ki, tapşırdı aşiq canını,
Düşündü dağların bu qurbanını.
İstədi qazısın bir məzar ona,
Bir gözətçi olsun xaqan oğluna;
Qorxudan qanlı yaş tökdü gözləri
Şir, pələng əlindən qayıtdı geri –
Dolanıb şəhəri, gəzdi bir təhər,
Yaydı məclislərə təzə bir xəbər,
Bu ölümdən hamı agah edildi,
Deyil Xosrov, hətta Şirin də bildi.
Xosrov sözlərini əqlinə vurdu,
Bir qədər gözlədi, düşündü, durdu.

Tutuldu qayğıdan, əsla gülmədi,
Qorxudan gecələr yata bilmədi.
Bu ümid eylədi onu xeyli şad
Ki, Şirin onundur, ölübdü Fərhad.
Fəqət oldu yenə ürəyi qəmgin,
Ki, bəslər bu kinə fələk dəxi kin.
Nəfsi qalib gəldi, o tələb etdi,
Şah da bu istəyin dalınca getdi.
Bunu bilmədi ki, zəhərlidir cam,
Onu içmək üçün verdi sərəncam.
Fitil od salarsa əgər bir dağa,
Yandırar, özü də başlar yanmağa,
Əgər ilan qalxıb vurar insanı,
İnsan da öldürür haman ilanı.
"Bu iş olmayaydı, dedi, tacidar,
Oldumu, durmağın nə mənası var?"
Ayırdı bilici-baş adamları,
Yola saldı haman qələyə sarı.
Dedi ki: "Nəslimdən ona söz açın,
Ümidlər verərək coşub od saçın.
Ovsun işlətməyə, durmayın, gedin
Yola gəlməyəni mülayim edin!"
Qalxıb ovsunçular qanad çaldılar
Qurğana getdilər, izin aldılar,
Banuya, Şirinə-o şux gözələ
Dua eyləməyə gəldilər dilə.
Başladılar haman mehribanlığa,
Əl atdılar iczə, natəvanlığa.
Ovsunla qurdular fitnə, felləri,
Banunu aldatdı şirin dilləri.
Girdi ortalığa ərkani-dövlət,
Qurub düzəltdilər gizli məşvərət,
Dedilər: "Xosrovdur hakim cahana,
Kainat baş əyir o hökmrana.
Nəsəbdə sultandır, şahlar şahıdır,
Həsəbdə ellərin o pənahıdır.
Qohum olmaq dilər bizimlə o yad,

Neçin də olmayaq bundan razı, şad?
Diri olsa idi Fərhad, o qəmgin,
Bağlardıq Xosrovla bu iş üstə kin.
O, yoxdur, ədavət, kin nəyə gərək?
Şahın təklifinə biz könül verək.
Belə iş görərmi dünyada qanan:
Az qazanc eyləyib, çəksin çox ziyan.
Pərvizin rəy verək bu peymanına,
Səbəbkar olmayaq elin qanına.
Zülmu bu ölkəni etmişdi bərbad,
İndi ədaləti eyləsin abad.
Sərt daşın hərifi deyil ki, şişə,
Alışır od düşsə xırman həmişə".
Banu qulaq asıb həmin sözlərə,
Dinib-danışmadı əsla bir kərə,
Bir ana qəlbitək bağrı qan oldu,
Fərhad xəyalilə natəvan oldu.
Şirin də çıxardıb haldan özünü,
Cırıb dağıtmışdı gülgün üzünü.
Öz dərdli cisminə vurub min yara,
Tapşırmaq istədi canı dildara.
Bir gün əl atmışdı zəhrə o hilal,
Saray duyuq düşüb bilmişdi dərhal,
Neçə yol getmişdi atəşgədəyə,
"Özümü odlara yandırım" deyə.
Qoymuşdu yanında Banu nikahban,
Olar büt yanında daima rəhban.
Nəzər çəkmədilər əsla gözəldən,
Axırda yorulub düşdülər əldən.
Şirin alovlandı pərvanə kimi,
Döydü öz-özünü divanə kimi,
Naləsi, qovğası kəsilmədi heç,
Ahı, vaveylası əskilmədi heç.
Fərhadın yadilə elədi fəryad,
Belə ahu-nalə edərdi Fərhad.
Söylərdi qürbətdən, ağır fəraqdan,
Düşmənin məkrindən, feldən, nifaqdan.

Tərif eyləyərdi hüsnü cəmalı
Vüqarı, ürfanı, dərin kəmalı.
Söyləyərdi ki: “Mən əsiri-zarəm,
Hicr əlində elən bir biqərarəm”.
Gah “məzlumum” deyib onu anardı,
“Eşqin dustağıyam” deyib yanardı.
Dinib danışardı öz xəyalilə,
Şirin xəyalının xoş vüsalilə.
Banunu etmişdi bu halı heyran,
Könül xanimanı olmuşdu viran.
Qəmlə keçirirdi güzəranını,
Qorxurdu ki, ala dərdlər canını.
Azuqə qurtardı qəmli Qurğanda,
Əlaçsız qaldılar belə zamanda,
Kiçiklər başladı ahu-fəğana,
Böyüklər tənəylə gəldi zəbana,
Dedilər ki, bu iş düzələn deyil,
Həqiqətdə xoşa heç gələn deyil.
Xəlqə möhnət verər, nakamlıq verər,
Belə bir iş ancaq bədnamlıq verər.
Nə etmək gərəkdir ki, olan oldu,
Buna bais gözəl bir cavan oldu.
Onun həsrətilə biz qayğuluyuq,
Onun qulamıyıq, onun quluyuq.
Buna səbəb olan köçdü dünyadan,
Nə çıxar səbəbsiz boş macəradan.
Gözəl yurdumuzu Pərviz şah aldı,
İndi iczü niyaz ortaya saldı.
Onun rəftarını bir nemət sayaq,
O nazü neməti qənimət sayaq.
Onun təklifini qarşılayıb şad,
Edək çamaatı zindandan azad.
Tədbir görülməsə beləcə ancaq,
Yəqin el Banuya olacaqdır ağ.
Çağırıb şəhərə qorxunc düşmanı
Ona tapşırarlar bir gün Qurğanı.
Bu sözlər Banunu döndərdi daşa,

Yox, bütün varlığı düşdü təlaşa.
Yönəlib Şirinin yanına getdi,
Naləsi, fəğanı fələyə yetdi.
Sirrini açmağa lisanı yoxdur,
Gizlətmək üçün də imkanı yoxdur.
Nələr danışırsa dərdli camaat,
Birbəbir Şirinə etdi hekayət.
Şirin söylədi: “Ey ömrüm, dünyada,
Həya, söz deməyə mane olsa da,
Yenə də söyləyim, mənə layiq ər
O idi, tək odur dilimdə əzbər.
O göhər dünyadan varıb köçdü tək,
Artıq nəsib deyil mənə ər, demək,
Getsəm özgə ərə, dil versəm əgər,
Adıma bivəfa Şirin deyərlər.
Onun fərağında mən səbahlığam,
Dərdindən, qəmindən susuz balığam.
Əgər balıq sudan düşərsə uzaq,
Su üçün çapalar, su dilər ancaq,
Mən də bu gün onun fərağındayam,
Çırpınıram, – suyun sorağındayam.
Artıq dad verməyir yaşamaq mənə,
Siz əməl eyləyin ellər deyənə.
Mənəm xəlqin səbəb əziyyətinə,
Baisəm düşdüyü bu möhnətinə.
Sağ ikən eylədim naşad onları,
Zülmkar olmayım ölərkən barı”.
Məhinbanu qızdan alınca rüsxət,
Şad olub fürsəti bildi qənimət,
Sülh üçün axtardı, düşündü çarə,,
Dedi qasidlərə: “O hökmdarə,
Böyük ehtiramla söyləyin salam,
Salam ilə bizdən aparın pəyam.
Əsrin tacidarı, böyük hökmran,
Əbədi taxtını fələkdə quran.
İstəyir Şirinə kəsdirsin nikah,
Məni bu sözilə şad elədi şah.

Öpüb məktubunu qarşıma qoydum,
Dua kağızı tək başıma qoydum.
Etdim elçisinə haqqilə hörmət,
Coşub dalğalandı möhrü məhəbbət.
Sonra qüssələndim tavus quşu tək,
Düşündürdü məni şahim gələcək.
Dedim öz eybimi özüm göstərim,
Söylədim "xəznədə sınıb gövhərim".
Bilmədim bu əməl şübhə doğurar,
Eybi söyləməyin, demə, eybi var.
Bir mühüm iş də var, aşkar deyim mən,
Od düşüb canıma haman bu işdən.
Nə zaman qapalı dərbanda qaldıq,
Rəhmsiz fələkdən min cəfa aldıq.
Quraqlıq havanı eylədi kövrək,
Od, alov yağdırdı əsən yel, külək.
O qədər hədsizdi, çoxdu ki, insan,
Üfunət içində qalmışdı Qurğan.
Lətafət arxının sərvi-rəvanı,
Məlahət bağının gülü, reyhanı,
Ürəklər şad edən gülgün camalı,
Şahın arzu-kamı, şirin vüsalı,
O naxoş havadan solub-saraldı,
Şadlıq bülbülünü dərdü-qəm aldı.
Yatır o zamandan yatağındadır,
Göz kimi güllərin qucağındadır.
Cəfalar üz verib o mah camala,
Düşür zavallı qız gündə bir hala.
Kəramət göstərib lütf etsə şahim,
Onda bağışlanar cürmüm, günahım.
Bir məktub yollasın bu mülkə barı,
Çıxsın qoy ağ günə Ərmən diyarı.
Dustaqdan qurtarıb el azad olsun,
Qəladən çıxaraq hamı şad olsun.
Qurtarsın çəfadan gül üzlümüz də,
Açılsın gül kimi çəməndə, düzdə,
Bir qədər qeydinə qalsa təbiblər,

Azalsa qəlbindən dərdi-qəm əgər,
Şah əziz eyləsə əzizi olsun,
Əgər xar eyləsə kənizi olsun".
Banudan eşidib bu xoş sözləri,
Qasidlər tələsik döndülər geri.
Elçilər sevincdən sanki lal oldu,
Xosrov da şadlıqdan halbahal oldu.
Əmr etdi bir gözəl məclis qurulsun,
Hər yanda təntənə təbli vurulsun.
Ətrafa şad xəbər düşdü car oldu,
Elə bil qiyamət aşikar oldu,
Sevinc sədaları tutdu hər yeri,
Açdılar laybalay dərvazələri.
İnsanlar dolanıb hər yanı gəzdi,
Quş kimi dağ-daşı, səhranı gəzdi.
Xosrov məclis qürub düzəltdi işrət,
Fələk büsatına eylədi heyrət.
Bir kəçavə qurdu əladan əla,
Ərkanü-dövlətlə saldırdı yola.
Banu kəcavəyə minib də, yetsin,
Şahın məclisini işıqlı etsin.
Banu itaətlə gəldi hüzura,
Şahın eyvanını qərq etdi nura.
Aradan silindi köhnə ədavət,
Şadlıq qanad çalıb başlandı işrət.
Gah çalğılar coşdu, söhbət qızdı gah,
Şirinin halını soruşunça şah,
Tökdü göz yaşları Banu aramsız,
Söylədi: "Zəifdir, bəslədiyim qız,
Təbiblər yoxlayıb onun halını,
Bizə söyləmişlər hər əhvalını.
Qurğanın havası ona ziyandır,
Onunçün xeyirli başqa məkandır,
Özgə hava verər qıza təravət.
O, başqa aləmə eyləmiş adət".
Xosrov söylədi ki: "O yeri sən de,
Göstər könül açan yaylaq, çəmən, de.

Sürdür kəcavəni, özün əmr elə,
Günəşi aparın həmən mənzilə”.
Banu dedi: – “Gözəl bir sarı dağ var,
Orada ruh açan qəsr ilə bağ var,
Su çəkiblər ora əmək çəkərək,
O gözəl yaylağı şah görüb gərək.
Əgər lütf eləyib verərsə fərman,
O səfalı yerdir Şirinə dərman”.
Eşidincə bunu şah oldu naşad,
Dağa haman suyu çıxarmış Fərhad,
Yüz Xosrov can qoyub hünər saçsa da,
Su gəlməz oraya xəznə açsa da;
Lakin bu təklifə şah oldu razı,
Aşikar olmadı bir etirazı.
Banu kəcavəni o dağa sürdü,
O qəsrə, ruh açan yaylağa sürdü.
Fələkdə hilali alıb getdilər,
Çəməni gül üçün mənzil etdilər.
Günəş o ruh açan eyvana gəldi,
Dirilik suyundan qız cana gəldi.
Saqi! Mey gətir ki, o canfəzadır,
Bu əlvan çəmənlər çox bivəfadır.
Sərxoş olaq yetər, meyimiz çoxdur,
Fərhad, Şirin köçdü, Xosrov da yoxdur.

## ŞİRİNİN ÖLMƏSİ

Bu sözü dil açıb söyləyən adam
Söhbətini belə eyləyir tamam:
Çıxdı gül çöhrəli o simin bədən,
Parlaq günəş kimi, öz qələsindən.
Gəldi çəmənzara ceyranlar kimi,
Mindi kəcavəyə sultanlar kimi.
Ona günəş deyin, söyləmə ceyran,
Şəfəqdən halə var dövründə hər an.
Köçünü birbaşa Ərmənə sürdü,

Sihhət eyvanına, çəmənə sürdü.
Ərkanü dövlətlə şah başdan-başa,
Onun gedişinə qıldı tamaşa,
Hamı heyran qaldı bu mahcamalə,
Günəş ətrafını bürüdü halə.
Xosrovun yeganə bir oğlu vardı.
O, taxtın varisi xoşbəxt yaşardı.
Bu alov kimiydi, o çay kimiydi,
Bu dəmir ox uçu, o yay kimiydi,
Sevməzdi atası bu tək oğlunu,
Ürəkdən saymazdı oğul da onu.
Deyildi oğlunun ata pənahı
Oğul izləməzdi bir işdə şahı.
Bu gün çıxan zaman el tamaşaya,
O da heyran-heyran baxırdı aya.
Atdı kəcavədən pərdəni külək,
Göründü gözlərə o şirin mələk.
Qəmərin nurinə aləm büründü,
Qəmər deyil, parlaq günəş göründü.
Şiruyə bir anlıq baxıb dayandı.
Atəşi-eşq ilə alışdı, yandı.
Getdi mənzilinə düşdü o dildar,
Onun da qəlbində oldu bərqərar.
Yeməkdən, yatmaqdan oldu şahzada,
Ömrü iztirabla gedərkən bada.
Dedi: – "Bu dərd ilə yəqin ölərəm,
Şirindir yaşayış, gözəldir aləm,
İş görüm tədbirlə, yoxalsın zəval,
Gülsün varlığıma əbədi vüsal.
Atam ölməlidir, düşmandır mənə,
Eşqin həyəcanı ziyandır mənə.
Ölümdən qorxmayır aşiq heç zaman,
Nə üçün sarsıla o tökəndə qan?
Dedi: – "Xosrov çıxsa aradan əgər,
Mənimki olacaq o nazlı dilbər.
Şahı məhv eləsəm, cahan mənimdir,
Dünyaya nur saçan canan mənimdir,

Arzu eyləmirik biz yalnız şahlıq,
Onun vüsalıdır yüz padişahlıq".
Düşünüb tədbirlər tökdü bu qismət,
Qoşuna vədələr verdi o xəlvət,
Uydu əqrəbası şirin dilinə,
Təsir bağışladı bütün elinə.
Xosrovun cəfası həddən aşırdı,
Coşqun sellər kimi coşub daşırdı.
Fələk də göstərdi belə bir sifət,
Etdi Şiruyəyə cümləsi beyət,
Çevirib zülm ilə bağrını qana,
Xosrovu saldılar nəmli zindana.
Döndərib ömrünü solğun yarpağa,
Gömmək istədilər onu torpağa,
Dedilər: "Uçmasın bu quş bu damdan,
Yaxa qurtarmasın qoy intiqamdan.
Qınından çıxarsa bu qılınc əgər,
Onların başına min zərbə dəyər".
Oğul qılıncını ilan eylədi,
Ata qanı ilə əlvan eylədi.
Onun sanma övlad canını aldı,
Zəmanə Fərhadın qanını aldı.
Ona eyləmişdi Xosrov əziyyət,
Fələk qisas aldı, çəkdirdi zillət,
Cəfalar çəkdisə əlində Fərhad,
Xosrovun da oldu dövranı bərbad,
Tökdü al qanını ciyərparəsi,
Gedər həşrə kimi ciyər yarəsi.
Qatil ya gədadır, ya kamirandır,
Qoy olsun, eşq ara, həm qana-qandır.
Fələk zülm edəndə yeyin çapır at,
Hər kəsə haqqı ilə verir mükafat.
Bir evə dəyərsə bir evdən zərər.
O da haman evə bir əvəz verər.
Bir kəs ki, toxudu riştə cəfadan,
Alacaq haqqını o əjdahadan.
Kimdir ki, söndürdü ocaq zülmilə,

Onu döndərmədi zəmanə külə?
Gəldi qisas üçün dövran yüyürək,
Dövran demə, səyyar bu doqquz fələk.
Sitəmdən əlini çəksən yaxşıdır,
Mehrü vəfa toxmu əksən yaxşıdır.
Zəmiyə nə əksən çəkərək zəhmət,
Axırda olacaq o sənə qismət.
Bəhrədən qaçılmaz, sərf edib əmək,
Yaxşılıq toxumu bu dünyada ək!
Zülmün qılıncını Xosrov tez vurdu.
Onun da evini fələk uçurdu.
Əgər Şiruyə də bidad eylədi,
Fələyin əlindən fəryad eylədi.
Tutduğu işində oldu bərqərar,
Xilafət təblini çaldırdı aşkar,
Çıxıb taxt üstünə qoydu başa tac,
Taclılar önündə oldular möhtac.
Banunu çəkərək o macəraya,
Nişandan söz saldı bir gün araya.
Banu söylədi ki: – "Qız natəvandır,
Zəifdir, xəstədir, ürəyi qandır.
Əgər səhhət olsa Şirinin yarı,
Onun əlindədir öz ixtiyarı.
O aydan qeyr bir mənim kişim yox,
Hər nə iş tutarsa, bil ki, işim yox,
Özünə qəlbini açsan yaxşıdır,
Ona göhərini saçsan yaxşıdır".
Şirinə bəhs edib sevgidən, qatil,
Elçilər yolladı ona o cahil.
Dedi: – "Bir yol sənə etdim tamaşa,
Pərvanələr kimi yandım ataşa.
Hüsnünün odundan alışdı canım,
Əridi iliyim, qurudu qanım.
Alışdım, fəqanım göyə dayandı.
Nə Fərhad, nə Xosrov bu sayaq yandı,
Dəlil istəyirsən əgər sən buna,
Eşqində qıymışam ata canına.

Yaranandan bəri bu sonsuz cahan,
Eşqin zülmü belə etməyib tufan.
Sevda bir kimsəyə verməyib, əlbət.
Mənə verdiyi tək zülüm, əziyyət.
İstəyirsən ucal, asimana var,
Öyrən işlərini, haqqıyla axtar.
Hərçəndi ki, mənəm bu gün hökmran,
Sənin eşqinləyəm rüsvayi-cahan.
İşim rüsvaylıqdır, yaman əməldir
Dillərdə söylənir, eldə məsəldir,
Vəfalı ol, kamım rəva eylə gəl!
Vüsala vədə ver, vəfa eylə gəl!
Əgər istəyimə əməl etməsən,
Çılğın bir tufana çevrilərəm mən.
Yoxdu bu eşqdə mənə bir çara
Vədənlə eylərəm ancaq müdara".
Elçi Şiruyədən yetirdi peyğam,
Bihuş olub düşdü sərvi-güləndam.
Qıvrıldı zulfütək şahmara döndü,
Bir kəlmə dinmədi, bimara döndü.
İşi bilmək üçün etdi təhəmmül,
Öyrəndi qatildir, o aşiq deyil.
Qıymış atasına, cəlal üçün o,
Bəs nələr eyləməz vüsal üçün o?
Dedi: – "Görmək onu məndən iraqdır,
Ölmək görməyimdən çox yaxşıraqdır.
Ondan xilas ollam elərsəm əgər,
Bu ölüm əbədi həyatə dəyər".
Düşünüb qərara gəldi o pəri,
Dedi qasidlərə haman sözləri:
"Nəzakət aləmdə ömrün naxşıdır,
Hər nə dedinizsə xeyli yaxşıdır.
Şaha dua ilə sənami deyin,
Duadan sonra da ricamı deyin.
Hər nə baş verərsə əgər qəzadan.
Gərək əl çəkməsin insan rizadan. –
Yəqin razı olub buna asiman,

Xosrovun taxtına sahib olmusan.
Əlində olsaydı ixtiyar əgər,
Atanın canına qıyardın məgər?
Kimdə əsas varsa kamandan bir az,
Bir kəlmə eləməz buna etiraz.
Sənə eşqim mənim uddurmuşsa qan,
Vermişdir mənə də cəfa bir zaman.
Atanın əlindən aşiq çəkdi dad,
Onun məhv etdiyi zavallı Fərhad.
Vuruldu hüsnümə kəməndə düşdü,
Könlü də eşqimdə min bəndə düşdü.
Bizim sevdamızdan saf deyil, çiçək,
Belə bir sevgini görməyib fələk.
O eşqə ömrünü qurban eylədi,
Ədəm mənzilini məkan eylədi.
Onun hicrində mən halsız, bimaram.
Bir quşam, heç zaman sağalmaz yaram.
Zəifliyim onun bu qəmindəndir,
Cəfalar çəkməyim matəmindəndir.
Eşqimin yolunda o can veribdir.
Vəfalı ömrünu qurban veribdir.
Vəfa dərgahına mən də girməsəm,
Yasını saxlayıb əvəz verməsəm,
Könüldən soruş ki, nə olar hali.
Fərhadın qəmindən olarmı xali?
Şah verib işarə etsin məni şad,
Şapuru zindandan eyləsin azad,
Şapur da özünü ora yetirsin,
O bəxti qaranı alıb gətirsin.
Saxlayıb yasını geyinim qara,
Firqətdən düşməyim dərdə, azara.
Canı xilas edim yar möhnətindən,
Könlümü qurtarsam bu firqətindən,
Şah belə eyləyib versə işarət,
Bir müjdədir mənə təklifi, əlbət.
Dolannam sayətək öz yanında mən,
Duraram hökm ilə fərmanında mən.

Belə bir təklifi bəyənməsə şah,
Görməz Şirini sağ, qoy olsun agah".
Varıb Şiruyənin elçisi getdi,
Onun sözlərini şaha ərz etdi.
Şahın bu xəbərdən oldu könlü şad.
Tapdırıb Şapuru eylədi azad.
Dedi: – "Rəftar etsin o bilən kimi,
Mübarək xatiri istəyən kimi".
Qız gördü Şapuru sevinci daşdı,
Elə bil Utarid Mehrə yanaşdı.
Yıxıldı torpağa Şapur bağrı qan,
Ağladı, göz yaşı tökdü pərişan.
Şirin də eylədi yanıqlı fəryad.
Gəldi xatirinə zavallı Fərhad.
Onlar matəm tutdu belə bir zaman,
Qaraldı firuzə rəngli asiman.
Tufan yatan kimi qız gəlib dilə,
Bəlalı Şapura min möhnət ilə
Açdı Şiruyənin əhvalatını,
Özünün bu yolda xəyalatını.
Şapur bu əhvaldan tutunda xəbər,
Kəcavə götürüb eylədi səfər.
Getdi üç yüz kişi onunla bahəm,
Dillərində fəryad, üzlərində qəm.
Hər şeyi şahanə tərtib etdilər,
Alıb udla bixur, nafə getdilər.
Getdilər gəzməyə o dağçapanı,
O başı bəlalı nadir insanı.
Alıb kəcavəyə onu şah kimi,
Fələyin qoynunda parlaq mah kimi.
Gətirib qoysunlar o can önündə.
Can önündə deyil, canan önündə.
Şapur dayanmadı, hərəkət etdi.
Mərhumun düşdüyü tərəfə getdi.
Gördü yırtıcılar araya almış,
Fərhad nöqtə kimi ortada qalmış.
Heyvanlar dağıldı dağlara sarı,
Gələnlər eylədi əvəz onları.

Fərhadın vücudu batmışdı nura,
Üstünə saldılar ipək, zər, xara.
Ehtiram etdilər hökmran kimi,
Qoyub kəçavəyə əziz can kimi.
Ağladı, sızladı, Şapur dübarə,
Etdi vücudunu o parə-parə.
Sonra kəcavəni çiyninə aldı,
Kəcavə dağ kimi qalxıb ucaldı.
Heyvanlar ağlaşdı, yandı dağ-dərə,
Gəlib toplaşdılar əvvəlki yerə.
Gedənlər gətirib Fərhadı, naçar
Şirindən gizli, bir qəsrə qoydular;
Əvvəl hazırlayıb onun yerini,
Xəbərdar etdilər sonra pərini.
İşdən agah oldu o qəmli canan,
Bildi ki, yar gəlib evinə mehman,
Sevindi, gül qondu gül yanağına,
Yüyürdü getməyə yar otağına.
Gəldi mehmanına mehriban olsun,
Gəldi aşiqinə o qurban olsun.
Silindi qəlbindən hicran məlalı,
Onu şad eylədi canan vusalı.
Banuya söylədi o şirin mələk:
"Xalq məni buraxsın söylə bir az tək.
O yar ki, uzaşdı bir vaxt yanımdan,
Doymuşdum qəmində xəstə canımdan.
O ki, eşidəndə ölübdu Şirin,
Eşqimin yolunda can verdi şirin.
Vəfadə olmadı zərrə nöqsanı,
Yetib indi mənə əvəz imkanı.
O mənim yolumda nisgilli getdi,
Eşqi kəmalını bərqərar etdi.
Mən də könül verdim əhdə, peymana,
İstəmirəm sözüm çıxsın yalana.
O yandı vəfaya, dönərək közə,
İndi növbə gəlib, deyəsən, bizə.
Məncə, gəlib çatıb elə bir halət,
Qonaqdan çəkməyək biz də xəcalət,

Canda vəfasını pünhan eyləyim,
– Yolunda bu canı qurban eyləyim.
Banu sayırsa da məni öz canı
Nə gələr əlimdən ölüm zamanı".
Həlallıq istəyib düşdü torpağa,
Sonra durub getdi xəlvət otağa.
O, divdən sanma ki, qorxub ağladı,
Qapını arxadan möhkəm bağladı.
Könuldə qalmadı qəmi, qubarı,
Yeridi astaca kəcavə sarı.
Arayıb axtardı o natəvanı,
Gördü şirin-şirin yatır mehmanı.
Belə bir yuxunu varmıdır görən,
Gün doğub üstünə oyanmaz rədən?
Belə bir yuxunu görüb o dilbər,
İstədi onunla yatsın bərabər.
Nurlu çöhrəsinə qoydu üzünü,
Qucub cananını yumdu gözünü.
Könüldən şöləyi-ahı ucaldı,
O da Fərhad kimi yuxuya daldı.
Yatdı qalxmayacaq bir də sərvnaz.
Yatdı heç bir zaman qalxıb oyanmaz.
Belə bir yuxudan oyanılarmı,
Ondan oyanmağın mənası varmı?..
Saqi! Qədəh gətir, müdam badə ver,
Yarla həmağuşam, ol amadə, ver!
Huşiyar olmağa qalmasın hacət,
Oyanmaq bilməyim qopsa qiyamət.

## BƏHRAMIN ƏRMƏN-ZƏMİNƏ GƏLMƏSİ

Bu matəmxanədə qara bağladı,
Növhələr düzəldən belə ağladı:
Girib içəriyə o sərvi-rəvan,
Bağladı üzünə qapını daldan.
Məhinbanu ilə əyan nə ki var,

Qaldılar bir zaman ona intizar,
Lakin görünmədi gözə güləndam,
Qaş qaralan kimi, düşəndə axşam,
Banu səbr etmədi sürətlə vardı,
Yerindən qapını çəkib qopardı,
Kəcavəyə tərəf qoydular qədəm,
Qaldırıb pərdəni gördülər, sənəm
Yatıb Fərhad ilə, qucub yarını,
Qırmayıb əhdini, etibarını.
Üzünü söykəyib üzünə yatmış,
Gözlərini qoyub gözünə yatmış.
O sonsuz hicranlı, dərdli gülcəmal
Qovuşub yarına tapmışdır vüsal.
Məşuqə çan verib bir aşiq kimi,
O sərvə sarmaşıb sarmaşıq kimi.
Qucub aşiqini yar canım deyə,
Aşiq də yarını cananım deyə.
Banunu yandırdı onların halı,
Göz yaşı axıtdı, artdı məlalı.
Qalxıb asimana əfğanı çıxdı,
Deyil tək əfqanı, həm canı çıxdı.
Banunun canıydı, qız ondan oldu,
Deyil yalnız ondan, canından oldu.
Məgər can yerinə çıxdı fəğanı,
Onu tərk eylədi fəğanla canı.
Sındı həyat sərvi torpağa düşdü,
Döndü xəzan vuran yarpağa, düşdü.
Qəribə öldülər o natəvanlar,
Qurban olsun belə ölənə canlar.
Dolaşdım dünyanı axtardım, əlbət,
Mən əsla görmədim belə rəvayət.
Salmazdı bir kimsə Fərhadı yada,
Onu Şirin etdi məşhur dünyada.
Kafər iman tapıb dinə yetişdi,
Bu xəbər Xətayə, Çinə yetişdi,
Eşidərək Xəta düşdü min hala,
Döndü viranəyə qəmdən az qala.

Hicrilə dünyanı tərk etdi xaqan,
Balaca qardaşı oldu hökmran.
Ana, oğul deyib özünü diddi,
Fəna torpağına o dəxi getdi.
Bəhram dilavərdi cahan içində,
Nəhəng tək üzürdü al qan içində.
Qılıncı dəhşətli ümmanə bənzər,
Bəla dəryasıydı ondaki cövhər.
Fələk Bəhramına göstərərsə kin,
Olardı önündə Bəhrami-çubin.
Fələyin atını yorar səməndi,
Zühəlin qəddini əyər kəməndi.
Qaranlıq gecədə ox atsa əgər,
Yarar göy üzünü sühadən keçər.
Bilirdi Xətadə, Çində hər adam,
Fərhaddan qalmayır geriyə Bəhram.
Gələndən, gedəndən hər axşam-səhər,
Fərhadı soruşub alardı xəbər.
Fərhad vəfatını bilib Hind, Rum,
Yayılıb Xətadə olanda məlum.
Bəhram sərkərdəydi elə bu zaman,
Hörmət eyləyirdi ona hökmran.
O əsla Fərhadsız olmayırdı şad,
Nigaran olurdu öz şahlığından.
Qardaşından ötrü qəmlənsə də xan,
Nigaran olurdu öz şahlığından.
Gəlib ərz eylədi Bəhram xaqana
“Yayılıb belə bir xəbər hər yana:
Məğribdə bir gözəl mülki-Ərmən var,
İrəmdən səfalı bağ var, çəmən var.
Yaşarmış orada bir şux pərizad,
Sevdasından olub divanə Fərhad.
Əgər xan hökm etsə, yönələrək mən,
Qoşun toplayaram Çindən, Xətadən.
Yollanıb gedərəm haman diyara,
Axtarıb yetərəm Fərhadi-zara.
Tapılsa dərdinə, eylərəm çara,

Tapmasam, nə deyim mən ruzigara".
"Mən razıyam!" – dedi şah haman saat
Bəhramdan edirdi, çünki ehtiyat.
Dedi: – "Fərhad ölüb Bəhram da itsin,
Hər yana xatiri istərsə getsin".
İcazə alınca şad oldu Bəhram,
Çəkib ordusunu olmadı aram;
Yeridi məğribə rəvan qoşunu,
O saysız-hesabsız xaqan qoşunu.
Yetişib Ərmənə çatınca dərhal,
Eldən xəbərləşib tutdu hal-əhval.
Hər şeyi yoxladı birbəbir özü,
Ayırdı dərk edib əyridən düzü.
Qəm oxu hüznlü qəlbini dəldi,
Fərhadın qəbrinə doğru yönəldi.
Sürətlə gedirdi dağ-daş keçərək,
Sanki dolanırdı zülmkar fələk.
El matəm tutarkən hələ Fərhada,
Şirin, Məhinbanu getmişlər bada!
Çəkib vay həsrətə bütün rəiyyət,
Nalə yağıdırırdı, qəlbində həsrət.
Kimdir işdən hali soruşdu Bəhram,
Dedilər "Şapurdur elə bir adam".
Bəhram eşitmişdi bir vaxt bu adı,
Bilirdi ki, sevir Şapur Fərhadı.
Şapur da bilirdi qəmli dünyada,
Könül həmdəmidir Bəhram Fərhada.
Tapıb bir-birini qucaqlaşdılar,
Hal-əhval tutaraq çox ağlaşdılar.
Dostunu görməyə tükəndi səbri,
Öyrəndi hardadır Fərhadın qəbri.
Ah çəkdi, aləmi ah-vayı aşdı,
Göyün günbəzləri odla tutaşdı.
Cahana od salıb bir gecə-gündüz,
Qoyub ayağına o, Fərhadın üz
Dedi ki: – "Ey məni naümid edən,
Möhnətlər içində buraxıb gedən!

Gözüm çıxsın səni görəndə belə,
Lal olum halını soranda belə.
Başın nələr çəkib qürbət içində?
Qalmısan qürbətdə möhnət içində,
Nəsibin ah, aman olmuşdur sənin,
Gül kimi cəmalın solmuşdur sənin.
Əjdərə zərbələr vurmağın hanı?
Əhrimən qolunu qırmağın hanı?
Qəzəblə baxsaydın yerdən səmayə,
Buludlar üstünə salardı sayə.
Qaldırıb külüngü dağa çalardın,
Gürzünlə çöllərə lərzə salardın.
Nə zülüm işlədi duyğusuz hicran?!
Bu ağır yuxudan, Fərhadım, oyan!
Göz açmayırsan ki, gələn qulumdur,
Bu söz doğrudur ki, yuxu ölümdür.
Çoxdur mənim kimi sadiq qulların,
De nədən yanına düşüb qolların?
İraqdır bu işin taqəti məndən,
Can quşum uçmayır neçin bədəndən?!
Qalmasın deyərək yerdə nahaq qan,
Məğribi eylərəm yer ilə yeksan.
Uçurub dağını dəryaya töksəm.
Axıdıb suyunu səhraya töksəm,
Ölənlər olsalar nayab içində,
Batsa minarələr girdab içində:
Yüz min müqəssiri öldürsəm hərgah,
Qanının əvəzi olarmı, ey vah!
Ruhun şad olmasa bu qandan əgər,
Mənə bu əməlim nə fayda verər?
Neyləyim daha mən tiği, kəməri,
Başda tac adlanan bu dərdi-səri?
Zirehi, qaftanı söylə neyləyim?
Oxları, qalxanı söylə neyləyim?
Nə deyib özümü sayım dilavər,
Könül at minməyə nə həvəs eylər?
Necə nərə çəkib girim meydana,

Gör nələr başıma açdı zamana!?
Neçə vuruşlarda mən aram tutum,
Nə qəlb ilə əldə gülgün cam tutum?
Hicrinlə çevrilib mey zəhər oldu,
Həyatım şadlıqdan bibəhər oldu.
Günlərim həsrətlə ah-zara döndü.
Vücudum toz oldu, qubara döndü.
Bəhram qopardıqca yanıqlı nalə,
Camaat ağlayıb batdı məlalə.
Titrətdi bu nalə torpağı, daşı,
Şapur da ağlayıb tökdü göz yaşı.
Dərdü qəm əlindən olunca aram,
Yer öpərək çıxdı kənara Bəhram.
Göndərdi bir nəfər: "Gəlsin Şiruyə,
Versin sualıma, o cavab, – deyə, –
Olsa günahlardan o əgər azad,
Eylərəm lütf ilə mən də onu şad.
Yox əgər eyləsəm şübhə mən ondan,
Verər həyatilə cavab o zaman".
Bu xəbərdən olub Şiruyə agah,
Qorxdu Fərhad üçün qısas ala şah.
Qəzəblənsə daim coşar hökmdar.
Sayar günahsızı o bir günahkar.
Şiruyə olsa da tünd bir hökmran,
Qayanı dəmirlə qırarlar asan.
Çağırdı Şapuru xahiş eylədi,
Açıb həqiqəti ona söylədi,
Dedi: – "Şahidimsən, sən ey pənahım!
Fərhadın qətlində yoxdur günahım,
Qatil atamdısa tökdüm mən də qan,
Verdim cəzasını köçdü dünyadan.
Bunu Bəhram şaha sən ərz eylə, get!
Yerdə qalmayacaq inan bu xidmət.
Bağışlasın məni gəlməməkdə şah,
Hazıram nə əmri olarsa hərgah.
Onu görmək üçün vardır həvəsim,
Səndən budur mənim bil iltimasım,

Olub olmayanı özün söylə sən,
Kərəm et, Bəhramı agah eylə sən,
Etsən Şiruyəyə belə mürüvvət,
Həşrədək şad eylər məni bu minnət".
Şapur görub onun məzlum halını,
Bəhrama söylədi bu əhvalını;
Dedi ki: – "Şahidi pərvərdigardır,
Onun günahı yox, səvabı vardır.
Hüzura gəlməyə acizdir, əlbət,
Mənə bağışla sən, eylə mərhəmət.
Hər nə əmr eləsən, o, canla eylər,
Ürəkdən, sidq ilə, imanla eylər".
Şapur eyləyincə sözünü tamam,
Onun gəlməyindən vaz keçdi Bəhram.
Dedi: – "Sözlərimi bilsin qoy Ərmən,
Döyüşə gəlmədim bu diyara mən.
Bir zamanlar gəlib Xosrov hökmran,
Haman bu ölkəyə vurmuşdur ziyan,
Gərəkdir məmləkət borcuna yetsin,
Sonra Şiruyə də yurduna getsin.
Əmrim budur mənim, sonra da dərhal,
Yollansın Ərmənə xeyli dövlət-mal".
Xəbər verdi Şapur o natəvana,
Minnət saydı bunu Şiruyə cana.
Əmr-fərman verib xəzinə açdı,
Ləli-cəvahirat nə varsa saçdı.
Yetirdi yerinə bu əmri dərhal,
Verdi qatar-qatar, karvan-karvan mal.
Düşünüb-daşınıb Bəhram bir kərə,
Ərmən ellərini yığdı bir yerə,
Dedi ki: – "Xosrovdan ziyan görənlər,
Fərhadı səbəbkar sayırsa əgər!
O adam qorxmadan meydana gəlsin,
Əvəz almaq üçün ziyana gəlsin".
Bu söz çox sürətlə aləmi sardı,
El bütün ağlayıb fəğan qopardı.
Dedi: – "Biz elərik bu iltiması,

Fərhadın canımız olsun fədası.
Biz onun yolunda hər an keçərik.
Nəinki dövlətdən, candan keçərik".
Bəhram xeyli adam ayırdı dərhal,
Versin camaata ədalətlə mal.
Şahlıq əsasını ölkədə qurdu
Banunun nəslindən kim qalıb sordu.
Onlardan birini görərək layiq,
Onu bir hökmdar saydı xəlayiq.
Ərmən torpağının o şahı oldu,
Şahı oldu demə, pənahı oldu.
Ədalət ayini yaydı hər yana,
Döndü abad oldu uçuq virana.
Haranı etmişsə xərabə Xosrov,
Düzəltdi yenidən bu tazə Xosrov.
Bəhram ona şövkət, təmtəraq verdi,
Taxti-tac, xəzinə və bayraq verdi.
Tapdı məramilə bu taxt payə,
Saldı üzərinə çətiri sayə.
Hümmət göstərərək beləcə Bəhram,
Onun şahlığına verdi sərəncam.
Sonra qoşunlara payladı sərvət,
Dedi ki: "Çəkdiniz xeyli əziyyət,
Gediniz qovuşun əyalınıza,
Yetişin vətənə, mülk-malınıza".
Belə bir rəftarı ürək dağladı,
Ordu vidalaşıb xeyli ağladı.
Dedi: – "Şaha deyin aldı arzu-kam,
Sevgili Fərhada yetişdi Bəhram".
Ordu rəvan olub yenə tutdu yol,
Sən də harda olsan ürəyi xoş ol!
Bəhram ordusunu eylədi azad,
Qurtarıb qayğıdan özü oldu şad.
Fərhadın qəbrinə dönüb dübarə,
Girdilər Bəhramla, Şapur məzarə.
Fəna mulkundə can təslim etdilər,
Bəqadə Fərhada qoşa yetdilər.

Şahlıqdan əl çəkib o xakrahlıq,
Tapıbsa bu idi həqiqi şahlıq.
Saqi! Fəna camı gətir, mənə ver,
Birini içmişəm, doldur yenə ver!
Qoy salsın himmətin başıma sayə,
Bu camla yönəlim mən də fənayə.

## ŞAHZADƏNİN TƏRİFİ

Bu dünya bağı ki, bir nəqşi-Çindir
Nə Çindir, bəlkə də, xüldi-bərindir.
İnsan nəzər qılsa, bu bağ içində,
Yüz əlvan gül tapar yarpaq içində.
Hər gülün öz rəngi, təravəti var,
İncə bir misalı, lətafəti var.
Saçsa da ətrini gül dörd bir yana.
Gəlməz bülbül kimi ancaq bəyanə.
Əgər açar isə rəngin bir çiçək,
Mənalar əks edər hər halı göyçək.
Görünüşdə əgər bənzəsə gülə,
Lakin cəh-cəh vurub dönsə bülbülə,
Bu, qəribə olar həddən ziyadə,
Bənzəyər belə bir gülə şahzadə.
Adına məlahət kanı deyərlər,
Özü bir dəryadır, kamalı gövhər.
Fəsahət bağında şahə qəribdir,
Şahlar qəribəsi, o şah qəribdir.
Canlar bağışlayar gələndə səsi,
Ölünü dirildər İsa nəfəsi.
Hər məna olarsa gizlin sirr əgər,
Açar dərhal onu təbi həll edər.
Əqlin kəmalını şahzadə qoçaq,
Hələ körpə ikən, sayardı uşaq.
Sənin ünvanına deyilibdir bu:
“Kiçik yaşdan ulularin ulusu”.
Baxtının ulduzu bir aydır taza,

Sənsən bəzək verən bu dünyamıza.
Bədr olan zamanda hilalın sənin,
Ötəçək günəşi kamalın sənin.
Günəşdən nurunu almasa qəmər,
Bədr olub parlamaz uzun geçələr,
Günəşlik istəsən kəsbi-kamal et,
Kəsbi-kamal ilə səadətə yet.
Hər kim ki, təlimdən məlalət tapar,
Alimlər yanında xəcalət tapar.
İnsan iqtidarlı zalım olarsa,
Nüktədan olarsa, alim olarsa,
O zahid sayılar adam içində,
Ona göz tikərlər islam içində.
Alimə eylərsə təzim bir insan.
Hörmət peyğəmbərə eyləyir inan.
Şah olarsan əgər agah sənsən,
Əgər agah isən sən, şah sənsən.
Tuti əgər tutsa nitqdən xəbər,
Adına şahənşah tuti deyərlər.
Tovuz quşunun min zivəri vardır.
Başında bir gözəl əfsəri vardır,
Bu əfsərlə onu şah çağırmazlar,
Çünki təəllüqü Hindistana var.
Bilik şah eylərsə heyvanın adın,
Neçin şah etməsin insan övladın?
Zati elm nuri tapan hökmran,
Yaşayar yaxşı bir adla hər zaman
İskəndər elm ilə qazandı şöhrət,
Ona tabe oldu külli-təbiət.
Çox olmuş onuntək əhli səltənət,
Kimə nəsib olub bir belə qüdrət?
İki min il ötüb minlərlə Loğman,
Onun hikmətilə qalmışdır cavan.
Teymurxan nəslindən sultan Uluğbək.
Kainat görmədi sultan onuntək.
Eylədi nəslini zamanə bərbad,
İndi bir nəfər də eyləməyir yad,

Elə yollar gəzib tapdı o sultan,
Ona heyran olub yerlə asiman.
Qurduğu rəsəddən agah cahandır:
Yenə bu cahanda bir asimandır.
Öyrənib bilərək o asimanı,
Yazdı əmək çəkib "Zeyci-Gurgani"
Hələ həşrə qədər bu sözüm haqdır,
Onun ehkamından yazılacaqdır.
Bilikdir görünən gözlərə zinət,
Bilikdir şahlara zinətlə sərvət.
Bilik qazanmaqda qane olma sən,
Öyrəndikcə oxu, yenə də öyrən.
Elm dünyasına yürü güzər qıl!
Dinin ürfanına yetsin nəzər qıl!
Versə başağrısı bu ürfan sənə,
Yetirsə bir məlal, bir ziyan sənə,
Tarix öyrənməyə get rəğbət eylə!
Qəlbə səlatini həmsöhbət eylə!
Öyrən ki, dünyadan kam aldı kimlər,
Bu qədim deyrdə gör qaldı kimlər?!
Cəmşid Zöhhak hanı, Təhmürəs hanı?
Hər biri qəsb etdi külli-cahanı.
Birisi bir nemət alıb getdimi?
Yoxsa aldığını salıb getdimi?
Onlar bu dünyadan tez-gec yoxaldı,
Özləri getdilər, adları qaldı.
Bu ad yaxşıdırmı, yaxud yamandır,
Bunun sirrini bil, öyrən, amandır.
Qoy sənə dünyada bu olsun şüar:
Çalış yaxşı bir ad qoy get yadigar,
Lütfilə eyləyib rəğbət hikmətə,
Dur bax açıqgözlə bu təbiətə.
Öyrən məzacini mürur-zəmanla,
Hər şeyi dərk eylə, yaxşıca anla!
Dolanıb gəzdikcə sən bu cahanı,
Öyrən gəl ondakı yaxşı-yamanı.
Hər nə faydalıdır ona sən meyl et,

Lakin hər işdə tut orta vəziyyət.
Hər nə ziyanlıdır ondan gen dolan,
Çətin sənin üçün qoy olsun asan.
Hər nə məcazına olsa güvara,
Ona meyl eyləmə çox da aşkara.
Demiş hikmət əhli bu sözü hər an.
Az yaxşı "üstündür hədsiz yamandan"
Olarsa faydalı əgər bol yemək,
Çox da uyma ona, əlini tez çək.
Həzmə getməmişsə yediyin tikə,
Qoşma bədənini izafə yükə.
Misilsiz olsa da abi-həyat bil,
Onu hər bir mədə həzm edən deyil.
Axtar qanunları, əhli-hikmət ol!
Kefini kök saxla sağ-salamat ol!
Tarixi öyrənib dərk edəndə sən,
Tayfalar neylədi, get bunu öyrən.
Öyrən sultanların məharətini,
Gizli tədbirini, siyasətini.
Niyə zülm etdilər, niyə ədalət,
Nə işə eyləyir bunlar dəlalət.
Nədən məmləkəti abad etdilər,
Nədən ölkələri bərbad etdilər.
Tapdı vətənləri təravət nədən,
Qaldı ölkələri səlamət nədən?
Qoşun, qanun tapdı güldü bayrağı,
Pozğun nədən düşdü zülümkar yağı.
Nələr hansı şahın oldu surəti,
Aləm yad eyləyir o təbiəti,
Bu söz zaman-zaman edildi təkrar,
Nəzər qıl bunlara, öyrən hər nə var.
Sən belə eyləsən gülər ürəyin,
Onlara meyl edər arzun, diləyin.
Bunlar aləm içrə qoy faydan olsun,
Səni yaxşılığa aparan olsun.
Gör necə tapdı şah dini, dünyanı,
Sən də yaxşı öyrən bu cüt mənanı.

Bu qoşa mənaya adət eylə sən,
Şahın əməlini yaxşıca öyrən!
Mənim ki, qələmim yazmış nəsihət,
Xoşlayırsan əgər onu düstur et!
Söz açıb, dediyim həngamələrdən,
Çıxar bir nəticə özün üçün sən.
Əgər sözlərimdən olsan kefi saz,
Mənim ruhum üçün dua et bir az.
Xeyir versə əgər nəsihət sənə,
Duaların verər mənfəət mənə.
Nəsihət verənlər dürr etsə nisar,
Ona kamallılar eylər etibar.
Mey gətir, saqiya! Könlümü şad et!
Qədim qulluğumun haqqını yad et!
Nəsihət verirəm, peyapey gətir!
Eşit nəsihəti, mənə mey gətir!

## SON SÖZ

Fikrin verdi mənə aləmdə payə;
O günəş kölgəlim salanda sayə,
Gördün qələsinə atımı sürdüm,
Günəşi tozların içində gördüm.?
Atım ləpirini dünyaya saldı,
Utarid qələmi sandıqda qaldı.
Birceysin başından qapdım elə tac
Ki, qaldı ömürlük papağa möhtac.
O qədər sitarə saçdım ki, yerə
Üfüqlər qərq oldu sitarələrə.
Səpdim ulduzları dünya üzünə,
Qaldı pul altında sanki xəzinə,
Hər biri Birceysə, Nahidə bir eş,
Nə Birceysə, nə Nahid, nə parlaq günəş.
Yüksəlib, ucalıb keçdim göyləri,
Günəşin nuruna qərq etdim yeri.
İşıqlanan kimi bütün yer üzü,

Yetirdim murada hər baxan gözü.
Həsrət gözü ilə baxan hər adam,
Çatdı istəyinə aldı arzu, kam.
Hər kim ki, dünyaya kor gəldi getdi,
Sanma bu ziyadan o kamə yetdi.
Bir insan üçün ki, gündüz gecədir,
Gör onun cahanda halı necədir!
Günəş yağdırarsa nur, qaş-daş kimi,
Yenə görməyəcək o xəffaş kimi.
Günəş ki, aləmə saçdı nurunu,
Milçək də, ünqa da hiss etdi onu.
Yüz belə nur əgər aşkar olarsa,
Onu duymayacaq bayquş, yarasa.
Töksə qabağına kim qanmazın zər,
Elə bil eşşəyə zəfəran verər.
Duymaz yanan şamı xallı kəpənək,
Onda yanmaq üçün pərvanə gərək.
Bir gül ki, aləmi gülşən eyləyər,
Nur ilə gözləri rövşən eyləyər.
Onu insan gərək daima duya,
Vəbadır gül ətri dozanqurduya.
Dozanqurdu üçün açmaz bağda gül,
Onunçün ötməyir budaqda bülbül.
Nə qədər aləmdə dozanqurdu var,
Çöldə, səhralarda peyin yumurlar,
Bu işə çanını qurban eyləyər,
Başını bu yolda çovkan eyləyər.
Bu top ancaq onun göhərganıdır,
Göhər, dürr demə ki, nəqdi-canıdır.
Duymayır ömründə ətirli gülü,
Bəyənsin necə o sarı bülbülü?
Bulbül xoşlayarsa əgər təzəyi,
O da sevə bilər gülü, çiçəyi.
Ariflər, aqillər anlayar ancaq,
Kimin tərəfində rövnəq tapır haqq.
Göyləri mat qoyan o bülbül mənəm,
Min bir xal vuraraq ötən bil, mənəm.

Qəmi-eşqim içrə əfqanı dinlə,
Əfğanımdan min bir dastanı dinlə!
Ey gülşən bülbülü, bustan bəzəyən,
Yox, yox bustan deyil, dastan bəzəyən.
Nəvai! Yalanın həddini aşdı,
Deyəsən, bir qədər dilin dolaşdı.
Vuruş dəstgahını topla bir zaman.
Bir məna, bir fayda yoxdur davadan.
Əl çək şairliyin boş şüarından,
Ürəklə gəl danış könül varından.
Mən o torpağam ki, bilmərəm təlaş,
Qoynumdan qaldırmaz ətirli gül baş
Başlara qonmaram dönüb qubara,
Ayaqlar bağrımda açılar yara.
Yüz təpik yemişəm zəmanədən mən,
Seçilmərəm qırıq peymanədən mən.
Təpiklər yedisə bu dərdli torpaq,
Qoyuntək qorxuya düşmədi ancaq.
Məşəqqət qoşunu tapdayır onu.
Ötür, izləyərək ordu-ordunu.
Gah çapıb yetişir sərsəri möhnət,
Yağdırır üstünə min qorxu, dəhşət.
Əsir həvadisin çılğın küləyi,
Sökür binasını, sınır dirəyi.
Edir darmadağın bütün üzvünü,
Demə tək üzvünü, hətta cüzini.
Həvayilər kimi biçarə edir,
Əsil məqamından azara edir.
Bəzən dağa vurur, bəzən səhraya,
Qaldırır çöp kimi bəzən havaya.
Dünyanı gəzdirir ruzgarlar kimi,
Göydə dolandırır buxarlar kimi,
Yel kimi səslənər o fəğan eylər,
Didərginlik içrə tərki-can eylər.
Hadisələr yeni sakit olanda,
Onu torpaqlara salar bir anda.
Necə qaldırmışdı onu göy tağa,

Salar eləcə də qara torpağa.
Demək, qaldıranda uca göylərə,
Qəsdi vurmaq imiş qəflətən yerə.
Saltmış fələk onu cəfayə, dərdə,
Üstəlik əzmişdir hadisələr də.
Bir ovuc torpağa dərd çölündə bax,
Qəhərlər yedirdi kinli göy tabaq.
O gah ayaqlarda zəlil, xar olur,
Gah başa qoymağa toz, qubar olur.
Təskinlik dövləti ona bar verib,
Bu qara torpaqda məkan göstərib.
Bir yerdə yerləşib qalsa bu torpaq,
Məndən çör-çöp görər zəmanə ancaq.
Olmaz həşəmim də sakit cahanda,
O da seyrə çıxar durmaz bir an da,
Birləşərsə əgər bu toz, bu torpaq,
Bürünər səbzəyə, qızıl gülə bağ.
Elə torpaq var ki, yolunda dehqan,
Eləmiş hər zaman öz bağrını qan.
Onu şumlayaraq çəkdikcə zəhmət,
Vermiş üzərinə xətlərlə zinət,
Çəkib ətrafına uca bir barı,
Edib dəmir kimi möhkəm divarı,
Əkib o torpağa güldən, çiçəkdən,
Qorumuş naşıdan, əsən küləkdən.
O yerə yadların dəyməz ayağı,
Nə yad, cürət edib gəlməz bir yağı,
Verər öz vaxtında o gülzara su,
Qorunar torpağın hər gün abrusu.
Tapanda nəvaziş belə bir çəmən,
Qönçələr gül açıb gülər yasəmən.
Əlbəttə, hər tərəf gülüstan olar,
Hər yan ətir saçar, al-əlvan olar.
Olar yer üzünün bəzəyi hər gül,
Oxuyar şaxlarda sevdalı bülbül,
Sükun mənzilində bu mən torpağa,
Fələk aman versə qalxıb ayağa,

Get-gəl möhnətindən o şad eyləsə,
Elin çəfasından azad eyləsə,
Üstümdə zülümkar insan durmasa,
Bağrıma yüz dəfə yara vurmasa,
Qəlbimi etməsə min dərdə nişan,
Olmasa ürəyim həsrətlə şan-şan.
Zalım az yedirsə mənə qubarı,
Zərbələr görməsə könlüm diyarı.
Şahdan kam almağa hər bir tamahkar,
Qələmə verməsə məni günahkar;
Hökmdar yanında edib məzəmmət,
Məni etməsələr müxatəb, əlbət.
Olub həsrətimdən, dərdimdən agah,
Tərəhhüm eləsə əhvalıma şah,
Bir nəzər yetirsə işrət bağına,
Könlüm dönsə açan gül budağına,
Gecəli-gündüzlü iyirmi dörd saat,
Azad nəfəs alıb olarsam rahat,
Bəsləyərsə mənə belə qayğı şah,
Kimsədən görməsəm ziyanlar hərgah,
Yazarsam pərişan çox namələrdən,
Ölçüsüz, hüdudsuz həngamələrdən,
Yaxşı itilərsəm qələmi hərgah,
Yazarsam təb ilə rəqami hərgah,
Olar əsərimin sənəti artıq,
Cəzb edər özünə diqqəti artıq.
Əgər tale məndən kənar getməsə,
Baxtımın ulduzu həsəd etməsə,
Sakit bir yer tapıb, bir guşə tutsam,
El məni, mən eli hərgah unutsam,
Eləsə şah mənə belə bir kömək,
Olsa ancaq işim yalnız söz demək,
Arabir də etsə iltifat əgər,
Nəzm ilə nazimdən olsa baxəbər.
Əlilə sözümə zinət yetirsə,
İşimə ənamla rəğbət yetirsə,
Demirəm ki, necə Xosrov, Nizami,

Ya ki, nəzm əhlinin başçısı Cami,
Çəkib dil xəncəri təbil çaldılar,
Bütün söz mülkünü coşub aldılar,
Onlarla yanaşı girib meydana
Mən də vuruşaram mərdü-mərdana.
Yəqin, olsa lütfi əgər pənahım,
Hökmdar olarsa istinadgahım,
Bilinər mənim də güçüm, qüdrətim,
Əsərlə dünyanı tutar şöhrətim.
Belə olsa mənə etməz məlalət,
Onda dostlarım da çəkməz xəcalət.
Gözəl əsərimdən xalq olar agah,
Mənə əhsən deyər ehsan ilə şah.
Nizami Gəncəni, Bərdəni aldı,
Əhli Rum da onun əlində qaldı.
Çəkib söz qılıncı Xosrov mərdana,
Gedib çıxdısa da ta Hindistana,
Cami də əcəmdə hey vurdu nevbət,
Ərəbdə qurdusa cəlalı şövkət,
İstərsə bir olsun, istərsə min bir,
Bütün türk elləri ancaq mənimdir.
Xətadən başlayıb Xorasanadək,
Ellər fərmanımla ömür sürəcək.
Şiraz da, Təbriz də mənim yerimdir,
Orda şöhrətlənən öz şakərimdir.
Türk mənim sözümə könül can verib,
Bircə türk verməyib türkmən verib.
Hansı bir diyarə fərman apardım,
Onu almaq üçün divan apardım.
Divanla almışam dediyim yeri,
Belə fateh deyil, divanbəyləri...
Dəftərlər dolusu mən qara yazdım,
Hüdudsuz, ölçüsüz macəra yazdım.
Şükürlər olsun ki, bu qəm dastanı,
Asudələr üçün matəm dastanı,
Ömrüm naməsini cırmadan əyyam,
Şirin vüsal kimi olmuşdur tamam.

Soruşsan ki, nə vaxt tamama yetdi,
O, səkkiz yüz səksən doqquzda bitdi.
Nəvai seyr edib söz bostanını,
Yazıb vurdu başa öz dastanını.
Bir nöqtə qoymadı yazdı mükəmməl.
Saqi! Xumarlanım, badə gətir, gəl!
Doldur ağzınadək cami-Cəm gətir
Məst olum, söz deyim dəmadəm, gətir!
Saqi! Önümdəki bu əsər ki, var
Onu qurtarmağa çox oldum xumar.
Gətir gəl dayanma, saqi, gülgünü,
Tutum dostlarımdan mən üstün onu.
Gətir, sözlərimi yazıb qurtardım,
Dayan bir ləhzə ki, mənzilə vardım.

# P O E M A Y A   G İ R İ Ş

## I

## SÖZÜN TƏRİFİ

Səs-soraq yox ikən hələ cahandan,
Cahanın sakini bəni-insandan,
Nəqqaşlar nəqqaşı o pərvərdigar
İstədi eyləsin bir nəqş aşikar.
Yeddi Göy yaradıb çəksin yuxarı,
Üfiqdə bənd etsin həmin tağları.
Qatların birini mavi yaratsın,
Başımız üstündə onu ucaltsın.
“Ol!” deyə hökm etdi, bu bir kəlmədən
Yarandı yerlə göy, dəniz, dağ, çəmən.
Yoxluq varağında o nəqqaş xuda
Müxtəlif naxışlar elədi peyda.
Sözlə bu naxışlar olunca aşkar,
Ünsiyyət yaratdı sözlə adamlar.
Sözün barəsində bunu deyim ki,
Bütün varlıqların o olub ilki.
Söz əvvəl yaranıb, sonra məxluqat,
Sözdən sonra gəlib bütün kainat.
Taxtı da, donu da sözdür həyatın,
İlki də, sonu da sözdür həyatın.
Hər kəs ki, dünyada həyat tapıbdır,
Bərk ayaqda sözlə nicat tapıbdır.
Kimin ürəyinə vurmayıb nəştər
Fəlakət carcısı acı bir xəbər?
Gücüylə heyrətə qərq edər səni.

Geyimsiz-kecimsiz görünmür fəqət.
Mey içmiştək üzü qızarıb yanır,
Könül eyvanından nazla boylanır.
Bəzən də ayrılıb öz yuvasından,
Keçib yiyəsinin dar boğazından
Elə bir vəlvələ salar aləmə,
Elə bir sədayla dolar aləmə
Ki, onu dərk edən hər bir əhli-hal,
Olar bu mənanın təsirilə lal.
Bitir söz ağacı ruhun başında,
Şirin bar yetişir hər budağında.
Candır gülüstanı hər bir insanın,
Sözsə bülbülüdür o Gülüstanın.
Bülbülün nəvası sözdür-şirin söz,
Cəh-cəhli avazı sözdür-şirin söz.
Yerinə düşməyən söz tufan salar,
Susar söz bülbülü, nəğməsiz qalar.
Yarəb, bir nəzər sal söz bağçasına,
Sən bülbül lisanı vermisən ona.
Çatdır ucalığa sən bizim dili,
Susmasın bu bağın şeyda bülbülü!
Xüsusən, Nəvai binəvanı sən,
Binəsib eləmə mərhəmətindən!
Solub-saralmasın söz gülüstanı,
Nəğməsinin səsi tutsun hər yanı!
Sənət gülüstanı tər güllər açsın,
Xoşavaz ilhamı könüllər açsın!
Nurlandır şamını, saçsın gur işıq,
Ətirli gülləri versin yaraşıq.
Təbini sel eylə, qədrini ali,
Coşdursun kəlamı obanı-eli!
Artıb genişlənsin sənət gülzarı,
Kirimək bilməsin şeir quşları!
Nəğməsi xoş olsun, sözləri şirin,
Oxşasın qəlbini bütün ellərin!

## II

Nəzmin nəsrdən üstünlüyü barədə, beş xəzinə sahibləri Nizami Gəncəvi ilə Xosrov Dəhləvinin tərifi və özümü onların yanında dənizin bir damlası, günəşin bir zərrəsi hesab etməyim barədə söz.

Söz can gülşənində meh olub əsər,
Könul dənizində inciyə bənzər.
Gümüş pullar kimi parlar əsl söz,
Qəlp pulu tez seçər, tez ayırar göz.
Sözdən yaradılmış hər bir əsəri
İki qismə bölüb söz arifləri.
Fərqini deməyə eləsəm əzm,
Bir qismi nəsrdir, o birisi nəzm.
Həzm nəsrə görə yaranır çətin,
Hörməti ucadır, odur ki, nəzmin.
Yaxşı sözlər olur elə ki zahir,
Düzülür yan-yana sanki cəvahir.
Nəzm ilə yazılmış təsirli əsər
Bir sapa düzülmüş inciyə bənzər.
Artar parıltısı, bil ki, yaqutun,
Sağında, solunda dürr olsa onun.
Ümman dürrü ilə mavi firuzə
Yanında olanda xoş gələr gözə.
Zərgər bu nizamı versə qaş-daşa,
Dünya heyrət ilə edər tamaşa.
Nizama salmadan dürrü, qaş-daşı,
Töksə qabağına əgər bir naşı,
Par-par parlasa da bu ləl, bu gövhər,
Sapa düzülmüşə olmaz bərabər.
İrili-xırdalı gövhər yığını
Əvəz edə bilməz boyunbağını.
Nəzm ilə nəsr də bu nisbətdədir,
Onlardan hərəsi bir qiymətdədir.
Tərif eləyənlər olsa da nəsri,
Nəzmin nəsrə görə ucadır qəsri.
Sözdə ki, həm ölçü oldu, həm ahəng,
Nə şəkildə olsa, qəşəngdir, qəşəng.

Hər şeirə qəlbimdə varsa da maraq,
Məsnəvi yazmağa mailəm ancaq.
Qalan şəkilləri saymasam da mən,
Tanışdır onlarla hər şeir sevən.
Məsnəvi yazmağım münasib işdir,
Çünki məsnəvidə meydan genişdir.
Orda söz açsaq da yüz əhvalatdan,
Hər şeyi aydınca anlayar insan.
Orda rəqiblərin şeir məclisi
Sənət dürlərilə mat qoyur bizi.
Şeir köhlənini yaxşı sürən kəs
Eləyər fələyin köhlənilə bəhs.
Onun-sonsuz səma yarış meydanı,
On dörd gecəlik ay olar çovkanı.
Bir kalamı gözəl, sözləri gövhər,
Şeir meydanında göstərib hünər,
Xərabə dünyada Gəncə əhlinə
Bəxş edib beş yeni dolu xəzinə.
Lələk qələmiylə o, ağ varaqda
Çox inçə mənalar elədi peyda.
Məna yox, hər sözü qənddi, şəkərdi,
Mürəkkəbi sanki müşk-ənbərdi.
Qəlblər bu şəkərdən şirinləşərdi,
Canlar söz mülkünə əsir düşərdi.
Belə vəhdətini müşk ilə qəndin
Nə Hindistan görüb, nə də qədim Çin.
O, həvəslə qatıb müşk-ənbəri,
Mürəkkəb rənginə saldı şəkəri.
Onun mürəkkəbi müşk ilə hisdi,
Yazısı müşkdən, güldən nəfisdi.
Könül telləritək zərif kəlamı,
Açardı qəlbdəki Gizli məramı.
Ruhun pərdəsiydi hər səhifəsi,
Mürəkkəbi isə-həyat töhfəsi.
Elə ki, qələmi ələ alırdı,
Aləm qüdrətinə heyran qalırdı.
Həyat çeşməsiydi mürəkkəb qabı,

Xızr ondan almışdı həyat Gülabı.
Şairlərin ən xoş kəlamıdır o,
“Xəmsə”ni yaradan Nizamidir o.
“Xəmsə” demək azdır adına onun,
Düz beş xəzinədir, sahibi Qarun.
Keçirsə “Xəmsə”ni hər kəs nəzərdən,
Min xəzinə tapar hər bir əsərdən.
Hər bahalı dürrü bir məmləkətin
Bütün xərclərini ödəyər, yəqin.
Belə dürr yaradan böyük sənətkar
Tacidar olmağa ixtiyarı var.
Çox rəvan işlərdi onun qələmi,
Dürr ipək üstündə sürüşən kimi...
Xosrov Dəhləvidən başqa heç bir kəs
Nizami ardınca yol gedə bilməz.
Əmir Xosrov adı dillərdə gəzir,
Bütün Hindistanı etmişdi əsir.
Şairlərçün o bir bəladı, bəla,
Bəla yaratmışdı allahtaala.
Alanda əlinə lələk qələmi,
Yaxıb-yandırırdı bütün aləmi.
Qəlbinin sönməyən alovu-odu
Bütün ürəklərə qortək dolurdu.
Sevgi atəşgahı içində Xosrov
Sanki səməndərdi, sanki od-alov.
Mən onun nəzminə səma deyirəm,
Ulduzdur hər incə məna, deyirəm.
Ürəyə hər varaq şeri qanaddır,
Mənalarda dolu bir kainatdır.
Mənası eşq olub orda cahanın,
Bəşər həyatının, cism ilə canın.
Şerinin binası-fələk binası,
Cahan yazısıdır yazdığı yazı.
Vüsal gecəsinin nurudur sözü,
Ya canan zülfünün torudur sözü.
Sən bu yazıları oxu mükəmməl,
Məna quşlarını ovlamağa gəl.

Bir bina ucaldıb əvvəlki memar,
Ona zinət verib, bax, bu sənətkar.
O, gül-çiçək əkib neçə yüz cürə,
Bu, şeh çiləyibdir həmin güllərə.
Nizami yaradıb təzə bir mələk,
Bu, ona vəsməylə verib bər-bəzək.
Nazlı bir sərv əkib Nizami öncə,
Xosrov da gedibdir onun izincə.
O, bir gülüzlüyə verib sözlə can,
Bu da qalmayıbdır öz ustadından.
Bu, ona oxşayır, o, buna, şəksiz,
Əkiz doğulublar, elə bil, əkiz.
Düzü, Əşrəf adlı biri də vardı,
Dastan yaratmağa çox can atardı.
Yaxşı olmasa da yazdığı şeir,
Yaman deməyə də dilim gəlməyir.
Çox yazıb-yaratdı Əşrəf boş yerə,
Çatmadı əvvəlki iki şairə.
Mən də haldan düşüb, tamam üzüldüm,
Özüm öz canıma yağı kəsildim.
Bir qətrə içməyə aciz ikən mən,
Bir dərya nuş etmək keçir qəlbimdən.
Tədarük etmədən bir ovuc torpaq,
İstədim uça bir saray uçaltmaq.
Qamışdan zəifkən, bir xəzinəyə
Baş qoymaq istədim, şahmaram deyə.
O iki şairlə yanaşı durmaq
İstəyim olmuşdur mənim də hər vaxt.
İstərəm onları mən də izləyim,
Onların sözünə bənzər söz deyim.
İstərəm göstərib öz hünərimi,
Xorasandan çəkib söz ləşkərimi.
Ölkələr fəth edib o ləşkərimlə,
Ruma, Hindistana salam vəlvələ.
İstərəm, bilsinlər – çox güclüyəm mən
Rumun qeysərindən, Hind racəsindən.
Yox, yox, boş-boşuna öyünməkdi bu,
Cəfəng danışmaqdır, sözün doğrusu.

Şahmat taxtasında çəkərək qatar,
Dayanıb üz-üzə qaralar, ağlar.
De, neyləyə bilər adi piyada
Cəng meydanı olan həmin taxtada?
Nə qədər cəhd edib vuruşsa hətta,
Qalar fillə atın ayağı altda.
Rumilərin atı zorlu-qüvvəli,
Qara hindlilərin qorxuncdur fili.
Piyada onların önündə, şəksiz,
Bir qarışqa kimi qalar köməksiz.
Açiz olduğunu eləyincə dərk,
Torpaqdan güc alıb boy atsın gərək,
Nəhənglər önündə əl çəksə lafdan.
Ucalıq tapar o bu etirafdan.
Sonra güclü şirə meydan oxuyar,
Özünü yeni bir Süleyman sayar.
Bəlkə də, Nəvai bu minval ilə,
Qəlbindən geçəni gətirdi ələ.

## ÇƏRŞƏNBƏ AXŞAMI

### BƏHRAM ŞAH QIRMIZI SARAYDA

Çərşənbə axşamı nurlu asiman
Gül səpdi ulduzlar qığılcımından.
Yaqut şəfəqlərdən xına sürtərək
Boyadı saçını qarımış fələk.
Gülgün libas geydi Bəhram şah o gün,
Gülgün taxt düzəldi gülgün qəsr üçün.
Bu şənlik, bu büsat başa yetincə,
Gülgün sarayına yollandı tezcə.
Çıxdı qabağına gül bənizli yar,
Gül kimi al idi geydiyi paltar.

Əyləşdi taxtında o qızla Bəhram,
Əldə gülgün şərab, yaqut rəngli cam.
Onlar nuş edincə beş-on piyalə,

Sanki üzlərində açıldı lalə.
Qədəhlər o qədər dolub-boşaldı,
Qaranlıq günəşi qoynuna aldı.
Qızarmışdı şahın gözləri meydən.
Bu gün də məclisi keçsin deyə şən,
Çağırıb əmr etdi nökərlərinə
Ki: “Məclis söhbətlə canlansın yenə!”
Onlar atlanaraq gəzib hər yanı,
Tapdılar bir şirin sözlü insanı.
Onu tez götürüb qəsrə getdilər,
Şahın fərmanından hali etdilər.
Pərdənin dalında yer verib rahat,
Dedilər söyləsin xoş bir əhvalat.
Gəzdiyi dağlardan, düzlərdən desin,
Eşidib-bildiyi sözlərdən desin.
Anlayıb fərmanı o söz ustadı,
Xeyir-dua edib sözə başladı.

## DÖRDÜNCÜ SƏYYAHIN HEKAYƏTİ

“Şahımız hər zaman xoşiqbal olsun!
Üzü bəxti kimi güldən al olsun!
Mey olsun itinə düşmənin qanı,
Kef-damaq içində keçsin dövranı!”
Bitirib duanı o inci sözlü,
Bu şirin söhbəti dastana düzdü:
“Bir padşah var idi Dehlidə, şanlı,
Şahlar arasında çox adlı-sanlı.
Dolu xəzinəsi, hədsiz sərvəti,
Başından aşırdı varı, dövləti.
Uca sarayları qatar-qatardı,
İlxıyla atları, filləri vardı.
Dünya heyran idi ədalətinə,
Çağrılırdı adı cəlallı Cevnə.
Onun səxavəti məşhurdu eldə,
Söylənirdi adı ağızda-dildə.

Bir bəhanə tapıb padşah hərdən
Hədiyyə paylardı xəzinələrdən.
Kim desəydi ona bir qəlbaçan söz,
Daş-qaşlı bəxşişlər verərdi yüz-yüz.
Belə deyirlər ki, yoxsul bir nəfər,
Fələyin hökmüylə düşüb dərbədər,
Dağları, daşları çox eyləyib yurd,
Gətirdi Cevnəyə bir səbət armud.
Lakin gözlədiyi muzd üçün hər an
Yaman darıxırdı o acgöz insan.
Bir gün şah söylədi: "Tez tapın onu,
Soruşun qəlbindən keçən arzunu!"
Tapıb soruşdular. O dedi aşkar:
"Arzum bir tişədir, bir də ki, mişar!"
Şah ondan soruşdu mətləbi, sirri,
O, cavab verdi ki: "gəzib hər yeri,
Hansı bağda tapsam həmin meyvədən,
Kəsib yox eləmək istəyirəm mən".
Şah xəbərdar olub onun halından,
Ənam vermək üçün yazdırdı fərman.
On dinar etməzdi verdiyi sovqat,
Şah onun payını artırdı min qat.
Vəzirlər etiraz edib Cevnəyə,
Apardılar onu düz xəzinəyə.
Ki, anlasın çoxdur verdiyi xələt,
Çoxdur bir nəfərə bir belə dövlət.
Cevnə nəzər salıb bu hədiyyəyə,
İkiqat artırdı, – bu azdır, – deyə.
Cevnə sarayında belə əhvalat
Təkrar olunurdu hər gün, hər saat.

Bir gün öz taxtında oturmuşdu şah,
Damağı çağ idi, canı da gümrah.
Ehsan buludları dürr yağdırırdı,
Yanında bir nəfər qonağı vardı.
Güzgü gətirmişdi şaha o mehman,
Onu kim üzünə tutsaydı bir an

Doğru sözlü isə görünərdi ağ,
Qara görünərdi yalançı ancaq.
Çox adam sınaqdan keçirib onu,
Bildi bu hikmətin düz olduğunu.
Şah ona o qədər verdi dövlət, mal,
O, yüzdən birini etməzdi xəyal.
Təşəkkür dürrünü səpəndə mehman,
Şah imtahan üçün soruşdu ondan:
"Dedin çox yerlərə etmisən səfər,
Çox dünya əhlinə salmısan nəzər.
Mən kimi rəhmdil bir insanı sən
Görübsənsə əgər, de, çəkinmədən".
Şanlı hökmdarın bu sualından
Yaman əndişəyə düşdü o mehman.
Desəydi: "Görmüşəm", inciyərdi şah,
"Görməmişəm", – desə, yalandı, eyvah!
Yazığın qorxudan rəngi saraldı,
Yalan söyləməyi qərara aldı.
Dedi: – "At sürmüşəm çox ölkələrdən,
Sən kimi rəhmdil görməmişəm mən."
Şah dedi: – "Sözlərin düzdürsə, qonaq,
Sehrli güzgüdə öz əksinə bax."
O durub güzgüyə salarkən nəzər,
Gördü öz əksini zənciyə bənzər.
Qonaq dediyindən çəkdi xəcalət,
Şah da öz işindən utandı xəlvət.
Dedi: – "Ey xoşqədəm, xoşdilli mehman,
Bağışla, biz səni etdik peşiman,
Güzgü göstərdi ki, sən yalan dedin,
Lakin düzəlməyin deyildir çətin."
Düzəltdi səhvini təzədən qonaq,
Göründü çöhrəsi güzgüdə dümağ.
Şah dedi: – "Gizlətmə, açıq söylə bir,
Məndən səxavətli dünyada kimdir?"
Qonaq cavab verdi: "Ey şanlı sultan,
Artıq gizlətməyə qalmamış imkan,
Sinəmdə saxlanan bu sirri, lakin

Tək sizə açmağım deyilmi mümkün?”
Saray adamları durub getdilər,
Otaqda tək qaldı o iki nəfər,
Dedi: – “Hindistanda belə şəhər var,
Sarmış dörd yanını bəhrəli bağlar.
Olmuşdur o sənin ölkənə daxil,
Verir xəzinənə xeyli mədaxil.
Tərifi ruh açan, adı Tərazdır,
Hər zaman sinəsi ətirli yazdır.
Yəqin o məkana sən də getmisən,
Ya da tərifini çox eşitmisən.”
Şah dedi: – “Yox, ora getməmişəm mən,
Lakin eşitmişəm gedib-gələndən.
Kəsmə söhbətini, sən davam eylə,
Bütün gördüyünü səbr ilə söylə.”
Dedi: – “Söylədiyim o gözəl şəhər
Sərvlər yetirən bir bağa bənzər.
Dost tək alıb onu qoynuna dağlar,
Dağların döşündən axır bulaqlar.
Ruha qüvvət verir gözəl havası,
Suyunda yüz dərdin vardır dəvası.
Əhli bağbanlığı etmişdir peşə,
Var şəhər yanında gözəl bir meşə.
Salınmış hər evin yanında bostan,
Bostanın yanları tamam gülüstan.
Hər kəs özü üçün görür ehtiyat,
Həm də zinət verir elə bağ-bağat.
Artır ildən-ilə xalqın dövləti,
Çünki əsirkəmir şah ədaləti.
Abaddır küçələr orda behişttək,
Hər ev bir saraydır, hər insan mələk.
Malına yer tapmır heç kəs o yerdə,
Tutmur daş-qaşları xərabələr də.
Orda bir növcavan tanıyıram mən,
Lakin çox acizəm vəsf eyləməkdən.
Gözəllikdə edir günlə rəqabət,
Bulaqtək qaynayır onda səxavət.

Yaşı az olsa da, kamalı çoxdur,
Özündə, sözündə bir eybi yoxdur.
Təmizdir vicdanı aynalar kimi,
Çəməndə su kimi, dağda qar kimi.
Cahanda hər nə var, əyandır ona,
Vardır hər sözündə bir incə məna.
Rəftarı gözəldir, təbi mülayim,
Olur məclisində yüzlərcə alim.
Yoxdur onun kimi bəxtiyar vücud,
Taleyi uğurlu, adısa Məsud.
Qismət etmiş ona bəxti, taleyi,
Əqli, var-dövləti... qərəz, hər şeyi.
Bir güllü gülzarda o qəlbi sadə,
Hər zaman nuş edir gül rəngli badə.
Məclislər düzəldib gül mövsümündə,
Yar olur bülbülə, sərvə çəməndə.
Tamam qərq olaraq qızılgüllərə,
Gülgün qədəhləri qoymayır yerə.
Son verəndə yaza soyuq küləklər,
O hazır etdirir gülrəng ipəklər.
Tutdurub onları müşkə, ənbərə,
Gül yarpağı kimi sərdirir yerə.
Bütün qışı tutur evində qərar,
Güllərdən seçilmir geydiyi paltar.
Durur qulluğunda bir neçə dilbər,
Asiman tağında günəşə bənzər.
O gül yanaqlılar, o ayqabaqlar,
Gülləri səpməkçün hazırca saxlar.
Gülgün otağında Məsud hər zaman
Bir şadlıq büsatı düzəldir, haman.
Şənlik başlanınca o nazəninlər
Gələn qonaqları gülə qərq elər.
Onun məclisini görərsə hər kəs,
Cənnəti görməyə göstərməz həvəs.
Onun cəlalından, təntənəsindən
Heç yüzdə birini danışmadım mən.
Onun səxavəti dillə deyilməz,

Hatəm də onunla bəhs edə bilməz.”
Qonaq öz sözünü bu yerdə kəsdi,
Çevnə səbr etməyib yaman tələsdi.
Qəlbindən keçdi ki,dönə bir yelə,
Məsud cəlalını görə gözüylə.
Vəzirlərə dedi: – “Düz bir həftə mən
Ayrılan deyiləm həramxanədən.
Bir həftə sizi də eylədim azad,
Gedin, evinizdə keyf edin rahat.”
Dağılıb gedincə hər kəs evinə,
Səfər tədarükü gördürdü Cevnə.
Fikrini söyləyib yaxın dostuna,
Sərvəti, hərəmi tapşırdı ona.
Şahın yer titrədən bir atı vardı,
Sürəti şimşəyi heyran qoyardı.
Adını qoymuşdu “Yelgedişli at”,
Ardınca quşlar da baxardı mat-mat.
Onu minib sürən hər insan oğlu
Bir günə haqlardı on günlük yolu.
Başqa şəklə salıb özünü Cevnə,
Yönəltdi atını Təraz səmtinə.
Gecəli-gündüzlü tutmayıb aram,
Yüz ağaclıq yolu eylədi tamam,
Gördü bir şəhərdir-behiştə bənzər,
Ətirli torpağı müşk ilə ənbər.
Hələ az deyibmiş vəsfini mehman,
Bu şəhər yüz dəfə gözəlmiş ondan.
Məsudun evini sual etdi şah,
Yanında qalmağı xəyal etdi şah.
Sataşdı gözünə böyük bir saray,
Uca günbəzini öpür günəş, ay.
İçində qaynaşır bir yığın adam,
Görür orda hamı hörmət, ehtiram.
Gələn qəribləri etməyə dəvət,
Dayanmış qapıda on əhli-xidmət.
Görüncə Çevnəni etdilər sual,
Qərib olduğunu bilincə dərhal,

Gəlib pişvazına etdilər hörmət,
Qonaq otağına olundu dəvət,
Atını tövləyə apardı mehtər,
Özünə sarayda yer göstərdilər.
Qonaq otağını seyr etdi Cevnə,
Gördü ki, oxşayır bir şah evinə.

O, bu təntənəyə salarkən nəzər,
Bəzədi süfrəni lətif xörəklər.
Gəldi ev yiyəsi nahar bitəndə,
Gözəldi qonaq da, qonaq edən də.
Mehriban sifətli o cavan oğlan
Qonaqcıllığını tez etdi əyan.
Məsudda gördüyü bu xoş xasiyyət
Oyatdı Çevnədə təəccüb, heyrət.
Elə ki, əl çəkdi qonaq yeməkdən,
Məsud da əl çəkdi söz söyləməkdən.
Ehtiramla sual etdi Cevnədən:
"Bizlə beş-on qədəh mey içərmisən?"
Qonaq: "İçək" dedi, Məsud oldu şad,
Qurdurdu bir anda başqa bir büsat.
Bir məclis qurdu ki, qocaman fələk
Mislini görməmiş bu zamanadək.
Sarayın içində vardı bir hamam,
Hovuzu, divarı mərmərdi tamam.
Şəffaf şüşələri gün kimi parlaq,
Hovuzda su deyil, gülabdı ancaq.
Məsud ərz etdi ki: "Nahardan qabaq
Yuyunsa dincələr mehriban qonaq.
Yorğunluq, arğınlıq canından gedər."
Şahın da, qəlbinə yatdı bu sözlər.
Tez hamama sarı yollandı mehman,
Onun zinətinə qaldı mat, heyran.
Belə memar işi, belə imarət
Bütün Hindistanda yox idi, əlbət.
Taslar qızıldandı – günəş misalı,
Gümüş qulplar isə onun hilalı.

Fitələr ənbərlə müşk qarışıqlı,
Baftalı ipləri yar-yaraşıqlı.
Qulluq etmədəydi bir neçə dilbər,
Onlar həm pəriyə, həm gülə bənzər.

Şuxluq edirdilər bir-birləriylə,
İncə zarafatlar sığmırdı dilə.
Belə gözəl yerdə soyundu Çevnə,
Böyük bir həvəslə yuyundu Cevnə.
Hamamdan çıxanda əziz qonağa
Libas gətirdilər qiymətli, baha.
O əsla etməyib buna etiraz,
Geyindi əyninə laləræng libas.
Oldu Məsud kimi bəzəkli, gülnar,
Birlikdə məclisə qədəm basdılar.
Gördü bir məclisdir, cənnətə bənzər,
Saqisi huridir, badəsi kövsər.
Məsud qonağını keçirib başa,
Oturtdu onu da özüylə qoşa.
Hamının əlində qızılgül vardı,
Hərənin paltarı gültək yanardı.
Gözəl saqisini çağırdı Məsud,
Dedi ki: "Mehmana gülgün qədəh tut."
Qədəhlər boşalıb-doldu peydərpey,
Bütün qonaqlara əsər etdi mey.
Böyük ad almışdı öz əsrində şah,
Elmindən aləmi etmişdi agah.
Görüncə məclisi bunca həvəsli,
Bu işrət şövqündən ürəyi əsdi.
Ayıqkən özünü aparmasından
Heç kəs tutmaz idi bir tükcə nöqsan.
Şərabdan başına çıxıb hərarət,
Ağlını, hissini eylədi qarət.
Bir cənnət sanaraq məclisi mehman,
Gördü ətrafında çox huri, qılman.
Səbri əldən gedib, qaldı qərarsız,
Söhbətə başladı o ixtiyarsız.

Könlünə güc edib bu mehribanlıq,
Başladı söz ilə gövhərfişanlıq,
O ki, dodağından götürdü bəndi,
Elə bil hər yana dürr səpələndi.
Dedi: – "Ey zati-pak, ey nadir vücud,
Olmuş adın kimi bəxtin də məsud.
Mən seyr etməmişəm tək Hindistanı,
Gəzib-dolaşmışam bütün dünyanı.
Bu böyük büsatı, bu cah-cəlalı,
Bu varı, dövləti, ağlı, kamalı
Tanrı etmiş sənə binadan qismət,
Yüz qat artıq olsun, bu var, bu dövlət!
Heç kimdə görmədim yer üzündə mən,
Qalmışam heyrətlər dənizində mən.
Bu qədər sərvəti yığmısan hardan?
Aç, söylə, qəlbimdə qalmasın güman."
Ev sahibi dedi: – "Ey əziz qonaq,
Verdiyin suala cavab budur, bax:
Tanrı ətasıdır bu var, bu dövlət,
Tanrıdan başqa da səbəb var, əlbət.
Tabedir adil bir şaha bu ölkə,
Ellərin başına o salmış kölgə.
Görüm ömrü uzun, günü ağ olsun!
Məclisi hər zaman çilçıraq olsun!
Hər vaxt ədalətlə hökm edən o şah,
Ədlindən aləmi eyləmiş agah.
Zülmün köklərini elə üzüb ki,
Ədalət dürrünü elə düzüb ki,
Bunun səbəbinə gördüyün diyar
Əmin-amanlıqla olmuş bəxtiyar.
Arxayınlıq olan bir məmləkətdə
Gün-gündən varlanar şəhər də, kənd də.
Bir də hünər gərək, fərasət gərək,
Elmə, maarifə məhəbbət gərək.
Şahın dövlətindən, kəramətindən,
Saydığım şeylərin sahibiyəm mən.
Odur ki, hamıdan mənəm bəxtiyar,

Dünyada belə bir etiqadım var:
Var-dövlət qazanıb kama yetməyin
Səbəbi ikidir, bilirəm yəqin:
Biri-şükr etməkdir qadir allaha,
Biri-dua etmək rəhmdil şaha.
Amma bundan hamı xəbərdar deyil,
Onunçün mənimtək bəxtiyar deyil.
Bu olmuş əzəldən mənə bir peşə,
Odur ki, sərvətim artır həmişə.
Bu sözlər Çevnəni eylədi çox şad,
Az qaldı sevincdən qoparda fəryad.
İstədi Məsudu basa köksünə,
Birtəhər özünü saxlayıb yenə,
Başladı onunla şirin söhbətə,
Bütün qonaqları saldı heyrətə,
Məsud qonağını belə görəndə
Bildi ki, tayı yox bilikdə, fənddə,
"Belə bir mehmana can qurban!" deyə,
Qiymətli töhfələr etdi hədiyyə.
Getmişdi hər yana onun taciri,
Qayıdıb yenicə gəlmişdi biri.
Tükənməz qazancla qayıtmışdı o,
Məsud bu qazancı görüb şad oldu.
Hesaba sığmazdı bu qazanc yəqin,
Sanki vergisiydi bir məmləkətin.
Məsud mayasını sayıb bir yana,
Bütün qazancını verdi mehmana.
Qonaq olduğunu o eyləyib yad,
Özünü göstərdi bu töhfədən şad.
Məsud əmr etdi ki: "Şənlik düzəlsin,
Deyin, rəqqasələr məclisə gəlsin!
Çiçək otağının ağzı açılsın,
Qonağın başına güllər saçılsın!"
Payız olsa belə, əssə də yellər,
Hər yana gül saçdı nazlı gözəllər.
Ətirlər yayıldı o gül-çiçəkdən,
Oldu məclis evi bir yeni gülşən.

Gülgün libas geymiş qızlar peydərpey
Yaqut qədəhlərlə payladılar mey.
Qızardı yenidən şahın sifəti,
Yox oldu bir anda könül möhnəti.
İşarə eylədi Məsud sağ yana,
Gülyanaq bir gözəl çıxdı meydana.
Əldə günəş kimi bir camı vardı,
Görsə Cəmşid ona heyran qalardı.
Bu gözləri xumar, yanağı lalə
Doldurub Çevnəyə verdi piyalə.
Məsud piyaləni göstərib şaha
Dedi: – "Bir doldumu, boşalmaz daha,
Onu sağ tərəfə gəzdirdikcə hey...
İçdikcə, qonaqlar içmək dilər mey.
Sol yana dövr etsə bu qədəh əgər,
Nə qədər içsələr, "bəsdir" deməzlər.
Xariqə yaradan neçə cadugər
Bu zər piyaləni sehrləyiblər.
Sınaqdan keçirdi onu qonaqlar,
Gördülər ki, camda bu xasiyyət var.
Etdi o cam şahı tamam meypərəst,
Bir kərə içməmiş göründü sərməst.
Səxavət göstərdi Məsud o ki var,
Şaha bu camı da verdi yadigar.
Həmin piyalədən badə edib nuş,
Şah bu ziyafətdə olunca bihuş,
Çəkdi karvanını meydana axşam,
Gəldi şirin yuxu, söndürüldü şam...
Günəş qalx deyincə səhər rindinə,
Rind sabah meyini nuş etdi yenə.
Sübh meyi içməyə qalxdı qonaqlar,
Hiss etdi özünü hamı bəxtiyar.
Yenə bütün günü uzandı məclis,
Heç kəsdə qalmadı nə ağıl, nə hiss.
Yenə otaqdakı bir dəstə dilbər
Gətirib məclisə çiçək səpdilər.
Çox oldu cah-cəlal bu gün dünəndən,

Gülgün şərab tutdu yüz nazikbədən.
Yenə ev sahibi işarə etdi,
Bir kəniz yandakı otağa getdi,
Çağırdı oradan işvəli, nazlı,
Gözəl müğənnini. O xoş avazlı
Əlində saz deyil, bəlkə, çənk idi,
Üzündə örtüyü lalərəng idi.
Məsud əmr etdi ki, çənkini alsın,
Açsın rübəndini, oxusun, çalsın,
Açınca üzünü o şux nəğməkar,
Az qaldı qəşş etsin bütün qonaqlar.
Sazının telləri çəkəndə fəğan,
Verdi qonaqlara sanki təzə can.
Şah bu müğənninin oldu maili,
Səsləndi saz kimi qəlbinin teli.
Çəkib nəğməkarı şah hüzuruna,
Məsud şirin sözlər bəxş etdi ona.
Gələn tacirlərin qazancı o gün
Verildi mehmana yenə büsbütün.
Ötdü bu hal ilə bu gün də, artıq,
Qapadı gözləri çökən qaranlıq.
Səhər təzələndi qonaqlıq yenə,
Əvvəlki günləri ötdü təntənə.
Yenə mey içildi, güllər saçıldı,
Baxıb gül üzlərə, dillər açıldı.
Məclis dünənkindən üstündü, üstün,
Artırdı səfanı-zövqü həmin gün.
Yenə əmr edincə evin hakimi,
Bir nəfər ortaya gəldi yel kimi.
O bir at gətirdi qartal qanadlı,
İldırım sürətli, fələk büsatlı.
Qaçmaqda Şəbdizdən bu idi üstün,
Rəngitək adı da qoyulmuş “Gülgün.”
Pəri qamətliydi, həm div vücudlu,
Sanki ikisindən törəmişdi bu.
Bir yerdə dayanıb gətirmirdi tab,
Yemi şəkər idi, suyu al şərab.

On at addımıydı addımı düzdə,
Yüz ağac yol gedir gecə-gündüzdə.
Görüncə şah onu ürəyi axdı,
Elə bil div ilə pəriyə baxdı.
Çəkdirib onu da Məsud meydana,
Şəstlə peşkeş edib verdi mehmana.
Əvvəlki töhfələr qalsın bir yana,
Bugünkü dəyərdi bütün cahana.
Məsud da qonaqdan olaraq xoşhal,
Yenə də bəxş etdi ona dövlət, mal.
Yenə bütün günü olub meypərəst,
Axşam düşən kimi hamı oldu məst.
Ta ki, göydə günəş gözünü açdı,
Gecənin qaranlıq ordusu qaçdı.
Yuxudan ayıldı yenə hökmdar,
Oyandı Məsud da xeyli bəxtiyar.
Başladı qonaqlar şirin söhbətə,
Qızlar qarışdırdı gülü şərbətə.
Şah dedi: – "Ey üzü mübarək həmdəm,
Eşqin könlümüzdə kök saldı möhkəm.
Bu hörmət ölüncə, bil, unudulmaz,
Bunca uzun çəkən qonaqlıq olmaz.
Dözülməz olsa da sənin hicranın,
Getmək istəyirik, nədir fərmanın?
Gəlmək istək ilə mümkünsə bizə,
Gedəndə gərəkdir alaq icazə."
Düşüncə ortaya ayrılıq sözü,
Qaraldı Məsudun günü-gündüzü.
Dedi: – "Ey yaxın dost, hörmətli səyyah,
Bu necə fikirdi oyandı nagah?
Sənin söhbətinlə xoşhal idik biz,
Getsən hicranına dözməz qəlbimiz!
Xidmətimdə əgər oldusa nöqsan,
Mərhəmət göstərib, incimə bundan.
Ayrıla bilmərik günəş üzündən,
Hələ doymamışıq şirin sözündən.
Bir neçə gün də qal, sevindir bizi,

Nədirsə, bağışla təqsirimizi.”
Şah üzr istəyib, təşəkkür etdi,
Gəldiyi yol ilə qayıtdı, getdi.
Kişnəyən “gülgün”ün qalxdı belinə,
Döndü quş qanadlı səhər yelinə.
Nələr vermişdisə Məsud mehmana,
Ayırdı onları tezcə bir yana.
Etibar etdiyi sadiq qullarla
Şahın arxasınca düzəldi yola.
Baxaraq yollara tənha dayandı,
Ayrılıq oduna alışdı, yandı...
Dağları, daşları teylədi “gülgün”,
Yetirdi Dehliyə şahı həmin gün.
Aradan neçə gün sovuşdu keçdi,
Tehfə karvanı da gəldi, yetişdi.
Məsudun işinə şah heyran oldu,
Xəyalı sarsılıb pərişan oldu.
Onu yad etdikcə tutmurdu aram,
Dalbadal dolurdu, boşalırdı cam.

Bir alçaq, vicdansız, mənsəbi ali
Təraz diyarına olmuşdu vali.
Adəti zülm etmək, adı da Ceysur,
Hindistan elində məşhurdu, məşhur.
Çoxdu şikayətə gələnlər ondan,
Yüz günah çıxırdı əlindən hər an.
Verdi fərmanını adil hökmdar:
“Ceysur edilməli Tərazdan kənar.
Qovulsun vilayət təxti-tacından,
Məsud olsun onun əvəzində xan.”
Bu xəbər Ceysura çatdı haman dəm,
Məktub yolda ikən çəkdi yaman qəm.
Bildi ki, xanlığı çıxır əlindən,
Çünki şah halidir bəd əməlindən.
Bütün xəyanəti olmuşdur aşkar,
Gözləyir yolunu ağır cəzalar.
Onun Məllöv adlı vəziri vardı,

Ceysurdan da yaman bir zülmkardı.
Vali o əmri ki, bildi, eşitdi,
Çağırıb Məllövü məsləhət etdi.
Dedi: – “Söylə, nədir bu işə tədbir?”
Belə cavab verdi əzazil vəzir:
“Bütün bu işlərin baisi, ey xan,
Şan-şöhrət sahibi Məsuddur, inan.
Onun səxavəti ölçüyə gəlməz,
Şahın qulağına çatmışdır bu səs.
Hər zaman yaxşılıq çıxır əlindən,
Bir kəs inciməmiş əsla dilindən.
Bunları çatdırmış şaha xəlayiq,
Şah onu bilmişdir xanlığa layiq.
Əgər yox edilsə o tezcə burdan,
Səni mövqeyindən ayırmaz zaman.
Məsud məhv edilsə, şah məyus qalar,
Olarsan yerində yenə bərqərar.”
Ceysur soruşdu ki: “Budursa tədbir,
Məsləhətin nədir, açıq söylə bir?”
Dedi: – “Sən onunla əvvəlcə yar ol,
Məhəbbət göstərib yaxın qəmxar ol.
Çağırıb hüzura tez-tez söhbət et,
Hərdən sən də onun məclisinə get.
Belə ki, dost oldu o sənə qəlbdən,
Hər nə lazım isə düzəldərəm mən.”
Açıldı Ceysurun könül aynası,
Qoydu Məsud ilə dostluq binası.
Gündə bir hiyləylə məkrə əl atdı,
Onunla ən möhkəm dostluq yaratdı.
Hər gün düzəldərək məclis, ziyafət,
Edərdi onunla çox şirin söhbət.
Dost qələmə verib özünü xain,
Salmışdı Məsudu tamam arxayın.
Məsudun evində bir gün bərabər
Mey töküb, sağlıqlar söyləyirdilər.
Axşam düşənədək meydən edib nuş,
Oldu hər ikisi o gecə sərxoş.

Onların huşunu mey başdan aldı,
Düşüb hər ikisi çəməndə qaldı.
Şərab əsər etdi həm nökərlərə,
Keflənib yıxıldı hərə bir yerə.
Pusquda gizlənən bir dəstə cəllad,
Görüb bu səhnəni oldular çox şad.
Hərə bir div kimi çıxdı pusqudan,
Tutub əllərində kəmənd, ox, kaman,
Başının üstündə gəlib durdular,
Tez əl-ayağına gündə vurdular.
Birisi çiyninə götürüb onu,
Tezcə tutub getdi saray yolunu.
Gətirdi bir yerə onu gizlicə,
Örtdü cinayəti qaranlıq gecə.
Bir dərin quyuda yerbəyer etdi,
Gecə-gündüzünü onun bir etdi.
Məsudun çoxaldı, artdı cəfası,
Hələ xəbərsizdi dostu, aşnası.
Gecənin quzğunu girib yuvaya,
Verdi dan quşları səda-sədaya.
Oyanıb yuxudan nökərlər bir-bir
Məsudun əmrinə durdu müntəzir.
Onlar cəm olanda hamı bir yerə,
Onun yox olması çıxdı zahirə.
Döyüb başlarına batdılar qəmə,
Ceysur haray saldı bütün aləmə.
"Ah" deyib, "uf" deyib boğuq səsiylə,
Çox fəğan eylədi öz dəstəsiylə.
Göz belə yummayıb üç gün, üç gecə
Gəzdilər, vermədi heç bir nəticə.
Nəhayət, əl çəkib bu gəzintidən,
Hamı yas saxlayıb qopardı şivən.
Xalq bu macəranı eşidən zaman,
Bir tufan saldı ki, görməmiş cahan.
Vali yahu çəkib saysız-hesabsız,
Neçə gün əzaya oturdu yalqız.
Qohum-qardaş ona təsəlli verdi,

Axır ayrılığa davam gətirdi.
Yeddi gün aş verib tutdu təziyə,
Qayıtdı qəsrinə... "təəssüf" deyə.
Məllöv haman gecə gəzib şəhəri,
Yaydı el içində bu bəd xəbəri.
Günəş çıxar-çıxmaz şərq quyusundan,
Qalxdı yer kürəsi öz yuxusundan.
Məsud vahiməylə açdı gözünü,
Bir əcaib yerdə gördü özünü.
Bağlanmış əlləri, qolları möhkəm,
Qara bir pərdəyə bürünmüş aləm.
Batmış yarıyadək suya, palçığa,
Yol yoxdur qaranlıq quyudan çıxa.
Dedi: – "Ey yaradan, bu necə haldır,
Qorxunc bir yuxumu, yoxsa xəyaldır?"
Hər nəyə gəldisə onun gümanı,
Anlaya bilmədi bu macəranı.
Quyunun ağzını açarkən biri,
Səpildi içəri işıq telləri.
Əzab-əziyyətlə onu axırı
Çəkib çıxartdılar ordan yuxarı.
Saldılar bir evə bağlı əsiri,
Gəldi hirslə ora Ceysur vəziri,
Onu təhqir edib söydü ən əvvəl,
Çubuq hazırlandı, o çalınca əl.
Vəzir hökm etdi ki: "Açın qolunu,
Əzablar verərək sızladın onu!"
Biri başdan tutdu, biri ayaqdan,
Biri soldan vurdu, biri də sağdan.
Çubuqlar altında inləyən əsir
Dedi: – "Söylə nədir günahım, vəzir?
Qəsdiniz maldırsa, əsirgəyən yox,
Candırsa, öldürün məni biryolluq."
Bu sözlər vəzirə əsər etmədi,
Çubuq vuranlara: "Bərk vurun", – dedi.
Qızardıb gül kimi ağ vücudunu,
İki cəlladbaşı döyürdü onu.

Məsud qopardısa nə qədər fəryad,
Lakin bir kimsədən görmədi imdad.
İki möhkəm ağac sındı, qırıldı,
Ağac vuranlar da tamam yoruldu.
Vəzir "Bəsdir!" – deyə verdi fərmanı:
"Bir az da vursanız çıxacaq canı.
Hələlik yaşasın bu iztirabla,
Sonra öldürərik ağır əzabla."
Əl çəkdi, nəhayət, o iki nəfər,
Utandı bu haldan, hətta fələklər.
Dikəlib oturdu Məsud cəfakeş,
Dilində min fəğan, qəlbində atəş.
Soruşdu: "Söyləyin, nədir təqsirim?
Dünyada bu zülmü eyləməz heç kim.
Nahaq zülm etməyin daşını atın,
Varsa bir günahım, mənə anladın.
Yəqin bu məsəli bilirsiniz siz:
Qul xatasız olmaz, ağa kərəmsiz.
Ancaq suçum nədir, qoy çıxsın üzə,
Malım da, canım da qurbandır sizə."
Nə qədər yalvardı, yaxardı əsir,
Daşqəlbli vəzirə etmədi təsir.
Dedi ki: "Qoymayın onu danışsın,
Bu sirri özgələr yanında açsın."
Yenə zəncirləyib zindana saldı,
Quyu bu Yusifi qoynuna aldı.
Bu cəza neçə gün edildi təkrar,
Əsla tapılmadı ona havadar.
Oldu gündən-günə əhvalı yaman,
Qanlı yaşlar töküb, əl üzdü candan.
Deyirdi: "Daşdandır yoxsa qəlbiniz,
Mənə rəhm eyləyib, tez öldürün siz."
Zülmkar zülmdən axır ki, doydu,
Onu öldürməyi sabaha qoydu.
Saldırıb quyuya həbs etdi yenə,
Tapşırıqlar verdi gözətçisinə.
Ceysurun yanına getdi könlü şad,

Dedi: – “Viran qəlbin qoy olsun abad,
Rəqibinin halı yamandır, yaman,
Gəldim səndən alam qətlinə fərman “
Məllöv Ceysurdan da razılıq aldı,
Gəlib öz evində işrətə daldı.
Məllövün bir qızı vardı-gül üzlü,
Dodağı şəkərli, kəlamı duzlu.
Hüsnü, gözəlliyi cahanda təkdi,
Vəsfini deməyə dillər gərəkdi.
Yanırdı qəlbində məhəbbət odu,
Sevirdi gizlicə bu qız Məsudu.
Sevgi edən gündən ürəyini qan,
Zəncirbənd görəndə edərdi fəğan.
Hər möhnət çəkəndə yanar, yanardı,
Qəlbində qövr edən qəmi anardı.
Çoxdan o dilbərə olmuşdu məlum,
Var dərin quyuda bir yeni məzlum.
Lakin qorxusundan həmin aycamal,
Onun kimliyini etmirdi sual.
Bu axşam bildi ki, atası məstdir,
Dedi öz-özünə: “Durmaq əbəsdir.”
Gördü gözətçi də məst olub yaman,
Qərq olub yuxuya sərxoşluğundan.
Quyunun ağzını açıb gizlicə,
Çağırdı dustağı o incə-incə.
Dedi: – “Dustaq qardaş, de, nədir adın?
Cavab ver qalıbsa ömrün, həyatın.”
Dustaq eşidincə həmin sədanı,
Elə bil yenidən qayıtdı canı.
İnləyib dedi ki: “Məsuddur adım,
Ərşə dirək olub ahım, fəryadım.
Sən söylə insanmı, ya pərimisən?
Haqqın, ədalətin rəhbərimisən?
Xoş səsin qəlbimə şəfa gətirdi,
Həyat müjdəsini mənə yetirdi.
Əlindən gəlirsə, mənə yardım et,
Yoxsa ki, ölmüş bil, yalqız burax, get”.

Məsud olduğunu bilincə dildar,
Eşq odu qəlbini etdi tarimar.
O ki, ayrılıqdan qan ağlamışdı,
Neçə gün Məsuda yas saxlamışdı.
Xəbərdardı onun yox olmasından,
Lakin ölməsinə az idi güman.
Yaxşı tanıyırdı atasını qız,
Deyirdi, ilandır, bax, bu imansız!
Haçandır ürəyi düşüb qorxuya,
Deyirdi: "Bu dustaq Məsud olmaya?"
Elə ki, soruşub bu gecə gizlin,
Məsud olduğunu eylədi yəqin.
Dedi: – "Ey boyunun fədası canım,
Bircə öz canıma gəlir gümanım.
Səni bu zindanda görməzdən əvvəl,
Kaş mənim canımı alaydı əcəl."
Duydu ki, bu sözün vaxtı deyildir,
Onu qurtarmağa düşündü tədbir.
Can bir qəlbdə iki kənizi vardı,
Onları canından əziz tutardı.
Onlara eşqini açmışdı dilbər,
İndi yanındaydı həmin kənizlər.
Birlikdə səy edib o üç nazənin,
Quyudan Məsudu çəkdilər yeyin.
Gördülər cismində qalmamış canı,
Yoxdur vücudunda həyat nişanı.
Görüb bu səhnəni o nazlı canan,
Qanlı yaşlar töküb, qopardı əfğan.
Gəldi xəyalına yenə də birdən;
"Nə üçün yas tutub yubanıram mən?"
Qız kənizlərinə tez verdi fərman,
Məsudu evinə gətirdi pünhan.
Öpüb üz-gözündən yetişdi kama,
Onu qonaq etdi dadlı təama.
Mərhəmət göstərib o gözəl mələk,
Dolandı başına pərvanələrtək.
Məsud rahatlanıb yatdı bu gecə,

Vəzir sübh tezdən durdu gizlicə,
Məsudun qətlinə çox atırdı can,
Quyunun başına cumdu saraydan.
Gördü ki, zindanın qapağı yoxdur,
Gözətçi sərxoşdur, dustağı yoxdur.
Sərxoş gözətçini tez edib həlak,
Qaldı can qeydinə, çox oldu qəmnak.
Valinin yanına qaçıb söylədi.
Bütün gördüyünü nağıl eylədi.
Onların hər biri batdılar qəmə,
Döndü nəşələri qəmə, matəmə.
Nəhayət, o iki rəzil cəfakar,
Bu işə belə bir çarə tapdılar:
Yollanıb Məsudu gəzsin atlılar,
Tapınca başını əzsin atlılar.
Şəhərdə tapmayıb o biqərarı,
Çapdılar dağlara, çöllərə sarı.
Axtarıldı o gün hər tərəf, hər yan,
Lakin görünmədi ondan bir nişan.
O qızın tükənməz mehribanlığı
Üzdü Məsuddakı natəvanlığı.
İkisi bir yerdə etməkçün fərar,
Məsləhət eyləyib verdilər qərar.
İki at gətirdi o nazlı dilbər,
Çatmazdı onlara iti küləklər,
Qayıtdı saraya xanın ləşkəri,
Qalmadı yollarda qorxu əsəri.
Düzəldi səfərə o iki sirdaş,
Yol getmək xoş olur olanda yoldaş.
Onlar qaranlıqda gözdən itdilər,
Sabahsa saraya çatdı bu xəbər.
Getdi dallarınca bir dəstə atlı.
At deyil, hər biri şimşək qanadlı.
Bu dəstə çaparaq çatdı onlara,
Ta ki, bir ağacdan az qaldı ara.
Düşmüşdü qüvvəqdən iki biçarə,
Səbəblər səbəbi eylədi çarə.

Dəniz kənarına gəlib yetdilər,
Sahildə bir gəmi salmışdı lövbər.
Çatıb gəmiçiyə qiymət sordular,
Onu razı salıb cəld oturdular.
Gəmi üzüb keçdi göy dalğalardan,
Atlılar bu hala qaldılar heyran.
Bürüdü valini qüssə, kədər, yas,
Bildi ki, onları qaytarmaq olmaz.
Məsudla qız suda on gün, on gecə
Üzdülər quruya gəlib yetincə.
Bir gün yanaşdılar sahilə xoşhal,
Yenə də mindilər atları dərhal.
Bir şəhər yolunu tutub getdilər,
Demə, paytaxt imiş bu gözəl şəhər.
Onlar at sürdülər bir xeyli müddət,
Sarmışdı ətrafı bir qara zülmət.
Yolda xərabazar bir qala vardı,
Neçə quldurbaşı orda yaşardı.
Çatınca o yerə Məsudla dildar,
Onları dövrəyə aldı qaçaqlar.
İpək libasları, köhlən atları
Alıb yollandılar qalaya sarı.
Libassız qaldılar onlar büsbütün,
Lakin xoşbəxtlikdən doğmamışdı gün,
Bu zaman köç edən bir dəstə yetdi,
Məsud o dəstəyə xahişə getdi.
Başına gələni açdı, danışdı,
Yolçular bu hala yandı, alışdı.
Bir azdan şəhərə gəlib yetdilər.
Köhnə libaslarla döndü bir nəfər.
Örtüb vücudunu o iki qəmxar,
Bir xərabə yerdə tutdular qərar...
Parladı zülmətdə göylər incisi,
Qaçdı quldur kimi gecə zəncisi.
Ta günəş bataraq, düşüncə zülmət,
Qaldı viranədə o iki həmdərd.
Hər ikisi yorğun, hər ikisi ac,

Bir az suya möhtac, yeməyə möhtac.
Əldən düşmüş görüb o şux nigarı,
Məsud yollandı ki, şəhərə sarı
Axtarıb bir parça çörək gətirsin,
Onunla xəstəyə şəfa yetirsin.
Yetişib bazarı dolandı xeyli,
Gördü ki, meydanda bir saray əhli
Yığmışdır tabağa gözəl meyvələr,
Şahın hüzuruna aparmaq dilər.
Əlində tutaraq altı dinar pul,
Deyirdi: "Qazanc var, gəl-gəl, a yoxsul!"
Məsud eşidərək onun sözünü,
Yetirdi xadimə dərhal özünü.
Tez alıb tabağı o böyük insan
Sovuşdu sürətlə xalq arasından.
Yeni güc gəlmişdi əl-ayağına,
Yetişdi az sonra şahın bağına.
Cevnə bağ içində içmədəydi mey,
Yanında həsrətlə inləyirdi ney.
Məsud itdiyini biləndən bəri,
Başından aşırdı qəmin selləri.
Onu yad etdikcə çəkirdi ah-zar,
Qarışırdı meyə tökdüyü yaşlar.
Girincə o bağa taleyi küskün,
Sataşdı gözünə öz atı "gülgün",
Dalırkən şübhəyə o öz-özünə,
Birdən öz damğası dəydi gözünə.
Lap yəqin etdi ki, öz atıdır bu,
Dedi: – "Bu, gerçəkdir, yoxsa bir yuxu?
Həmin qonaq bura eyləmiş güzar,
Vermiş hökmdara atı yadigar."
Bir az getməmişdi Məsud o bağda,
Çatdı qulağına tanış bir səda.
Gördü öz sazıyla ötür şux gözəl,
Tanışdı Məsuda oxunan qəzəl.
O keçən günlərin xatirəsilə
Yenə də könlünə düşdü vəlvələ.

Birdən öz-özünə dedi astadan:
“Nəğməkar qızı da satıb o mehman!”
Məclis olan yerə basarkən qədəm,
Sehrli camı da gördü həmin dəm.
Anıb keçmişləri bağrı qan oldu,
Qəlbi parçalandı, gözləri doldu.
Yenə varlığını qəm etdi bihal,
Başının üstünü aldı dərd, məlal.
Boşalıb qolları düşdü taqətdən,
Dedi: – “Göy yaradan, nə görürəm mən?”
Birdən şaha tərəf çevrilib haman,
Baxınca gördü ki, budur o mehman.
Sarsılıb vücudu düşdü təvandan,
Lakin öz adını saxladı pünhan,
Dedi: – “Tanıtdırsam özümü əgər,
Qəsdən gəldiyimi şah güman eylər.
Deyər göstərdiyi ehtiramlara
Mükafat almağa gəlmişdir bura.”
Aldılar tabağı onun başından,
Gördülər boğulur lap göz yaşından.
Birdən barmağını dişləyərək o,
Atıldı bayıra qəlbində alov.
Sürətlə yüyürüb xiyabanları,
Gedirdi bağdakı qapıya sarı.
Cevnəyə verdiyi dövləti-varı
Dehliyə çatdıran təraz qulları
Şahın qapısında düzülmüşdülər,
Birdən bu qəribə saldılar nəzər.
Köhnə sahibini tanıdı hər kəs,
Məsud xəcalətdən dayandı dinməz.
Görüncə bu halı dərdə düşdülər,
Onun qabağına yüyürüşdülər.
Tezcə ayağına döşəndi hər kəs,
Saldı fəryadları asimana səs.
Qoşuldu onlara bəlalı Məsud,
Gözləri qan oldu, bənizi bulud.
Eşikdə baş verən bu macəralar

Oldu bir ləhzədə şaha aşikar.
Xəbərdar edincə onu xadimi,
Çıxdı sarayından ildırım kimi.
Görəndə dostunu bu görkəmdə şah,
Gözündə kainat qaraldı nagah.
Qucaqlayıb onu tökdü göz yaşı,
Əyildi Cevnəyə Məsudun başı.
Onlara səs verən Çin müğənnisi,
Məsudun vəfalı gözəl kənizi
Yaşlara qərq etdi gül çöhrələri,
Dolandı başına pərvanələri,
İztirab atəşi olunca təskin,
Şah neçə xidmətçi eylədi təyin.
Dedi: – "Yuyundurun əziz mehmanı."
Qızın yanındaydı Məsudun canı.
Odur ki, başına gələni bir-bir
Ötəri olsa da, eylədi təsvir.
Şah bu əhvalatdan olub xəbərdar,
Seçdi kənizlərdən neçə şux nigar.
Onlar qərq olaraq ipəyə, şala,
Tez minib atları, düşdülər yola.
Neçə xacə ilə bir bölük pəri
Axtarıb tapdılar həmin dilbəri.
Onu qərq eləyib ipəyə, şala,
Qoyub gəcavəyə düşdülər yola.
Çatarkən saraya həmin gülbəniz,
Durdu xidmətinə yüzlərcə kəniz.
Məsud da hamama girib soyundu,
Qız gələnə kimi təmiz yuyundu.
Çıxanda verdilər gülgün libaslar,
Vermişdi Cevnəyə o belə paltar.
Geyindi-keçindi Məsud şah kimi,
Çağırdı yanına hindin hakimi,
Yenə oğlu kimi boynunu qucdu,
Bütün hadisəni bir-bir soruşdu.
Məsud əhvalatı etdikcə izah,
Bu qəmli dastana ağlayırdı şah.

Məsudla yenidən olaraq həmdərd,
Gecəli-gündüzlü edirdi söhbət.
O qızla Məsuda toy etdi Cevnə,
Verdi hər birinə neçə xəzinə.
Məsudu Təraza eylədi vali,
Verdi üstündə də neçə mahalı.
Gül açdı Məsudun arzusu-kamı,
Gülgün meylə doldu gül rəngli camı.
Məllövün, Ceysurun boynu vuruldu,
Ölkə bu fərmandan xəbərdar oldu.
Boyadı onların qanı torpağı...
Baxın, nə xoş gəlib yenə yaz çağı.
Tutmuş gülüstanı bitməz axınlar,
Güllərlə bəzənmiş dostlar-yaxınlar.
Nə xoş açılmışdır kainat gülü,
Hər şeydən gözəldir bu həyat gülü.
Bitirdi sözünü o gövhərsaçan,
Şah da xəbər tutdu onun halından.
Bildi tərazlıdır onun da əsli,
Məsud ovladıdır, bəlkə də, nəsli.
Bu nəcib insanla dost oldu Bəhram,
Bağışladı ona ağ gün, xoş məqam.
Təraz dastanı ki, axıra çatdı,
Bəhram rahatlanıb şirincə yatdı.

## ÇƏRŞƏNBƏ

### BƏHRAM ŞAH MAVİ SARAYDA

Çərşənbə günündə nilufər açdı,
Gecənin karvanı baş aldı qaçdı.
Zərrin libasını geyinən günəş
Qəlbində ehtiras, gözündə atəş,
Mavi boşluqlara çıxdı seyran,
Nilufər taxtından baxdı hər yana.
Nilufər rəngində libas geyib şah,

Nilufər sarayı etdi qərargah.
Firuzə bir qədəh götürub ələ,
Onda yaqut şərab içdi fərəhlə.
Nilufər libaslı, ay üzlü afət
Verdi günəş kimi cahana zinət.
Qamaşdırmaq üçün gözləri nurla,
Günəş göy atlazda doğdu qürurla.
Libası rəngində bir piyalədən
Bəhram mey içərək, şad oldu qəlbən.
Gizlədib günəşi, o mavi günbəd.
Laciverd rəngini edəndə zülmət,
Gündüzün gəmisi batdı haman dəm,
Bir qara pərdəyə büründü aləm.
Şah bu məclisə də verib nəhayət,
Yatıb dincəlməyi bildi məsləhət.
Ona şirin yuxu diləyib haqdan,
Bütün xidmətçilər çıxdı otaqdan.
Gün çəkilir kimi nəzərdən axşam
Pərdə arxasına çəkildi Bəhram.
Qulamlar yenə də göstərərək cəhd,
Bir dünyagörmüşü gətirdilər cəld.
Ona hörmət edib adətlərincə,
Pərdə qabağında yer göstərincə,
Ucaldı bir səda pərdədən yenə
Ki, başlasın qonaq hekayətinə.

## BEŞİNCİ SƏYYAHIN HEKAYƏTİ

Duaya başladı qonaq bu yerdə,
Dedi: – “Yeddi qatlı o mavi pərdə
Həmişə qəsrinə pərdədar olsun,
Bu şad sarayına göy hasar olsun.
Günəş tacın üstə bir gövhər olsun,
Bağında həmişə nilufər olsun.”
Qonaq duasını çatdırıb sona,
Bir nağıl danışdı şahlar şahına:

“Ədən torpağında vardı bir zalim,
Zülm etməkdə ona çatmazdı heç kim.
Həm çox qəzəbliydi, həm qəhrəmandı,
Qızmış bir aslandan daha yamandı.
Haram maldı onun arzusu, kamı,
Qudurub olmuşdu quldur, harami.
Nə bir aşinası, nə dostu vardı,
Tək-tənha yol kəsər, halay pozardı.
Olsa karvan əhli saysız-hesabsız,
Basardı, kəsərdi onları yalqız.
Sanmayın kənd, şəhər ondan bezardı,
Əlindən dəniz də qan ağlayardı,
Keçirmişdi ələ bir xeyli gəmi,
Hər biri sürətdə ildırım kimi,
Onları sahildə həmin hiyləgər
Elə gizlətmişdi, ən iti gözlər
Nə qədər baxsa da, heç vaxt, heç zaman
Seçə bilməz idi bir az uzaqdan.
O, hər bir gəmiyə sahildə gizlin
Zirək gözətçilər etmişdi təyin.
Sahil kənarında vardı bir meşə,
Dəniz gözətçisi orda həmişə
Ağaclar başında çəkərdi növbət,
Uzaq dalğalara edərdi diqqət,
Bir gəmi, bir qayıq görünsə nagah,
Quldur eləyərdi tez onu agah.
O minib gəmiyə yelkən açardı,
Dəniz quşlarıtək göylə uçardı.
Göz açıb-yumunca, yırtıcı quzğun
Gəmi karvanını salardı pozğun.
Qırıb yolçuları qarət edərdi,
Yayınıb nəzərdən, üzüb gedərdi.
Adı Cabir idi, ellər məşhuru,
Əlindən bezardı həm su, həm quru.
Dənizdə dönərdi qorxunc nəhəngə,
Meşədə yırtıcı, quduz pələngə.
Onun murdar adı çəkilən zaman,

Yolçular titrərdi can qorxusundan.
Olmuşdu məskəni bir böyük ada,
Qarət etdiyini gizlərdi orda.
Onun məskənindən bir qədər kənar
Cənnətə bənzəyən bir məmləkət var.
Suyu göz yaşından daha şəffafdı,
Torpağı münbitdi, havası safdı.
Hər yanı ağacdı bəhrəli, barlı,
Dərəsi, yamacı axar-baxarlı.
Sərin bulaqları ürəkaçandır,
Zəhər içənə də suyu dərmandır.
Çeşmələr sulayır orda hər yeri,
Bağlar içindədir imarətləri.
Sarmaşıq bürümüş evi, eyvanı,
Suyu ölməz edir hər bir insanı.
Həmin bu ölkədə varmış, deyirlər:
Behiştsəra adlı gözəl bir şəhər.
Orda ədalətli bir şah yaşarmış,
Bütün məmləkətdə o, hökmdarmış.
Adı Nodər imiş, özüysə nadir,
Parlaq düşüncəsi hər şeyə qadir,
Varmış tək bir qızı – bir ayüzlüsü,
Mislini görməmiş dünyanın gözü.
Gözəldi qaməti, uca görkəmi,
Gözəllik bağında sərvinaz kimi.
Qıvrım saçlarına qısqanar sünbül.
Çəkərmiş ləbinə həsəd qızılgül.
Üzü yer üzünə işıq saçarmış,
Parlaq şöləsindən canlar naçarmış.
Zülfü kəmənd atıb günəş boynuna,
Hüsnünün sirrini açarmış ona.
Adı Mehr idi, özü bir mələk,
Başına dönürdü bu göy, bu fələk.
Aləmə nur saçan günəş üzlü qız,
Günəş yox, aləmi bəzəyən ulduz
Bir gün göy suların seyrinə daldı,
Dəniz gəzintisi qəlbini çaldı.

Minib bir gəmiyə sürdürdü onu,
Süzdü dalğaların bitməz oynunu.
Dəniz səma kimi çox geniş, sonsuz,
Gəmi ayparaydı, qız isə ulduz.
Gəmiçi olmamış hələ xəbərdar,
Qalxdı birdən-birə dəli bir ruzgar.
Artdı göy suların qəzəbi, kini,
Sahildən çox uzaq saldı gəmini.
Qüvvətlə, şiddətlə bağırdı tufan,
Gəmiçi ağlayıb qopardı fəqan.
Dedi: – “Rəhm etməsə bizə gəc fələk,
Hamı öz canından əl çəksin gərək.”
O qəzəbli külək qovub onları,
Apardı gəmini yad elə sarı.
Külək susan kimi, dayanan kimi
Naməlum bir yerə çatmışdı gəmi.
O yerdə Cabirin adamı vardı,
Gözü göy sularda bir ov arardı.
O, qaraltı görüb dənizdə nagah,
Bir anda eylədi Cabiri agah,
Minib bir gəmiyə Cabir o dəmdə
Yel kimi üz qoydu həmin o səmtə.
Yetişib gəmiyə başladı cəngə,
Onlar da cəng açdı bu tək pələngə.
Cabirin hər oxu çıxanda yaydan,
Səpilirdi suya yüz günahsız qan.
Gəmidə çoxları əl üzdü candan,
Çoxları dilədi Cabirdən aman.
Cabir qabağına qatıb onları,
Sürürdü gəmini sahilə sarı.
Gözündən qoymayıb onları bir an
Bütün var-dövləti eylədi talan.
Hələ olmamışdı agah Mehrdən,
Sataşdı nəzəri o səmtə birdən.
Döşəndi tir kimi qəşş eyləyərək,
Qaldı xeyli zaman bir cənazətək.
Ayılınca bir də baxdı o, Mehrə,

Yenə qəşş eləyib yıxıldı yerə.
Bildi ki, yox ona baxmaq imkanı,
Dəfələrlə gedib-qayıtdı canı.
Axır əmr etdi ki, həmin ayqabaq
Saxlansın hər zaman sarayda dustaq.
O gülüzlü sərvə olmaqçın həmdəm
Tezcə təyin etdi iki şux sənəm.
Qalan adamlara verdi azadlıq,
Onların canına qıymadı artıq.
Ordan uzaqlaşıb getsinlər deyə,
Mindirdi hamını boş bir gəmiyə.
Dedi: – "Gərəkdirsə əgər can sizə,
Durmayın, qayıdın xərabənizə!"
Hamı vahiməyə gəlib bu sözdən,
Yarıb göy suları yayındı gözdən.
Bəxtinin günəşi geyindi qara,
Tək qaldı Ədəndə həmin aypara.
Onun xəyalıyla yaşardı Cabir,
Vüsal ümidini etməzdi zahir.
Mehrin gözlərində qaraldı əyyam,
Yandı günəş könlü hər səhər-axşam.
Ordan uzaqlarda vardı bir şəhər,
Özü cənnət bağı, suyu da kövsər.
Təmiz asimanlı, təmiz havalı,
Hər yanı göy çəmən – səma misallı,
Orda bir hökmran olmuşdu vali,
Ölkəsi abaddı, hümməti ali.
Adı Neman şahdı, mülküysə Yəmən,
Ədlilə olmuşdu hər tərəf çəmən.
Təkcə bir övladı vardı Nemanın,
Gözü onda idi bütün dünyanın.
Sərvi qısqandırar qəddi-qaməti,
Üzündən çəkərdi gün xəcaləti.
Bilikdə, hünərdə yoxdu ona tay,
Güzgüdə gördüyü əksindən savay.
Elmə, maarifə çoxdu onda meyl,
Özü bir günəşdi, adı da Süheyl.

Qəlbi gözəl Mehrin zülfünə bağlı,
Çoxdan olmuşdular onlar adaxlı.
Sevda yandırmamış təkcə Süheyli,
Mehrin də Süheylə düşmüşdü meyli.
Meyl yox, eşqindən sonsuzdu dərdi,
Vəslinə çatmağa canlar verərdi.
İndi hicran çəkib sinəsinə dağ,
Bir quldur əlində olmuşdu dustaq.
Çox idi o bağda gözəl meyvələr,
Hər yan bənövşəli, hər yan nilufər.
Qəlbi nilufərə olmuşdu vurğun,
Günəşlə nilufər olmuşdu uyğun.
Gəzərdi nilufər içrə o dildar,
Həmin rəngdə idi geydiyi paltar.
Sürməyi don geyib o gözəl sənəm,
Yarın fərağında tuturdu matəm.
Könül matəmini etməyə aşkar,
Nilufər rənginin ləyaqəti var.
Əsir edər-etməz Mehri fələklər,
Atdı Süheyli də ora küləklər.
Sanki toylarını etməyə onlar
Burda görüşməyi vermişlər qərar
Toya lazım olan nə varsa bütün,
Süheyl yükləyərək atlara bir gün,
Mindi kəcavəyə tərpəndi karvan,
Mehrin ölkəsinə oldular rəvan.
Su yolu qurudan qısadır bir az,
Vaxtı hədər yerə itirmək olmaz.
Odur ki, mənzilə tez çatsın deyə,
Adamlar dəstəylə mindi gəmiyə.
Mehrin gəmisini saman çöpütək,
Dalğalar üstündə oynadan külək
Elə bil, yenidən təblini çaldı,
Süheyl dəstəsini qorxuya saldı.
Nərə çəkən külək, qəzəblənən su
Gəmini top kimi hey atdı-tutdu.
Gah sular gəminı qaldırdı göyə,

Gah da ki, endirdi lap dərinliyə.
Yel bu gəmini də alıb apardı,
Sahildə yenə də gözətçi vardı.
Sularda gəmini görüncə biri
Xəbərdar eylədi yenə Cabiri.
Quldur qan tökməyə yenə tələsdi,
Minib qayığına yel təki əsdi.
Yanaşıb onlara başladı cəngə,
Süheyl qarşı durdu gələn pələngə.
Gəmidə iki şir durdu üzbəüz,
Gəldi hərəkətə qılınc, nizə, gürz.
Cabirin vurduğu zərbələri cəld,
Süheyl məharətlə etmədəydi rədd.
Onun da vurduğu zərbəni bir-bir
Geri qaytarırdı hünərli Cabir.
Onlar bir-birindən qalmazdı dala,
O, bundan igiddi, bu, ondan əla.
Cabir anladı ki, yenilməz bu nər,
Ağla gələn deyil ondakı hünər.
Gördü qalibiyyət çıxacaq əldən,
Yıxacaqdır onu bu güclü düşmən.
Düşünüb hiyləylə, məkrə əl atdı,
Sıçrayıb gəmidən dərinə batdı.
Düşmən gəmisinin girib altına,
Qılıncla zərbələr endirdi ona.
Elə parçalayıb, elə deşdi ki,
Su doldu gəmiyə güclü çay təki.
Bu su yuxarıya eyləyəndə meyl,
İşi başa düşdü, anladı Süheyl.
Nə tədbir tökdüsə, faydasız oldu,
Gəmi ağzınadək su ilə doldu.
Ucaldı göylərə ahlar, amanlar,
O dərin dəryada qərq oldu onlar.
Əl üzdü şahzadə canından təmiz,
Bildi qurtuluşa nə yol var, nə iz.
Balıq ovlar kimi suda bir nəhəng,
O batan gəmiyə Cabir açdı cəng.

Bir Əzrail kimi cumub onlara,
Dəryanı qərq etdi qızıl qanlara.
Süheylin əlini əlinə aldı,
Tez çəkib mindiyi qayığa saldı.
Süheyl yorulmuşdu, düşmüşdü haldan,
Onun qollarını bağladı daldan.
Sürdü qayığını indi azadə,
Bu zaman özünə gəlib şahzadə,
Gördü vücudunu yüz bənd içində,
Möhkəm düyünlənmiş kəmənd içində.
Başının üstünü kəsmişdi Cabir,
Bu hal yaman etdi Süheylə təsir.
Cabir ona dedi: – "Ey əsir oğlan,
Görmədim mən sənin cəngində nöqsan.
Yüz belə gəmilər batırdım suda,
Yüz min baş eylədim bədəndən cüda.
Yoxdu heç birində səndəki cürət,
Cürətin məhvinə vermədi rüsxət.
Boğulmaqda ikən dadına yetdim,
Ölümdən yaxanı mən xilas etdim.
Könlümdə qətlinə yoxsa da rəğbət,
Azad olmağın da deyil məsləhət.
Əgər bəndlərini parçalasam mən,
Bir şah qoşununu bura çəkərsən.
Qurtararmı onda yaxam əlindən?
Xatircəm deyiləm zərrəcə səndən,
Açarsan başıma min bir macəra,
Taparsan bilirəm, qətlimə çarə.
Məsləhət budur ki, qal bu kəmənddə,
Vücudun ömürlük çürüsün bənddə"
Nə qədər yalvarıb-yaxardı Süheyl,
Onda cavaba da görmədi bir meyl.
Yönəltdi qayığı o, sahillərə,
Gətirdi dustağı bu qürbət yerə.
Bağında bir quyu vardı Cabirin,
Gecədən qaranlıq, dəryadan dərin,
Əsir etdiyini ora salardı,

Çıxmağa nə yolu, nə izi vardı,
Süheylin qolundan ipləri qırdı,
Zəncirlə bağladıb ora saldırdı.
O gündən Süheylə yurd oldu zindan,
Su ilə, çörəklə sürdü güzəran.
Bir yerdə olsa da onunla dilbər,
Lakin bir-birindən xəbərsizdilər.
Ağırdı onların sürdüyü dövran...
Görək neyləyirdi Nodərlə Neman.
Elə ki, saxlayıb Mehri o cəllad,
Etdi başındakı dəstəni azad,
Cansız cəsəd kimi o başsız dəstə
Yel kimi baş vurub dalğalar üstə,
Gecəli-gündüzlü üzüb getdilər,
Doğma yurdlarına gəlib yetdilər.
Sürməyi libaslar geyərək onlar,
Matəm saxlamağa verdilər qərar.
Ciyərparəsiylə ayrılan çağdan
Nodər şah ah-aman edirdi hər an.
Matəm libasıydı geydiyi libas,
Həm də saray əhli saxlayırdı yas.
Mehrin dəstəsi ki, qayıtdı gəldi,
Nalələr, əfğanlar göyə yüksəldi.
Qaldı dərd əlində hamısı naçar,
Yaman bəlalara oldular düçar.
Qəlbi yana-yana söylədi ki, şah:
"Məni əhvalatdan tez edin agah."
Nələr törətmişdi qəzavü-qədər,
Onlar bir-bir açıb şaha dedilər.
Şah yenə ah çəkib, aman eylədi,
Yenə qəm qoşunu tüğyan eylədi.
Dünyalar gözünə zülmət göründü,
Sanki taleyinin günəşi söndü.
Xeyli vaxt ağlayıb-sızladı zar-zar...
Dedi oz-özünə: "Nə faydası var?
Etsəm də sinəmi əgər yüz para,
Mənim ciyərparam çıxmaz aşkara.

Düşünmək gərəkdir, yoxsa, onu bil,
Qəm çəkməklə bu iş düzələn deyil."
Şah qələm gətirtdi, kağız gətirtdi,
Əhvalatı qula bir də dedirtdi.
Məktubla bildirib baş verən halı,
Etdi Neman şahı bu işdən halı.
Bunu da qeyd etdi öz məktubunda:
"Belə fəlakəti göndərmiş xuda,
Lakin allah bizə bəla da vermiş,
Verdiyi dərdlərə dəva da vermiş.
Bu dərdin dərmanı tək intiqamdır,
Yoxsa ki, yaşamaq bizə haramdır.
Mehr əgər olmuşsa can-ciyər mənə,
Atalıq qeyrəti düşür həm sənə.
Olsa övladımız yadlar məhbusu,
Həm mənə, həm sənə düşür namusu,
Vardırsa bu işə bir çarə ancaq,
Gərək hər ikimiz ordu toplayaq.
Könlündə səfərə əgər yoxsa meyl,
Sərkərdəlik etsin orduya Süheyl.
O ki, gücdə fildir, çəldlikdə aslan,
Tapmaz heç birisi əlindən aman.
Ona nişanlıdır o nazlı dilbər,
Kəsmiş nigahını göydə mələklər.
Oğlun dayanmayıb bir saat, bir an,
Çəksə ordusunu sahil boyundan,
Düzüb cərgə-cərgə köhlən atları,
Yollansa Cabirin mülkünə sarı,
Mən də qaldıraram ayağa yurdu,
Yığaram başıma böyük bir ordu,
Özüm silahlanıb dərdlə, fəraqla,
Saysız qoşunumsa hər cür yaraqla,
Gəmilər içində tutaraq aram,
Sularda quş kimi qanad açaram.
Mən sudan hərəkət eyləsəm, əlbət,
O da göstərərsə quruda sürət,
Elə bir xoş günü seçərik ki, biz,

Birdən hərəkətə gələr qüvvəmiz,
Neçə gündən sonra bu iki ləşkər
Düşmən torpağını əhatə edər.
Baş tutacaqdırsa bu tədbirli cəng,
Süheylə söylə ki, tərpənməsin ləng.
Gecikdirmək olmaz bu intiqamı,
Qoy yerinə yetsin könül məramı.
Çatsın cəzasına o quldur gərək,
Şeytan pəncəsindən qurtarsın mələk.
Əgər xoş gəlməzsə bu tədbir sənə,
Tezcə öz fikrini yaz göndər mənə.
Girəcək olarsam mən bu cəngə tək,
Başqa bir tədbirə əl atam gərək."
Neman şah oxuyub həmin naməni,
Tezcə başa düşdü bu həngaməni.
Baş verən bu yaman, bu acı dərdə
Ürəkdən acıyıb oldu pəjmürdə.
Düşündürdü onu həddən ziyadə
Gəmiylə səfərə çıxan şahzadə.
Bildi ki, Süheyli kama yetməmiş,
Canan diyarına üzüb getməmiş.
Sarsıtdı Nemanı bu iki matəm,
Sardı ürəyini qəm üstündən qəm.
Dedi: – "Müəmmadır, sirrdir nə hal?
Bu bağlı düyünü dərk etməz xəyal.
Süheyl səyyar ulduz olduğu gündən,
Çərx onu avara saldığı gündən,
Hələ görünməmiş bir əsər ondan,
Heç kim gətirməmiş bir xəbər ondan."
Neman fikrə getdi, çox çəkdi əzab,
Yazdı Nodər şaha belə bir cavab:
"Mən sənin naməni oxudum, ey şah,
Oldum gəlinimin halından agah.
Könül aynamızı aldı qəm-qubar,
Dedik qəm çəkməyin nə faydası var?
Yazmısan yürüşə sən edincə meyl,
Çəksin ordusunu burdan da Süheyl.

Bu güclü qoşunu, yarağıyla o,
Yürüsün dənizin qırağıyla o.
Süheylin adını gəl çəkmə, Nodər,
Kədərim üstünə artırma kədər.
Bir soruş ki, Süheyl hardadır, harda,
Hansı məkandadır, hansı diyarda?
İndi az qalır ki, altı ay ola,
O, sizin məkana düşübdür yola.
Bizi gec gəlməyi etmişdi qəmnak,
Yolda yox olması eyləyər həlak.
Sən öz qoşununu çək quru yoldan,
Uca bayrağını öpsün asiman.
Gəmilər cəm edib bu yandan da mən,
Açaram dalğalar üstündə yelkən.
Bəlkə, göy sularla yol gedən zaman,
Tapam gövhərimdən bir iz, bir nişan.
Süheyli tapsam da, tapmasam da mən,
Könül əsirgəməz gücünü səndən.
Tanrı ətəyindən tutub ikimiz,
Gərək cəhd eyləyək var qüvvəylə biz,
Sarılıb qəzəblə qılıncımıza,
Verək o quldura ən ağır cəza.
Çərşənbə günündə qoşun çəkib mən,
Hərəkət eylərəm öz vətənimdən.
Sən də bu vədəyə eyləyib əməl,
Quruyla ordunu tez götürüb gəl."
Məktubun üstünə yazaraq ünvan,
Nodər elçisiylə göndərdi Neman.
Qasid qət edərək dəniz, dağ, dərə,
Yetirdi məktubu tezcə Nodərə.
Nodər dönə-dönə oxuyub onu,
Öyrəndi yazılan fikri, məzmunu.
Vəd olunan gündən xəbərdar oldu,
Yığdı o vaxtadək böyük bir ordu.
Təyin etdikləri saatda, anda,
Nodər də hərəkət etdi, Neman da.
İki şah orduyla oldular rəvan,

Birisi qurudan, birisi sudan.
Neçə gün yol gedib, mənzil kəsdilər,
Dəryatək coşdular, yeltək əsdilər.
Göründü sahildə düşmən meşəsi,
Aldı qorxu-təlaş yolda hər kəsi.
Bir mənzil qalmışdı yolu Nodərin,
Meşədən hərəkət oldu çox çətin.
"Duşmən indi çıxar pusqudan" deyə,
O da qərq olmuşdu qara şübhəyə.
Qırdırıb meşəni böyük inadla,
Gedirdi irəli çox ehtiyatla.
Bu keçilməz meşə, bu qalın orman,
Hər cür heyvanatla doluydu, inan.
Nodər ovçuluqda olsa da mahir,
Könlündən keçəni etmirdi zahir.
Ceyranla, cüyürlə doluydu sağ-sol,
O isə orduyla olaraq məşğul,
Səyyadlıq arzusu coşmasın deyə,
Özünü vururdu görməməzliyə.
Qəfildən gül rəngli bir xallı ceyran
Atıla-atıla keçdi yanından.
Şah görüncə onu qərarı itdi,
Tez sürüb atını dalınca getdi.
Düşdü sıx meşəyə ceyranın yolu,
Yol həm keçilməzdi, həm də qorxulu.
Başqası bu yerdə nə at çapardı,
Nə də ox atmağa macal tapardı.
Nodər öz atını saxlayaraq, cəld
Bir ox atdı, oxu yan keçdi fəqət.
Elə qəzəbləndi şah öz-özünə,
Dünya görünmədi bir an gözünə,
Oxu izləməyə elə can atdı,
Düşməni büsbütün yaddan çıxartdı.
Ceyranın dalınca o xeyli getdi,
Axırda düşmənin yurduna yetdi.
Cabir ehtiyatı edərək adət,
Gözətçi qoymuşdu hər yana xəlvət.

Demişdi kim olsa, tutub gətirsin,
Ona xəbər versin, ona yetirsin.
Gördü gözətçilər qaçır bir ceyran,
Düşmüş bir atlı da onun dalından.
Onlar qamçılayıb tezcə atları,
Atdan düşürtdülər o şahsüvarı.
Ov etmək qəsdinə düşən o səyyad
Özü səyyadlara ov oldu, heyhat.
Şah qalmaq istərsə öz şahlığında,
Gərək ordusundan düşməsin cüda.
Şaha ordusuyla hörmət edərlər,
Şahlıq əldən gedər, olmasa ləşkər.
Ordu bais olur düşmən fəthinə,
Bir şəxs Rüstəm olsa, acizdir yenə.
Şahlığı öyrənmək gərək arıdan,
Qoşunsuz yaşamaz şahı heç zaman.
Qoşunla seyr edib çəmənlikləri,
Qoşunla birlikdə qayıdır geri.
Şahmatda vardırsa şahın ordusu,
Onun düşmənindən yoxdur qorxusu.
Nodər düşən kimi düşmənə əsir,
Alıb libasını, qoydular yesir.
Onun geyiminə yetirib nəzər,
Padşah olduğunu yəqin etdilər.
Tələsik onlardan atlanıb biri
Xəbərdar etməyə getdi Cabiri.
Dedi: – "Libasından görünür aşkar,
Sənə bir padşah etmişik şikar!"
Bu şad xəbəri ki, Cabir eşitdi,
Əyilib tanrıya ibadət etdi.
Dedi: – "Yeməyini eyləməyin kəm,
Bağlayın hər iki gözünü möhkəm,
Qoy görə bilməsin, tutub qolunu
Aparın, sarayda həbs edin onu.
Gizlin-oğrun tutun bu işləri siz,
Desinlər şah itib xəbər-ətərsiz.
Bir gözətçi qoyun dərhal üstünə,

Sonra xəbərini yetirin mənə.”
Tez əməl etdilər əmrə nökərlər,
Bir dar zirzəmiyə salındı Nodər.
Nə getdiyi yolu görə bildi şah,
Nə ordusu oldu bu işdən agah.
Nodərin səfəri bitincə belə,
Hələ yol gəlirdi Neman gəmiylə.
Sahilə çatmağa bir az qalmışdı,
Yenə yel güclənib, hava qarışdı.
Dalğalar baş vurdu asimanlara,
Buludlar ardına girdi aypara.
Nemanın kələfi yaman dolaşdı,
Kədəri, qüssəsi başından aşdı.
Pərən-pərən düşdü gəmilər tamam,
Boğuldu ordudan bir xeyli adam.
Doğrudur, Nemanı incitdi dalğa,
Lakin sağ-salamat çıxdı qırağa.
Süheylin gəmisi batan sularda
Yenə yelkən açdı o bədbəxt ata.
Yenə gözətçilər yetirib nəzər,
Əlüstü Cabirə xəbər verdilər.
Cabir qayığını o səmtə sürdü,
Sularda çoxunu boğulmuş gördü.
Diri qalanları tutdu suala,
Sevindirdi onu baş verən bəla.
Tez özü sükanın dalına keçdi,
Ədən sahilinə gəlib yetişdi.
Çıxartdı əvvəlcə o hökmdarı,
Sonra daşıtdırdı bütün malları.
Huşunu itirib qəşş etmişdi şah,
Bu son fəlakətdən deyildi agah.
Sarıyıb cismini ağ bir kətana,
Atdılar onu da başqa zindana.
Ayılınca onu aldı vahimə,
Bilmədi dərdini söyləsin kimə,
Cabirsə üz tutub gəmi əhlinə,
Onları ölümlə qorxutdu yenə.

Dedi: – "Şirindirsə əgər can sizə,
Rədd olun buradan öz ölkənizə.
Bir də bu yerlərdə görərsəm sizi,
Bilin, sağ qoymaram heç birinizi."
Gözləri qan-yaşlı, özləri xəstə,
Birtəhər qayıdıb getdi o dəstə.
Nodərin qurudan çəkdiyi ordu,
Bütün bu işlərdən xəbərdar oldu.
Çox götür-qoy edib fikirləşdilər:
"Başsız bir ordudan görünməz zəfər."
Deyərək onlar da tapmadı çarə,
Baş götürüb getdi hərə bir yerə.
Cabirin daha da kefi saz oldu,
Məclisi hər zaman boşaldı, doldu.
Ancaq yad edəndə əsir dilbəri,
Başından aşırdı qəmi, kədəri.
Yetə bilmədikcə yar vüsalına,
İçdiyi gülgün mey dönürdü qana.
Mehrsə dərdini unutsun deyə,
Hər gün baş vururdu nilufərliyə.
Göy libas geyirdi nilufər kimi,
Gözdən yaş tökürdü dənizlər kimi.
Ağlarkən özünü çox döydüyündən,
Nilufər açmışdı o nazikbədən.
Bu yaman bəladan gələrək cana,
Son qoymaq istədi dərdə, hicrana.
Bir çarə gəzirdi, tapılmayırdı,
Gecələr ulduzu, ayı sayırdı.
Quyuda dustaq var-duymuşdu ağlı,
Əzab çəkmədədir, qolları bağlı.
Dedi: – "Qurtararaq onu qəfəsdən,
Ağlayıb-sızlasam qarşısında mən,
Gizli dərdlərimdən olub xəbərdar,
Yəqin ki, Süheylə gedib çatdırar.
O isə halımı anlayar mənim,
Xilasım yolunda can qoyar mənim."
İki kəniz qızla Mehr həmin gecə

Yaslı otağından çıxdı gizlicə.
Quyunun başına çatıb o afət
Dedi: – "Ey zindanda çəkən əziyyət,
Mən də sənin kimi fəqirəm, fəqir,
Mən də sənin kimi düşmüşəm əsir.
İndi xilasına səy edib candan,
Səni qurtararsam bu dar zindandan,
Mən nə desəm qəbul edərsənmi, de?
Hayana göndərsəm gedərsənmi, de?"
Süheyl quyuda edirdi fəryad,
Zəiflik qılmışdı halını bərbad.
Bir yandan çəkirdi zindan zilləti,
Bir yandan da gözəl canan həsrəti.
Bu məhrəm sədanı eşidən kimi,
Titrətdi cismini ayrılıq qəmi.
Toxtaqlıq verərək sonra özünə,
Belə cavab verdi onun sözünə,
Dedi: – "Ey xoşkəlam, bir məni dinlə,
Cansıza can verdin bu sözlərinlə.
Sən əgər rəhm edib dadıma yetsən,
Çıxmaram dünyada heç bir sözündən.
Əgər səndən yetsə mənim nicatım,
Yolunda peşkəşdir bütün həyatım!"
Mehr onun sözündən çox razı qaldı,
Zülfü-kəməndini quyuya saldı.
Süheyl hörüklərdən yapışdı möhkəm,
Mehr ilə iki qız çəkdi həmən dəm.
Qaranlıq otağa saldılar onu,
Buxovdan açdılar tez əl-qolunu.
Dustağı zəncirdən edincə azad,
Yeri öpüb dedi həmin pərizad
Öz doğma yurdunu, kim olduğunu,
Şahzadə Suheylə vurulduğunu.
Dəniz tufanını eylədi təsvir,
Başına gələni danışdı bir-bir.
Dedi: – "Çox çəkdisə başım fəlakət,
Cabirin əlində qaldım səlamət,"

Dedikcə dərdini o nazikbədən,
Dustaq dönə-dönə getdi özündən.
Bitirib sözünü o nazlı dilbər,
Dedi: – “Öldürəcək məni bu qəmlər.
Süheylimdən başqa bilirəm heç kəs,
Məni əsarətdən qurtara bilməz.
Sən, ey yad ellərdə bəlalər çəkən,
Gəl, bu dərdlərimə dəva yetir sən.
İstəyim budur ki, mavi suları
Keçib yollanasan Yəmənə sarı.
Sonra da çöl keçib, dağlar aşasan,
Dərdimi Süheylə tez danışasan.
Lakin bir sirri sən görməkçin özün,
Burda qalmalısan, iki gün, üç gün.
Gözünlə görərək biləsən yəqin,
Mənim bu sözümə olasan əmin:
O gündən ki, məni tapdı min bəla,
Cabirin zülmünə oldum mübtəla,
Sataşınca mənə gözü uzaqdan,
Tir kimi döşəndi yerə nagəhan.
Hüsnümü görməyi çox arzu etdi,
Hər mənə baxanda ürəyi getdi.
Sakit baxa bilmir hüsnümə bir dəm,
Ancaq usandırıb məni qüssə-qəm.
Süheyl eşidincə sözünü Mehrin,
Oldu dərdli könlü bir azca təskin.
Tamam doğru sanıb onun sözünü,
Gizlədə bilmədi artıq özünü.
Ahı dirək oldu göyün tağına,
Düşdü dilbərinin tez ayağına.
Ucadan qışqırıb, ürəyi getdi,
Mehr isə bu hala təəccüb etdi.
Əyilib əsirə baxanda dildar,
Süheyl olduğunu eylədi aşkar.
Ah çəkib ölütək yıxıldı o da,
Çəkdiyi bu ahlar döndü buluda.
O qoşa kənizlər fəğan edərək

Gizlətdi onları ayla günəştək.
Gələndə özünə o şux pərizad
Dedi: – "Fitnə-fəsad açıbdır qanad."
Süheyli bir evə göndərdi pünhan,
Günəş köç eyləyib qaraldı cahan.
Yastığa baş qoyub yatanda ellər,
Süheyl də ayılıb durdu birtəhər.
Sarıldı iki yar cismü can kimi,
Sərv ilə sarmaşıq sarmaşan kimi.
O nazəndə gülə sərv oldu mehman,
Neçə gün sarayda dolandı pünhan.
Tutaraq özünü bala, şərbətə,
Natəvan vücudu gəldi qüvvətə.
Anladı, bildi ki, hərami Cabir
Olmamış Mehrinin vəslinə qadir.
Bir gün etmək üçün könlünü xəndan,
Cabir bağ içində gəzdiyi zaman
Çıxdı qarşısına Süheyl nagahan,
O qoç meydanına girdi bu aslan.
Dedi: – "İgidlikdən deyildir ki, sən
Fitnəylə elləri talan edəsən.
Xalqın gəmisini deşib məkrlə,
Suya qərq edəsən yaman fikirlə.
Birinin başından ağlı gedəndə,
Tutaraq salasan cismini bəndə.
Sən sübut etdinsə öz itliyini,
Mən sənə göstərrəm igidliyimi!"
Deyib hücum çəkdi düşmənə sarı,
Heyrət lal etmişdi həmin qəddarı.
Cabir güləşməyə göstərincə meyl,
Yıxdı rəqibini pəhləvan Süheyl.
Elə ki, Cabiri o sərdi yerə,
Tezcə əl-qolunu saldı zəncirə,
Saldı yubanmadan dərin zindana...
Bu məlum deyilmi hər bir insana:
"Kim ki quyu qazar özgələr üçün,
Özü o quyuya düşəcək bir gün."

Süheylin bəxtinin doğdu ulduzu,
Mehrlə toy edib aldı o qızı.
Cabirin dövləti keçdi əlinə,
Nəsib oldu ona çoxlu xəzinə.
O yerdə yaşayan bütün rəiyyət
Çavan padşaha etdi itaət.
O toy məclisində coşdu fərəhlər,
Səsləndi əllərdə zümrüd qədəhlər.
Fikirləşib dedi cavan hökmdar:
"Cabir həbs etdiyi bütün dustaqlar
Gərəkdir bu saat edilsin azad,
Gəlib mey içsinlər, dolansınlar şad."
Axtarıb gəzdilər bağçanı, bağı,
Gətirdilər ora iki dustağı.
Biri Nodər idi, o biri Neman,
Kim bu təsadüfü edərdi güman.
Burdakı şadlığı necə yazım mən,
Belə bir ustalıq gəlməz əlimdən.
O iki atanı, iki övladı,
Vüsalın kəməndi birdən bağladı.
Şadlıqdan ağlaşıb, qucaqlaşdılar,
Oturub hər yandan söhbət açdılar.
Aydın oldu o gün bütün əhvalat,
Şükürlər edərək hamı qaldı mat.
Verib taclarını bu cavan şaha,
Çəkildi qocalar ibadətgaha.
Eşidincə bunu məmləkət tamam,
Başlandı hər yanda bir yeni bayram.
Fələyin gərdişi yoluna düşdü,
Süheyl Mehri ilə belə görüşdü.
Mehrin gözəlliyi aləmdə təkdi,
Nilufər çəmənə o, bir bəzəkdi.
Həmin rəngdə idi donu, köynəyi,
Bütün saray əhli bildi bu rəyi:
Mavi rəng təbinə xoş gəldiyiçün,
Günəş o paltarda dolanır hər gün.
Pəri sifətlilər, ay bənizlilər,

Göy paltar geyəndə qəlbə xoş gələr.
Qızıldan olsa da günün yanağı,
O da çox xoşlayır mavi olmağı.
Mehman bitirincə bu əfsanəni,
Açdı pərdətutan mavi pərdəni.
Daş-qaşlar saçıldı yaz yağışıtək,
Qonağın diləyi açdı gül-çiçək.
Dastan söyləyənə verib mükafat,
Bəhram göy sarayda uyudu rahat.

## CÜMƏ AXŞAMI

### BAHRAM ŞAH SƏNDƏLİ SARAYDA

Cümə axşamıydı. Qocaman fələk
Sürtmüşdü göylərə səndəli bir rəng.
Dönüb əsən külək sərin bir mehə,
Yaymışdı hər yana xoş bir rayihə.
Bu səndəl ətri ki, ərzə saçıldı,
Gecənin tünd qara rəngi açıldı.
Əyninə geyərək səndəli paltar,
Səndəli qəsrinə getdi hökmdar,
Səndəl ağacından hazırlanan taxt
Üstündə əyləşdi şad, xürrəm, xoşbaxt.
Səndəl ətri saçan sərvi-xuraman,
Qarşıladı şahı xeyli mehriban.
O, bir parça səndəl atdı ocağa,
Yayıldı səndəlin ətri otağa.
Səndəli rəngində olan o qəsri
Tamam məst elədi o səndəl ətri.
Dolandı əllərdə gülgün qədəhlər,
Gecə xumarından qalmadı əsər.
Mey paylayan saqi işlədib hiylə,
Qarışdırmış idi səndəli meylə.
Tamam yox olunca günün şüası,
Açdı qanadını gecə qarğası.

O öz qanadını açdı mükəmməl,
Göydə ulduz-ulduz parladı səndəl.
Vaxtı yetişincə, şahın sənəmi
Ayrıldı səndəli bir günəş kimi.
Yuxuya getməkçün şahi-zamanə,
İstədi dinləsin xoş bir əfsanə.
Tez hazır etdilər başqa səyyahı,
O idi söhbətin, sözün allahı.
Dedilər: "Gəl otur, bir əfsanə de,
Dünya sirrlərindən bir nişanə de."
Xeyir-dua verdi nağılçı əvvəl,
Sanki nəfəsindən saçıldı səndəl.
Dedi: – "Nə qədər ki, yanır kəhkəşan,
Dolanır ulduzlar, dövr edir zaman,
Göydən uca olsun məqamın sənin,
Ulduzlardan iti getsin köhlənin!"
Elə ki, qurtardı bu dürfəşanlıq,
Səyyah hekayətə başladı artıq.

## ALTINCI SƏYYAHIN HEKAYƏTİ

Belə nəql edirlər, ikicə nəfər
Məğribdən Məşriqə edirdi səfər.
Yol üstündə rastlaşıb o iki nəfər,
Biri digərinə oldu həmsəfər.
Müqbil adlanırdı onlardan biri,
Çox keçib getmişdi tozlu çölləri.
Müdbir adlanırdı o biri cavan,
Keçdiyi dənizdi, gördüyü tufan.
Doğruluq yolunu seçmişdi Müqbil,
Xeyirxahlıq edib gəzirdi el-el.
Müdbirdə yox idi düzlükdən nişan,
Xalqa ancaq ziyan dəyirdi ondan.
Gəlib bir səhraya yetişdi onlar,
Ordan gen qaçırdı vaqif olanlar.
O çöldə gül-çiçək, hətta axar su,

Verirdi qətranla kükürd qoxusu.
Üfunət saçırdı daşı-torpağı,
Boğurdu insanı buxarı-buğu.
Atəş deyirdilər bu yerdə yelə,
Kimə toxunurdu-dönürdü külə.
Sonra həmin külü alovlu rüzgar
Toztək gəzdirirdi diyarbədiyar.
Orda yaşamağa yox idi imkan,
Kim qədəm bassaydı, verməliydi can.
Yanıb kül olmuşdu o çöl bürküdən.
Əbəs ad verməyib ora ad verən:
"Şeytan vadisi"ydi o yerin adı,
Vardı hər addımda bir cüt isbatı.
Çölün dəhşətindən tutmayıb xəbər,
Bir xeyli yol getdi o iki nəfər.
Çöldə görünmürdü bir həyat izi,
Doğrudan qorxuncdu "Şeytan vadisi!"
Gördülər nə ucu, nə bucağı var,
Ancaq qət etməyə verdilər qərar,
Dedilər: "Hər dərdə edib təhəmmül,
Yollanaq, allaha edib təvəkkül!"
Günəş artırınca hərarətini,
Müdbir zahir etdi xasiyyətini.
Gah deyinirdi ki: "Havadırmı bu?
Allahın adına rəvadırmı bu?"
Gah da deyirdi ki: "Qüdrətli allah
Yarada bilməyib burda seyrangah."
Ağzını açınca o xəbis, axmaq,
Allaha etiraz edirdi ancaq.
Elə ki, əl çəkdi pərvərdigardan,
Öz yol yoldaşına oxudu meydan,
Dedi: – "Mənim kimi bir ağıllı kaş
Əsla olmayaydı səninlə yoldaş!
Sənə rast gəldiyim o günə lənət!
Ucbatından işim bəd gətirir, bəd!"
Müqbil kömək umub tanrıdan bu an,
Dua eləyirdi ona durmadan.

Nəsihət etsə də yol yoldaşına,
Nəsihət girmirdi onun başına.
Onlar çəkdisə də bir xeyli zillət,
Axır o səhranı eylədilər qət.
Gözdən itdisə də dəhşət səhrası,
Göründü qarşıda dərd-qəm dəryası.
Müqbil dost əlindən gəlmişdi cana,
İstədi "əlvida" söyləsin ona.
Başından etməkçün həmin həmdəmi,
Dedi: – "Gəlib çatdı ayrılıq dəmi."
Yalvarıb-yaxardı Müdbir dostuna,
Peşman olduğunu bildirdi ona.
Axıtdı gözünün seltək yaşını,
Uzanıb torpağa döydü başını.
Elə üzrxahlıq etdi ki Müdbir,
Onun günahını əfv etdi Müqbil.
O nə etmişdisə çıxartdı yaddan,
Bilmədi sözləri yalandır, yalan,
Gəlib yanaşdılar onlar limana,
Gördülər gəmilər durub yan-yana.
Gedən adamlardan alıb xəbəri,
Tapdılar Məşriqə gedən kəsləri.
Gəmi sahibinə yanaşıb bir-bir,
Verdi yol haqqını Müqbillə Müdbir.
Gəmiçi onlara verdi bir qayıq,
Qayıq kiçik idi-iki adamlıq.
Həmin o qayığı bu iki nəfər
Dayanmış gəmiyə bənd elədilər.
Onlara bir xeyli adam qoşuldu,
Gəmi su üzündə uçan quş oldu.
Müdbir yağdıraraq yenə də lənət,
Fələkdən, allahdan etdi şikayət.
Müqbilin qisməti səadət idi,
İşi təsbeh ilə ibadət idi.
Qurtarmış olsa da onu xatadan,
Müdbir gileyliydi yenə xudadan.
Mindi söz atına, çapdıqca çapdı...

Birdən tufan qalxdı, fırtına qopdu.
Çalxaladı suyu şiddətli ruzgar,
Düşdü vahiməyə bütün yolçular.
Müdbir hey deyirdi: "Böyük yaradan!
Görmürəm mən səndə məntiqdən nişan.
Çöldə susuzluqdan üzmüşdün bizi,
Qətlgah eylədin indi dənizi.
O, bundan yamandı, bu, ondan yaman,
Buna çaşbaş qalır düşünən, qanan!"
Müdbirin ağzından çıxınca bu söz,
Daha bərk çalxanıb kükrədi dəniz.
Qovdu dağ dalğalar biri-birini,
Yel qırdı qayığın boz kəndirini.
Bu məlun tufanın iti rüzgarı,
Qovdu hər qayığı bir səmtə sarı.
Tufan nərə çəkdi, haray qopardı,
Yellər gəmini də alıb apardı.
Nicat tapanların sayı azdı, az,
Müqbil də, Müdbir də oldular xilas.
Onların davamsız, tək qayığı da
Zədələnmiş halda üzürdü suda.
Zədələnmiş görüb qayığı, dindi,
Müdbir özbaşına yenə deyindi.
Müqbil namazını yetirib sona,
Əl açıb yalvardı öz tanrısına.
Bir yandan üzürdü onu bu tufan,
Bir yandan dostunun etdiyi tüğyan.
Axır duasını eşidib tanrı,
Yatırtdı hay-haray salan ruzgarı,
Sular sakitləşib dincəldi artıq,
Üzdü aram-aram o kiçik qayıq.
Müqbil göz gəzdirib mavi sulara,
Çox şükür eylədi pərvərdigara.
Elə bu məqamda, elə bu anda
Qaralan bir nöqtə gördü ümmanda.
O qədər çəkmədi, həmin qaraltı
Mavi asimanın rəngini aldı.

Sərin bir meh əsdi o qaraltıdan,
O meh dirilikdən verirdi nişan.
Demə ləpələrin nəfəsiymiş o,
İsa peyğəmbərin nəfəsiymiş o.
Səndəl qoxuyurdu o mehin ətri,
Bu əvəzsiz idi Müqbildən ötrü.
Minnətlə yad edib pərvərdigarı,
Sürdü qayığını o səmtə sarı.
Onun qayığını bəxt özü sürdü,
Müqbil qaraltını yaxında gördü.
Səndəl ağacıymış o görünən şey,
Boyu ərşə qədər, yarpağı gömgöy.
Gördü ki, gövdəsi nur yayır onun,
Yarpağı güzgütək parlayır onun.
Hər kəs bu güzgüyə salarsa nəzər,
Onda öz gələcək bəxtini görər.
Bu səndəl ağacı öpür göyləri,
Kiçik bir adadır məskəni, yeri.
Gövdəsi dayaqdır sanki səmaya,
Səndəl rayihəsi çökübdür suya.
Kölgəsi düşübdür göy ləpələrə,
Ətri döndəribdir suyu ənbərə.
Bir parça torpağı dövrələyib su,
O torpaqda bitib, boy atmışdı bu.
Vardı gövdəsində bir ovuc yeri,
Suyu elə bil ki, nur çətirləri.
Kölgədə qoyardı dürrü, almazı,
Civə kimi idi hər bir damlası.
Tökülür dənizə şırıltı ilə,
Ərimiş gümüşü parıltı ilə.
Bu kiçik torpaqda iki sitəmkar,
Bir qədər dincəlib rahat oldular.
Dincini alınca Müqbil xoşiqbal,
Ağac olan yerə yollandı dərhal.
Yoxlayıb ağacın kökünü sonra,
Qayığın ipini bağladı ora.
Ağac ovuğuna nəzər salanda,

Bir hovuz, bir də ki, daş gördü onda.
O daşın üstündə əzab çəkərək,
Kim isə yazılar eləmişdi həkk.
Müdbir də yanaşdı o fəvvarəyə,
Onun lap gözündən su içsin deyə.
Gördü daş üstündə yazılanları,
Gözəl bir xətt ilə qazılanları.
Yazılan sözləri oxuyub bir-bir,
Bildi bu məzmunu Müqbillə Müdbir:
"Kimin bu adaya dəysə ayağı,
Görsə burda olan bu dəm-dəsgahı,
Bilsin ki, bu səndəl deyildir adi,
Bunda bir sehr var-bir gizli cadu.
Buraya gələnlər içsə bu sudan,
Fərqlənib seçilər əyri doğrudan.
Bu bulaq suyundan içən bir insan
Tezcə xilas olar susuzluğundan.
Düzgün adamdırsa sudan içən kəs
Bir ay yemək-içmək yadına düşməz.
Yalançı içərsə-üççə gün ötər,
O yenə su istər, aclıq hiss edər.
Bu çeşmə suyundan içən bir insan
Gətirsə dilinə əgər bir yalan,
Qəlbi qubar bağlar, ürəyi partlar,
Köçünü dünyadan çəkər o murdar!
İçəndə aclığı dəf edir bu su,
Çiməndə başqa hal alır, doğrusu.
Bu suya girincə yalan danışan,
Yanıb-pöşələnir, qalmır onda can.
Düzgün və xeyirxah çimərsə onda,
Ölməzlik qazanar, bil ki, cahanda.
Burun-qulağını tutaraq bərk-bərk,
Gözünü yumaraq suya girəntək,
Bu suyun altında açsa gözünü,
Başqa bir aləmdə görər özünü...
Elə bir aləm ki, sözlə deyilməz,
İnanmaz gözünə ona baxan kəs.

Yadında saxlasın bunu hər insan:
Bir də cuma bilməz suya bir cuman.
Bura iki kərə girsə bir nəfər,
Cadudan bu suda qalmaz bir əsər."
Müdbir oxuyunca bunu, odlandı,
Yeni bir eşq ilə alışdı, yandı.
İstədi doyunca içsin o sudan,
Yalan danışmasın bir də heç zaman.
Əl çəkə bilməzdi, amma o bundan,
İşləmişdi onun qanına yalan.
Ancaq yaman acdı, susuzdu Müdbir,
And içdi: yalanı daha tərgidir,
Dedi: – "Yalan desəm əgər bu gündən,
Ay allah, izimi sil yer üzündən!"
And içib çeşmənin suyundan içdi,
Həyatından keçdi, canından keçdi.
Müqbilsə əvvəlcə alıb dəstəmaz,
İçdi o bulağın suyundan bir az.
Sehrli bulaqdan o içincə su,
Nə aclığı qaldı, nə susuzluğu.
Yazılan sözləri almayıb saya,
Müdbir istədi ki, girsin o suya.
Soyunub bir anda bulağa girdi,
Su yandırıb, ona işgəncə verdi.
Müqbilsə belinə bağlayıb fitə,
Girdi həmin suya şükr edə-edə.
Bulaq bir dənizdi, Müqbil bir gəmi,
Diqqətlə baxırdı yaxın həmdəmi.
Gördü nə alışdı, nə bişdi Müqbil,
Sudakı əksinə qovuşdu Müqbil.
Suya baş vurunca Müqbil nə gördü,
Özünü başqa bir aləmdə gördü,
Gördü hovuzdakı su deyil, baldır,
Dirilik suyudur, ya ki, zülaldır.
Ləbələb doldurub hovuzu zülal,
Hovuz daşlarına verilib sığal.
Elə bil, hər daşa mahir bir usta

Səndəli rəng verib qoyub üst-üstə.
Bir bağ o hovuzu alıb qoynuna,
Bağın ortasında bir hərəmxana...
Hovuzdan kənara qoymamış ayaq,
Onu qarşıladı neçə gülyanaq.
Gümüş topuqlular, qələm qaşlılar
Onun qulluğunda dayanmışdılar.
Qurulanmaq üçün ipək parçadan,
Qətfə gətirmişdi bir nazlı ceyran.
Əlində atlazdan tikili paltar
Hazır dayanmışdı başqa bir nigar.
Sualtı dünyanın pərizadları,
Oldu yer oğlunun şux xidmətkarı.
Onun bədəninə fitə tutdular,
Sürtüb bədənini tez qurutdular.
Xələt geydirdilər sonra mehmana,
Səndəlin xoş ətri çökmüşdü ona.
Başına əmmamə qoydu bir pəri,
Yayıldı ətrafa şamama ətri.
Sonra da yapışıb onun qolundan
Səndəli saraya oldular rəvan.
Baxıb yol uzunu vara-dövlətə,
Müqbil birdən-birə düşdü heyrətə.
Yerlə əlaqəsi tamam kəsildi,
Özünü başqa bir aləmdə bildi.
Səndəli saraya olunca daxil,
Heyrətdən özünü itirdi Müqbil.
Gördü göy tağıdır uca tağları,
Sanki tanrı idi onun memarı.
Bu qəsrə yad idi dünyanın dərdi,
Könül şadlığından xəbər verirdi.
Döşəməsi səndəl, tavanı səndəl,
Qapıları səndəl, eyvanı səndəl.
Bir ətir duyulur hər tərəfdə-xoş,
Az qalır insanı eləyə bihuş.
Qəsrin ortasında qurulub bir taxt,
Cavahirdir onun zinəti hər vaxt.

Onda qərar tutub bir cürə məxluq,
Canlılar içində bərabəri yox.
Bilinmir o məxluq cismdir, ruhdur,
Onun zərrə qədər nöqsanı yoxdur.
Aləmə nur yağır gözəlliyindən,
Günəşdir, deyərdin, görsən əgər sən.
Fidana bənzəyən cisim – işıqdan,
Allah yaratmayıb onu palçıqdan.
Nur saçır günəşin şüası təki,
Əndamı-cənnətin tubası təki.
Cismi başdan-başa hüsn-lətafət,
Dünya əhli üçün yaranıb afət.
Dövrəyə alıbdır onu yüz pəri,
Qızların ulduza vardır bənzəri.
Bu türfə qızlara baxınca insan,
Heyranlıq ağlını aldı başından.
İtirib özünü, rəngi saraldı,
Yıxılıb döşəmə üstündə qaldı.
Gəlib o gül üzlü, o sərv boylu,
Əlini Müqbilin başına qoydu.
Qız ona can, nəfəs gətirdi yenə,
O durub huşunu itirdi yenə.
Əhvalı gah fəna, gah da xoş oldu,
Gah özünə gəldi, gah bihuş oldu.
Vaxt ötüb getdikcə həmin pərizad,
Müqbili heyrətdən elədi azad.
Lütfüylə toxtaqlıq verərək ona,
Su səpdi qəlbinin alovlarına.
Mehribanlıq edib o gözəl, bilin,
Ən yaxın munisi oldu Müqbilin.
Yüz cür nəvazişlə ona yanaşdı,
Eşq odu Müqbilin başından aşdı.
İtirdi bir anda səbri, qərarı,
Eşq aldı əlindən hər ixtiyarı.
Az qaldı bölünə yüz yerə qəlbi,
Onu o dünyaya göndərə qəlbi.
“Ay üzlü qız yerdən qopardı onu,

Öz taxtına tərəf apardı onu.
Pəri qarşısında yer öpdü mehman,
Dil açdı, titrəyib həyəcanından:
"Mənim nə haqqım var, ey gözəl nigar,
Tutum bu şahanə taxt üstdə qərar!"
Elə uca tutdu onu gülbəniz,
Sanki o ağadır, özü bir kəniz.
Elə məhrəm oldu ona gülbədən,
Bir əsər qalmadı qorxu-ürküdən.
Əyləşdi taxtında ay üzlü dildar,
Müqbil də yanında oldu bərqərar.
Süfrə min naz ilə, nemətlə doldu,
O, buna, bu, ona baxıb kam aldı.
Elə ləzzətliydi o xörək, şərbət,
Deyərdin, behiştdən gəlib bu nemət.
Yemək başlanandan keçdi bir qədər,
Gəldi ortalığa büllur qədəhlər.
Naxışı rəngbərəng bir məcməyidə,
Gəldi o məclisə neçə cür badə.
Büllur qədəhlərin, çini kuzənin
Ətri səndəl ətri, naxışı rəngin.
Qız öz qədəhindən bir qurtum uddu,
Sonra o qədəhi Müqbilçin tutdu.
Elə itirdi ki, özünü oğlan,
Nuş etdi şərabı son damlayacan.
Hey dolub-boşaldı camlara meylər,
Şadlıq sədasını tutmadı göylər.
Elə gücləndi ki, meyin təsiri,
Qalmadı arada utanmaq yeri.
Görüb pərizadın xoş rəftarını,
Müqbil qeyb elədi ixtiyarını.
Saxlaya bilmədi xacə özünü,
Pəridən çəkməyib əsla gözünü,
Gizlədə bilmədi ehtirasını,
Açıqca bildirdi iltimasını.
Sualtı dünyanın şux məleykəsi
Divanə etmişdi bu gələn kəsi.

Əlini çəkmirdi əlindən onun,
Müqbil ehtirasdan olmuşdu məcnun.
Nə səbr qalmışdı onda, nə taqət,
Od-alov salmışdı cisminə şəhvət.
Ram edə bilməyib bu ehtirası,
Qəsri başdan-başa tutdu sədası,
Dedi: – "Ey qəlbimi ovlayan nigar,
Sən məndə qoymadın səbr, ixtiyar!
Rəhm edib dərdimin dəvasını ver,
Bu üzkün könlümün səfasını ver!
Eylə vüsalınla məni bəxtəvər!"
Lakin o üzü ay, gülüşü şəkər
Verdi cavabını bu minval ilə:
"Əzizim, özünü bir az al ələ!
Bilirsən, onsuz da çox içmişik biz,
Nə huşumuz qalıb, nə düşüncəmiz.
Sabah düzəltdirrəm bir mey məclisi,
Şahanə bir şadlıq, bir toy məclisi.
Qayda-qanun ilə kəsdiririk kəbin,
Onda öz yerinə yetər mətləbin.
Hərəmin olaram halallıqla mən,
Haram yaxınlığı qov ürəyindən.
Bugünlük cilovla şəhvətini sən,
Pozma bakirəlik ismətini sən!"
Təsir eləmədi bu söz Müqbilə,
Pəriyə qulaq da asmadı belə.
Az qaldı qışqırıb qopara nalə,
Zorla cəhd etdi ki, yetsin vüsalə.
Saxlaya bilməyib şəhvət selini,
Örtülü bir yerə atdı əlini.
İstədi gövhəri keçirib ələ,
Birləşdirsin onu fil sümüyilə.
Qız dedi: – "Özünü salma heç gücə,
Baş tutan deyildir vüsal bu gecə.
Özünü saxlaya bilmirsənsə heç,
Bu ayüzlülərdən birisini seç,
Gecə keçib gedib, dan sökülüncə

Sənin yarın olsun o ləbi qönçə.
Cismini bürüyən odun, atəşin
Qoy tapsın o pəri vəslilə təskin.”
Müqbil duydu: deyil təkidin yeri,
Boğdu ürəyində coşan hissləri.
Xəcalət çəkərək baş verən haldan,
Daha söz açmadı ona vüsaldan.
Pəri hiss etdi ki, razıdır mehman,
İki qız çağırdı qulluqçulardan.
Biri gülüzlüydü, biri aypara,
İşarət edincə xanım onlara,
Baş əyib pəriyə itaət ilə,
Gedib yanaşdılar tezcə Müqbilə.
Onlardan birilə girib xəlvətə.
Müqbil məşğul oldu eyşə-işrətə.
O xəlvət otaqda nə baş verdisə,
Mən açıq söyləyə bilmərəm sizə.
Mən bunu söyləyə bilərəm ancaq:
Gənc-qızmar günəşdi, qız-aydı parlaq.
Gecə bayrağını endirdi fələk,
Aldı zülmət gecə səndəli bir rəng.
Açıldı gözləri yuxudan göyün,
Oyandı çox uzaq üfüqlərdə gün.
Gün ilk şüasını yaydığı anda,
Müqbil də oyandı bulaq yanında.
Dünənki əhvalat yadına düşdü,
Fikirlər içində donub büzüşdü.
Gözünün önündən keçdi o halət,
Çəkdi o halından xeyli xəcalət.
Səndəl koğuşuna girdi ki, təkrar,
Bəlkə, əməl edə vədinə dildar.
Girdi ki, pak suya, çimib qüsl edə,
Bəlkə, canındakı yorğunluq gedə.
O, fitə bağlayıb belinə yenə,
Cumdu o hovuzun dərinliyinə.
Cumdu... Allah, Allah, bu necə haldı,
Müqbil havadan düz asılı qaldı.

Gördü nə möcüzlər möcüzü vardır,
Nə saray, nə də ki hovuzu vardır.
Baxdı əvvəlkitək, gördüyü sayaq
Yenə də sürətlə axır gur bulaq.
Yenə baş vuraraq cumdu çeşməyə,
Dünənki əhvalat baş versin deyə.
Gördü əvvəlkitək axır gur bulaq,
Günəş də nur saçır parıldayaraq.
Düşündü: hər nə var yuyub axan su,
Sönüb taleyinin parlaq ulduzu.
O, zalım fələyi etdi məzəmmət,
Artdı ağrıları, elədi şiddət.
Qovrulub yanırdı bir ehtirasla,
Bizdən uzaq olsun bu yaman bəla:
Bir yandan başına gələn müsibət,
Bir yandan nanəcib bir həmsəyahət!
Nələr gəlmişdisə onun başına
Söyləyə bilməzdi yol yoldaşına.
Yenə həmin daşa sataşdı gözü,
Oxudu orada yazılan sözü,
Fikir verməmişdi bu cümlələrə:
“Kim bu suya girsə ikinci kərə,
Bir dözülməz dərdə olar giriftar,
Dənizdə üzməklə ondan qurtarar.
Otursun o gərək qayığa dərhal,
Geciksə, tərpənsə o bir az ehmal,
Ya bir div göstərər öz divanını,
Ya dəniz nəhəngi alar canını!”
Dedi: – “Əl üzmüşəm mən nicatımdan,
Ölməyim yaxşıdır puç həyatımdan!”
Sonra düşündü ki, fani olsa da,
Yaşamaq yaxşıdır bu puç dünyada.
O, burdan tez getmək fikrinə düşdü,
Səndəl ağacından qayığı açdı.
Baxıb yol yoldaşı qəmli Müqbilə,
İstədi dərdini öyrənib bilə.
Müqbildən eşidə bilmədi bir söz,

Qayıq dalğaları yarıb keçdi tez.
Yenə Müdbir oldu Müqbilə yoldaş,
Belə yol yoldaşı olmayaydı kaş!
Allahdan umaraq nicatı onlar,
Var gücləri ilə çəkdilər avar.
Müqbilin olmuşdu halı pərişan,
Yaxıb-yandırırdı onu bu hicran.
Aşırdı kədəri, qəmi başından,
Müdbir göz çəkmirdi yol yoldaşından.
Sorğuya tuturdu onu dəmbədəm,
Müqbilsə susurdu ürəyində qəm.
Deyirdi: "Hələlik diləyindən keç,
Yoxdur cavab üçün taqətim də heç.
Sənə mən nə deyim, nə cavab verim?
Özümün özümdən varmı xəbərim?
Dərdim sənin üçün deyil maraqlı,
Mən xəcil, sən isə haqlısan, haqlı.
Dalğınlığım sənə edirsə təsir,
Buna səbəb mənəm, mənəm müqəssir.
Verdiyim əzabı halal et mənə,
Dözmüsən neçə gün, səbr et, döz yenə.
Əgər tale bizə deyilsə küsgün,
Gedib yetişərik sahilə bir gün.
Ölüm yetişməsə əgər, yaşaram,
Öpüb əllərindən vidalaşaram."
Deyib bu sözləri tutdu başını,
Axıtdı gözünün inci yaşını.
Müdbir əhvalatla olub aşina,
Dedi: – "Hava gəlib bunun başına.
Çeşmədə div görüb, ya da ki pəri,
Başına vurubdur onun əsəri."
Müdbir bu sözləri söyləyən kimi,
Göründü qarşıda nəhəng bir gəmi.
Onların dadına yetişdi ruzgar,
O böyük gəmiyə gəlib çatdılar.
O da daxil oldu gəmiyə, bu da,
Qərq olmaq qorxusu qaldı dəryada.

Gördülər ölübdür gəmidə kim var,
Dünya dərd-qəmindən xilas olublar.
Sükançı özü də olmuşdu fəda,
Sükansız gedirdi gəmi dəryada.
Sağ qalan nə kiçik vardı, nə böyük,
Səndəl ağacıydı gəmidəki yük.
Belə deyirlər ki, Məşriqdə adil
Bir hökmdar varmış kövrək, rəhmdil.
Bircə qızı varmış-mələkmiş, mələk,
Məşriqdə yanırmış bu qız günəştək.
Şahın ürəyinin parasıymış o,
Gözünün ağıymış, qarasıymış o.
Tutulubmuş o qız baş ağrısına,
Açı görünürmüş bu həyat ona.
Həkimlər nə qədər cəhd etsələr də,
Dərman tapılmırmış bu ağır dərdə.
Səndəl ağacından düzələn bina
Dərmandır deyiblər baş ağrısına.
Elə bunun üçün övladcanlı şah
Deyib: "Səndəli qəsr eləyin inşa.
Tavanı göylərə çatan saraya
Yar-yaraşıq versin səndəli əşya.
Qızım o sarayda tutarsa qərar,
Gedər başındakı bütün ağrılar!"
Eşidib dillərdə gəzən bu sözü,
Tacir tayfasının gülübdür gözü,
Səndəl almaq üçün gəmilər əlan
Hindistan tərəfə olublar rəvan.
Yaman qızışdırıb onlar alveri...
Gedən gəmilərdən, deyirlər, biri
Səndəllə yüklənib dönərkən dala,
Böyük bir qəzaya olub mübtəla.
Gəmi gedib düşüb bir burulğana,
Çıxa bilməyibdir ordan bir yana.
Tükənib ondakı azuqə bir gün,
Ölüblər gəmidə olanlar bütün.
Axırda bir külək əsib nagahan

Çıxarıb gəmini o burulğandan.
Girincə gəmiyə o iki səyyah,
Müqbil fəğan edib çəkdi dərin ah.
Tutmuşdu gəmini onun fəğanı,
Hicran atəşində yanırdı canı.
Ölən adamları götürüb bir-bir
Atırdı dalğalar qoynuna Müdbir.
Dedi: – "Ölənlərin mallarıyla bir
Gəmi də mənimdir, yük də mənimdir.
Nə qədər Müqbilin gəlir ah-zarı,
Mən də hesablaram dövləti, varı."
Bu zaman qarşıda gördü sahili,
Gəmini yönəltdi ora təcili.
Sahil yararlıydı gəmilər üçün,
Ora yan alırdı səyyahlar hər gün.
Gəzməyə çıxmışdı bu gün yerli şah,
Edirdi dənizə-suya tamaşa.
Görüncə gəmini şah əmr elədi:
"Ordan tez bir adam çağırın! – dedi. –
Gəlib bəyan etsin qoy hökmdara
Gəmi hardan gəlib, yollanır hara?"
Gördülər gəmidə var iki nəfər,
Biri şad görünür, biri mükəddər,
Elə ki, fərmanı Müdbir eşitdi,
Dərhal hökmdarın yanına getdi.
Yer öpub padşaha təzim eylədi,
Fikrini öyrənib, belə söylədi:
"Bir tacir babayam, işim ticarət,
Çəkdim bu səfərdə xeyli xəsarət.
Düşdü burulğana gəmim qəfildən,
İtirdim gəmimdə olanları mən.
Oldu son mənzilim sizin bu sahil,
Sağ qalan bir mənəm, bir qulum Müqbil."
Müdbir ki, caladı yalana yalan,
Göründü canında şişlər nagahan,
Ağladı, zarıdı yaş tökdü gözü,
Ürəyi partlayıb, getdi nəfəsi.

Şahı bu əhvalat heyrətə saldı,
Bu hal görmədiyi qəribə haldı.
Müqbili gətirtdi sonra yanına,
Ürəyi açıldı baxınca ona.
Nökərlər itirmək üçün izini
Gizlətdi Müdbirin cənazəsini.
Müdbirə verdiyi sualı təkrar
Müqbildən soruşdu böyük hökmdar.
Səfərdə başına gələni bir-bir
Başdan ayağacan söylədi Müqbil.
Şah dedi: – "Gəmi də, yükü də onun,
Hər nə var Müqbilə təslim olunsun!"
Müqbilin dilindən çıxan hər kəlam,
Padşah inandı ki, doğrudur tamam.
Dedi: – "Ey dilinə yalan gəlməyən,
Layiqsən ən böyük mükafata sən!
Doğru danışmağın xoş gəldi bizə,
Fərəh bəxş eylədi ürəyimizə.
Susma, dilə məndən nə diləyin var!"
Müqbil təşəkkürlər eləyib izhar,
Dedi: – "Ey qüdrətli, əzəmətli şah,
Qədrini göylərə ucaltsın allah!
Haqqa ibadətdir mənim diləyim,
Xalqa səadətdir mənim diləyim!"
Bu nəcib xisləti, bu təbiəti
Şah Müqbildən görüb, artdı heyrəti.
Zahiri görkəmi, incə rəftarı
Elə cəzb etdi ki, o hökmdarı,
Qulluq təklif etdi sarayda ona,
Müqbil də razılıq verdi sultana.
İşində olmadı onun kəm-kəsir,
Axırda yüksəlib oldu bir vəzir.
Xidmətdə ucaldı, ucaldı başı,
Qonmuşdu çiyninə səadət quşu.
O şah istədi ki, qızını versin,
Onu oğulluğa qəbul eyləsin.
Üzrxahlıq edib Müqbil şahına,

Bildirdi fikrini xeyirxahına:
“Məni yandırıbdır başqa bir atəş,
Ona bütmü deyim, yoxsa ay, günəş.
O, mənim əqlimi alıb əlimdən,
Ömürlük o ayın əsiriyəm mən!”
Çox dedi, şah məhəl qoymadı ona,
Vurdu bu sözləri qulaq ardına.
Baxmayıb qəlbini saran kədərə,
Verdi öz qızını Müqbilə ərə.
Açıb xəzinənin ağzını gen-gen,
Bir toy düzəltdi ki, mat qaldı görən.
Geydirdi Müqbilə səndəli paltar,
Çünki bu paltardan xoşlanırdı yar.
Canını hər şeydən uca tutan qız
Səndəli əşyanı sevirdi yalnız.
Qovuşdurmaq üçün yar ilə vəslə,
Apardılar onu səndəli qəsrə.
Müqbil qəsrə baxıb sarsıldı dərhal,
Saray o saraydı, calal o calal.
Qapı o qapıydı, tavan o tavan,
Taxt həmin taxt idi, canan o canan!
Bu sənəm almışdı bu canı ondan,
Rahatlığı ondan, cahanı ondan.
Heyrətdən canını bürüdü odlar,
Bu od varlığını etdi tarimar.
Bir haray qoparıb yıxıldı yerə,
Az qaldı biryolluq burda can verə.
O gah bihuş olur, gah ayılırdı,
Ayılınca yenə haray salırdı.
Səndəlin xoş ətri ayıldıb onu,
Qaytarırdı geri itən huşunu.
Ayılıb görüncə yarın gözünü,
Alışan görürdü sönən gözünü,
Başından aşırdı yenə naləsi,
Cismində qalmırdı can nişanəsi.
Görüb Müqbilini dərdli, məlallı,
Ürəkdən açıdı o ay camallı.

Mehrini artırıb ona anbaan,
Vüsala çatdırıb etdi kamiran.
Müqbilin cisminə gəldi yeni can,
Sevgili cananın yaxınlığından.
Lakin heyrət onu eləmişdi lal,
Bir gün sordu ondan o yar, gülcamal:
“Sənin bu susmağın, bu davranışın
Deyir ki, çox bəla çəkibdir başın.
Mən bilə bilmirəm niyə böyləsən,
Nolar səbəbini açıb söyləsən?”,
Doğru danışmağa alışmış oğlan
Başına gələni danışdı başdan.
Danışdı artırıb-əksiltmədən o,
Adadan, səndəldən gur çeşmədən o,
Vəsf etdi çeşmədə gördüklərini,
Səndəli sarayı, gözəl pərini...
Baxıb gülə-gülə sevdiyi afət
Danışdı Müqbilə xoş bir hekayət.
Dedi: – “Xoş yaradıb məni yaradan,
Etmişdir hüsnümə dünyanı heyran.
Hüsnümün tərifi düşüb dillərə,
Yayılıb şöhrəti uzaq ellərə.
Cin şahı bir kərə baxmaqla mənə,
İtirib əqlini oldu divanə.
Cinlər bu sarayı elədi məskən,
Sarsıldım onların səs-küylərindən,
Axırda əqlimi itirdim tamam,
Mahir həkimləri topladı atam.
Onlar şəfam üçün çox çalışdılar,
Axır əcinnələr dağılışdılar.
Yenə hərdən qanad sədası gəlir,
Qulağıma çinin nidası gəlir.
Görürəm mən onun qorxunc gözünü,
Eşidirəm onun “Pəri!” sözünü,
Belə deyirlər ki, məni görəni
O cin hökmdarı olmuşdur dəli.
Cinlər toxtaq verib öz şahlarına,

Dənizdə bir ada etmişlər bina.
Saray ucaldıblar, qabağında bağ,
Bir səndəl ağacı, bir büllur bulaq.
Rəssam bir taxt çəkib orda şahanə,
Üstdə qız yaradıb-bənzəyir mənə.
Rəssam fırçasının yaratdıqları,
Olub cin şahının bir xilaskarı.
Sənin gördüyün də, əzizim, gözüm,
Mənim surətimdir, deyiləm özüm.
Öncə heykəlimə baxıb vuruldun,
İndi də özümü görüb, yar oldun!"
Eşidib bu sözü, sevindi Müqbil,
Bu söz tilsimləri elədi zail.
Səndəli sarayda oldu kamiran,
Məhəbbət oxudu yar baxışından.
Səndəl-həyat şövqü, can nəşəsidir,
Səndəl-məhəbbətin rayihəsidir.
Səndəl ətri ilə nəfəs alan kəs
Səndirləyib gəzər, dik gəzə bilməz!"
Sona çatdırınca səyyah sözünü,
Xumarlatdı yuxu şahın gözünü.
Səndəli sarayda yatdı hökmdar,
Səndəl ətri yaydı ətrafa bahar.

## CÜMƏ

### BƏHRAM ŞAH KAFURİ SARAYDA

Cümə göy tağına lap səhər erkən
Ağımtıl rəng çəkdi dan sökülürkən.
Ataraq ağzına hey qovurğatək
Uddu ulduzları hoqqabaz fələk.
Getdikcə səmanın rəngi açıldı,
Sübhün nəfəsindən alov saçıldı.
Göyün paltaryuyan qızı səy ilə
Yudu sübh donunu gün sabunilə.

Ağ libas geyinib şah, günəş kimi
Nuruna qərq etdi bütün aləmi.
Keçdiyi yollara nur saça-saça,
Kafuri qəsrinə getdi birbaşa.
Gülər üz göstərib Çin füsünkarı
Dərhal qarşıladı o şəhriyarı.
Fil sümüyündəndi əyləşdiyi taxt,
Əyləşdi yanında o qız da xoşbaxt.
Yenə kef məclisi başlandı bu gün,
Ağ paltar geymişdi qonaqlar bütün.
Yenə gül yanaqlı bir gözəl pəri
Şərabla doldurdu ağ qədəhləri.
Qədəhlər fəğfuri, qədəhlər kaşı,
Onları bəzəmiş bir Çin nəqqaşı.
Qürub vaxtınadək şah içdi badə,
İçdi hər günkündən xeyli ziyadə.
Elə ki, yox oldu günəşin nuru,
Elə ki, ay göydən səpdi kafuru,
Yenə Bəhram Gurun yuxusu gəldi,
Ona ağ qəsrdə yataq düzəldi.
Qonaqlar içində vardı bir nəfər,
Qəribdi, hər sözü bir dürrü gövhər.
Sözdən dəmət hördü, çələng toxudu,
Öncə Bəhram Gura dua oxudu:
“Qoca çərx qorusun bu barigahı!
Qəsrin yer üzünün olsun pənahı!”
Qurtarıb duanı o gövhər kanı,
Danışdı bildiyi bir macəranı.

## YEDDİNCİ SƏYYAHIN HEKAYƏTİ

Dünyanı çox gəzib, çox görmüşəm mən,
Birini danışım gördüklərimdən.
Xarəzm elidir məskənim mənim,
Doğma yurdum mənim, vətənim mənim.
Soruşsan işimi, sənətimi sən,

Deyərəm saz çalmaq gəlir əlimdən.
Musiqi elmində dairələrdən
Elə xəbərdaram-deyərsən əhsən.
Bu uca sənətdə, inan ki, heç kəs
Mənimlə bəhs edib, yarışa bilməz.
Məndən təlim alır elim, elatım,
Ustadlar ustadı çağrılır adım.
Bir gün xoş bir xəbər tutdu hər yeri:
Bizim yurda gəlir bir çin taciri.
Yanında gözəl bir kənizi vardı,
Hamı o kənizin qulu olardı.
Saya gələn deyil xacənin varı,
Saymaqla qurtaran deyil onları.
Xacə varlısa da, həmin pərizad
Hüsnüylə varlıdır ondan neçə qat.
Hüsnündən əlavə o gözəl afət
Çəng ilə, səs ilə qazanıb şöhrət,
Guya onun çəngi, onun xoş səsi
Dərhal ovsunlayır eşidən kəsi.
Bu xəbər ağızdan-ağıza düşdü,
Nəhayət, xacə də gəlib yetişdi.
Yoxlamaq qəsdilə bu deyiləni,
Şəhər qarşıladı çindən gələni.
Gördülər düz deyib arif adamlar:
Xacə dindar imiş, olduqca dindar.
Gördülər çox-çoxdur onda səxavət,
Edir gecə-gündüz haqqa ibadət.
İbadət edəndə ilahisinə,
Gördülər, bənzəyir nur haləsinə,
Pərdə dalındakı o mahtaban da,
Xacədən qalmazdı şərəfdə, şanda.
Xacə bir dənizin olsa gövhəri,
Huri nəslindəndi o gözəl pəri.
Xacənin ümmantək genişdi əli,
İncitək tutmuşdu həmin gözəli.
Bulud arxasında gəzən günəştək
Rübəndi üzündən çəkmirdi mələk.

Kafurtək ağ idi rübəndi, özü.
Pünhandı ağ bulud içrə gün üzü.
Əyninə geydiyi nə varsa ağdı,
Yerdə qalan rəngdən o qız uzaqdı.
Hər gün iki kərə-səhər və axşam
Nəğmə oxuyardı həmin güləndam.
Kökləyib pərdədə o öz çəngini,
Həmavaz edərdi xoş ahəngini.
Elə kök üstündə oxuyur o şux,
Dinləyən adamı tərk eləyir ruh.
Onun yaşadığı evin yanından
Adamlar çəkilib getmir heç zaman,
İçəri buraxmır amma kimsəni,
Hələ açan yoxdur o ağ pərdəni.
Elə gün olmur ki, orda bir insan
Həyəcan içində tapşırmasın can.
Çoxunu taqətdən salıb o mahnı,
Çoxunun canını alıb o mahnı.
Onda səs də gözəl, ahəng də xoşdur,
O səsi dinləyib ölmək də xoşdur.
O huri çənkini kökləyən zaman,
Salırdı Xarəzmi tabü tavandan.
O müğənni qızda olan məharət,
Elin şahına da çatdı, nəhayət.
Qəsrə çağırmağı qət elədikcə,
Kəsdi qabağını hörmətli xacə.
Şah verdi geydiyi libasa təğyir,
Dedi: – “Məhəbbətdə nə şah, nə fəqir!”
Başqa adamlara qarışdı dərhal,
Nəğməkar onu da elədi bihal.
Artdı müğənnini görmək həvəsi,
Şahdan güclü çıxdı bir qız nəfəsi.
Şahın göndərdiyi neçə şux sənəm
Gedib müğənniylə oldular həmdəm.
İşlədi bəzisi bir kəniz kimi,
Yanaşdı bəzisi bir ənis kimi.
Qızlar gəlib şaha ərz etdi bir-bir:

"Özü nəğməsindən daha gözəldir!"
Şah sevda oduna alışdı, yandı,
Onun vüsalını həsrətlə andı.
İstədi yaxından görsün hüsnünü,
Görsün o aləmə nur saçan günü.
Məhəbbət əqlini əlindən aldı,
Axırda araya elçi də saldı.
İstədi alaraq o pərizadı
Möhtərəm xacənin olsun övladı.
Amma ki, vermədi bu bir nəticə.
Şaha belə cavab göndərdi xacə:
"Sənin bu təklifin, ey əlahəzrət,
Mənimtək bir qula verir şərafət.
Sən qara torpağı göyə ucaltdan,
Zərrəylə günəşi bərabər tutdun.
Elə bir nəsildən deyiləm ki, mən,
Ucala mövqeyim yerdən göyəcən.
Madam ki, sən fikir vermirsən buna,
Nə fayda, bəxt mənə etmir etina.
Məlumun olsun ki, ey şöhrətli şah,
Bu sənəm nigahdan eləyir ikrah.
Ona hüsn-camal bəxş eləyən haqq
Ailə qurmaqdan salıbdır uzaq,
Qəti qərar verib bu işdə o şah...
Necə hökm verir, versin indi şah..."
Bu cavab sanma ki, faidə verdi,
Gah hədə gəldi şah, gah vədə verdi.
Hay-haray salaraq, qopartdı şivən,
Xacəsə dönmədi öz dediyindən.
Şah gördü məhəbbət güclüdür ondan,
Qalib çıxa bilməz bu imtahandan.
Gördü yaman qara keçəcək günü
Tez işə salmasa şahlıq hökmünü.
Şahı şəhvət hissi etdi biqərar,
Kinini, zülmünü eylədi aşkar:
"Gedin hüzuruma gətirin, dedi,
Qəlbləri tovlayan həmin afəti!"

Əməl eylədilər əmrə o saat,
Qəsrə gətirildi həmin pərizad.
Düşürüldü yerə orda aycamal,
Şahı aldadırdı amma xam xəyal.
Yollandı qız olan otağa sarı,
Duyub məramını, Çiqil dildarı
Qolları üstünə aldı çəngini,
Ucaltdı nəğmənin xoş ahəngini.
Nəğmə də, simlər də bir kökdə dindi,
Hər vurğu, elə bil, ürəkdə dindi.
Hökmdar eşitcək nəğməni gendən,
Huşunu itirib getdi özündən.
Kimin qulağına gedib çatdı bu,
Apardı o şəxsi bir şirin yuxu.
Hamını nəğmənin salıb sehrinə,
Yollandı nəğməkar öz evlərinə.
Oyanınca saray, ayılınca şah,
Qızın getdiyindən oldular agah.
Yenə əmr etdi ki, həmin dilbəri
Gedib saray əhli qaytarsın geri.
Gedib gətirdilər qızı dübarə,
Qız yenə toxundu cadu simlərə,
Məhəbbət əsiri şah dönə-dönə
İstədi qovuşa öz sevdiyinə,
Ancaq yetişmədi bu məramına,
Hər dəfə qələbə çaldı qız ona.
Axırda peşiman olub bu haldan,
Büsbütün əlini üzdü vüsaldan,
Xacənin yanına yollandı bir gün,
Yollandı xacədən üzr istəməkçün.
Onun şərəfinə məclis düzəltdi,
Ata adlandırıb ehtiram etdi.
Pərdə qarşısında dayanaraq şah,
Dedi: – "Əfv et məni, işlədim günah!"
Adı şah olsa da o yer üzündə,
Bir heçdi nəğməkar qızın gözündə.
Dedi: – "Sənsən mənim başımda tacım,

Bu gündən olursan qızım, ya bacım!"
Qız onun sözündə sezmədi hiylə,
Baxdı hökmdara övlad gözüylə.
Hədələr, qorxular ötüşən təkin
Oldu gül-çiçəkli diyarda sakin.
Xacə bağ almışdı-cənnətə bənzər,
İçində var idi tağlı qəsrlər.
Namaz qılmaq üçün, ibadət üçün
Gizli bir hücrəsi vardı o mülkün.
Dümağ paltar geyən o mahi-taban
Orda ibadətə məşğuldu hər an.
Əynində varsa da ağ səhər donu,
Qanlı göz yaşları boğurdu onu.
Bilinmir o kimdən ümid gözləyir,
Dua edə-edə kimi səsləyir.
Gözləyir o nəyin, kimin yolunu,
Bir insan öyrənə bilməyir bunu.
Sübh olunca yenə nəğmə deyir o,
Nəğməylə bəxtindən dad eləyir o.
Hicrandan dad edən dili qəmlidir,
Cənginin mizrabı, teli qəmlidir.
Axır dinləyənin inci yaşları,
Ağladır o hətta qəlbidaşları.
Gecəli-gündüzlü o nazikbədən
Bir an qalan deyil ibadətindən.
Gecəli-gündüzlü yaş tökənlərin
İçindən çıxmayır şahı o yerin.
Elə ki, cəngini çalır o gözəl,
Padşah bihuş olur hamıdan əvvəl.
Belə bir qonağı tutaraq uca,
Onun hörmətini saxlayır qoca.
Durur qulluğunda lətafət ilə,
Ötürür saraya şərafət ilə.
Qəsri önündəki bunca izdiham,
Xacəni alverdən ayırıb tamam.
Məndim ürəklərin orda həmdəmi,
Məşhurdum oxuyan, həm çalan kimi.

Məclislərdə sazla keçirdi günüm,
Bir şirin avazla keçirdi günüm.
Batdı adım-sanım gələn o qızla,
Ondakı o çənklə, şirin avazla.
Gəlib çatdı mənə onun sorağı,
Çəkdi ürəyimə dağ üstdən dağı.
El-oba get-gedə məni unutdu,
Füsunkar nəğməli o qızı tutdu.
İltifat görmədim mən camaatdan,
Ürəyim sıxıldı, bezdim həyatdan.
Xilas olmaq üçün üzüntülərdən
Tapdım öz dərdimin çarəsini mən.
Götürüb bir yığın kafuru uddum,
Odlu ürəyimi tamam soyutdum.
Ömürlük itirdim kişiliyimi,
Getdim qıza deyim öz gileyimi.
Xacə də, pəri də görünürdü şad,
Məni yarı yolda götürdü fəryad.
Sarsıtdı xacəni məndəki əhval,
Sarsıldı onuntək o hurimisal,
Məndən soruşdular: "Nədir bu fəryad?
Kimdir həyatını eləyən bərbad?"
Dedim: "Sizdən gördüm bu zülmü, sizdən,
Gördüm bu atadan, bir də bu qızdan!"
Dedilər: "Əl atma belə böhtana,
Zülm edən deyilik biz bir insana.
Bəlkə, yanılırsan, bəlkə, çaşırsan,
Bizi başqasıyla qarışdırırsan?"
Dedim: "Yanılmıram, qulaq verin bir,
Mən edim başıma gələni təsvir.
Ya insafla baxın doğru sözümə,
Ya da iftiraçı deyin üzümə."
Dedilər: "Dərdini aç, danış bizə."
Mən dua eləyib başladım sözə.
Danışdım onlara ərzi-halımı,
Öz böyük dərdimi, öz məlalımı.
Güldü həm o qoca, həm də ayüzlü,

Bildilər dediyim doğrudu, düzdü.
Elə ki, sözlərim çatdı axıra.
Könül istəyimi dedim onlara,
Dedim ki: "İstərəm həyatım boyu
Doğma evim bilim mən bu sarayı.
Çalıb-oxumaqdır çün mənim peşəm,
Başqa heç bir sənət öyrənməmişəm.
Xoşavaz pərilə istərəm hər an,
Hər zaman yanaşı sürüm güzəran.
Mən o çaldığı çənk həvəsindəyəm,
Dastanlar dinləmək həvəsindəyəm.
Ondan dərs almağa çoxdur həvəsim,
Mində bir olsa da, bəsimdir, bəsim.
Nuh kimi çox uzun yaşasam da mən,
Doymaram o qızın nəğmələrindən.
Əgər yeməyimi verərsə xacə,
Pəriyə, həm ona qulam ölüncə.
Gözünüzə açiz görünsəm də mən,
Yoxdur bu sənəti mənimtək bilən.
Bütün xanəndələr, sazəndələr də
Böyük ustad bilir məni hər yerdə.
Musiqi sənəti əflatunları
Məndən aşağıdır, deyil yuxarı!
Çalıb-oxumaqda olsa da usta,
Cadugər sehri var, lakin bu qızda;
Kim görüb nəğməkar oxuyan zaman
Gah ölə, gah da ki, dirilə insan?
O qız göstərincə bu möcüzəni,
Sənət meydanında xar etdi məni."
Sözlərim onlara əsər eylədi,
Mənə üz tutaraq xacə söylədi:
"Sən bizə ömürlük əgər yar olsan,
Saz çalıb, söz deyən bir həmkar olsan,
Keçər güzəranın, həyatın gözəl,
Ancaq bir məsələ törədir əngəl,
O sərvü gülrüxə naməhrəm ikən,
Necə xidmətində dura bilərsən?"

Dedim: “Bilib bunu, özümü qəsdən
Məhrum eləmişəm mən kişilikdən.
Elə ki, qələbə çaldı qız mənə,
Mən özüm özümü saldım bu günə.
Məğlub olduğumu qət edən kimi
Ömürlük məhv etdim kişiliyimi.
Kafurdan o qədər atdım ki, o gün,
Kişilik hissimi itirdim bütün.
Artıq cəlb eləmir gözəllər məni,
Mənə çox görməyin bu ağ pərdəni.
Qoy Kafur adlanan qulunuz heç vaxt
Kafuri pərdədən düşməsin iraq!”
Onlar yoxlayaraq mən binəvanı,
Gördülər sözümün yoxdur yalanı.
Bilib öyrənincə bu həqiqəti,
Mənə göstərdilər dostluq hörməti.
Xidmətim xoş gəldi hər ikisinə,
Oldu ikisi də lütfkar mənə.
Pərdə arxasında qızıyla həmdərd,
O yanda xacəylə oldum həmsöhbət.
Bizim qəlbimizi musiqi, sənət
Möhkəm eləmişdi bir-birinə bənd.
O qız nəğmə deyib şurə gələn də
Heyranlıq hissləri coşurdu məndə.
Nəğməylə dediyi hər söz, hər şer,
Görürdüm, ayrılıq, hicran səsidir.
Görürdüm xəlvətə çəkilib o qız
Gözünün yaşını tökür aramsız,
Elə ki, başından aşırdı qəmi,
Onun mən olurdum yaxın həmdəmi.
Olsaydı qəlbində gizli bir məlal,
Suallar verirdi mənə aycamal.
Mən də bildiyimdən verirdim cavab,
Cəhd eləyirdim ki, çəkməsin əzab.
Gecəyarıyadək söhbət edərək
Qoymurdum darıxa nazənin mələk.
Gecələr yuxusu qaçanda bəzən,

Deyirdi: "Nağıl de, qulaq asım mən."
Ayrılıq haqqında danışılanda
Dolurdu gözləri onun bir anda.
Onun axıtdığı o incə yaşlar
Mənə bir sirr açıb, etdi xəbərdar.
Bildim ki, kiminsə vurğunudur o,
Bir gizli sevginin məhzunudur o.
Didirdi qəlbini hicran xəncəri,
Odur ki qəmliydi təranələri.
Nəğməyə hopmasa gizli məlalı,
Artar iztirabı, gəzər havalı.
Onun əhvalından hali olunca,
Sirrini açmağı elədim rica.
O öz nəğməsini kəsirdi hərdən,
Mən söhbət açırdım xeyir ya şərdən,
Sirri dedirtməkçün ona mən, düzü,
Uzaqdan başlardım söhbəti, sözü.
Gördüm, gətirmişəm onu mən yola,
Təkəəbbür atını çapmır dördnala.
Dedim: "Ey sərvqədd, ey məhi-taban,
Tanrı şad eləsin könlünü hər an.
Qəlbin qayğılardan çox iraq olsun,
Əhvalın hər zaman yaxşıraq olsun!
Haqqım çatsa səndən edərdim sual...
O "Soruş" deyincə, başladım dərhal:
"Nə vaxtdan qapının olmuşam qulu,
Gün kimi öpürəm keçdiyin yolu.
Çoxdan izləyirəm sənin halını,
Həm xoş anlarını, həm məlalını.
Mənim ürəyimə damıb ki, düzü,
Səni açmadığın bir kədər üzür.
Səbəbsə birinin məhəbbətidir,
Bəlkə, bu ah-fəğan yar həsrətidir?
Belə zənn edirəm, sən əbəs yerə,
Dərdini tökmürsən bu nəğmələrə.
Qataraq başını təranə ilə,
Fəryad qoparırsan bəhanə ilə.

Hər nəğmə sənin öz dərdi-sərindir,
Nəğməylə boşalan kədərlərindir.
O gizli dərdini sən mənə, gəl, aç,
Bəlkə də, ona mən tapdım bir əlac.
Lap xatircəm ol ki, ömrüm uzunu,
Gizli sirrim kimi saxlaram onu."
Eşidib sözümü o hüsnü əla,
Verdi cavabımı mənim bu yolla:
"Dediyin doğrudur, yalan yox onda,
Doğruluqdan yaxşı nə var cahanda?
Dərdli olmağımı düz tapmısan sən,
Ancaq səbəbini soruşma məndən.
Ariflər bilməyir bunu məsləhət,
Bu sirri sormağa etmə sən də cəhd.
Sənə bilməyinin faydası yoxdur,
Ancaq mənim üçün ziyanı çoxdur.
Bir dərd ki, dərmanı çox qəhət ola,
Çətin ki, danışsam mənfəət ola.
Bir də bu sualı təkrar etmə sən!..
Birini intixab et iki şeydən:
Ya mənə verdiyin sorğunu tərk et,
Ya öyrən sirrimi, sonra da çıx get!
Elə get, bu yerdə tozun qalmasın,
Nə dağda, nə düzdə izin qalmasın!
Qızın təklifindən mən qorxdum yaman,
Elə bil canıma qəsd etdi şeytan.
Neçə gün dolandım şəhəri qəmkin,
Heç yerdə tapmadım təsəlli, təskin.
Canıma vəlvələ saldı bu fikir,
Əqlimi başımdan aldı bu fikir.
Tükəndi büsbütün səbrü qərarım,
Özümdə olmadı öz ixtiyarım.
Xəlvət bir guşəyə çəkilib yenə,
Dualar oxudum allaha, dinə.
Başımdan çıxmadı bu fikir mənim,
İstədim o sirri mütləq öyrənim.
Usandım bu iki yol ayrıcından,

Axırı təvəqqe elədim ondan:
“Məndə hər istəyə son verib bu sirr,
Dəli-divanəyə döndərib bu sirr.
Başına gələni de, eşidim mən,
Sonra hara desən, çıxıb gedim mən.”
Dedi: – “Qəribədir sənin bu sözün,
Bəlayə salırsan özünü özün.
And iç ki, bu sirri öyrənincə sən
Dərhal bu şəhəri tərk edəcəksən.”
Necə buyurmuşdu o gözəl afət,
Mən o cür and içib, etdim o cür əhd.
Elə ki, qalmadı bir şübhə yeri,
Başına gələni danışdı pəri:
“Sən məni qəmzədə xəyal elədin,
Sirrimi bilməkçün sual elədin.
Başdan başlamasam hekayətimi,
Yaxşı qavramazsan vəziyyətimi.
Bil ki, çin mülküdür doğma diyarım,
O yerlə bağlıdır körpə çağlarım.
Kədərdən, qüssədən, qayğıdan azad,
Orda bəxtiyarca sürürkən həyat,
İki xan vuruşdu biri-birilə,
Mən də əsir düşüb oldum bir kölə.
Uşaqkən alındım hərəmxanayə,
Satıldım sonra da mən bu xacəyə.
O, məni gün kimi tutdu çox əziz,
Hər halda kənizdim, adi bir kəniz.
Oğuldan və qızdan məhrumdu xacə,
“Övladımsan” dedi, məni görüncə,
Məlum oldu-ləhcəm məlahətlidir,
Səsimin ahəngi təravətlidir.
Həm aydın deyirəm şeri, həm qəşəng,
Ruhları oxşayır mən çaldığım çəng.
Musiqi işində mahir olanlar,
Təlim sahəsində ad-san alanlar,
Bizim barigaha dəvət olundu,
İkram göstərildi, hörmət olundu.

Neçə ay ötmüşdü bundan, neçə il,
Kamala çatdırdı məni bu təhsil.
Səsimin tərifi cahanı tutdu,
Çəngimin sədası səmanı tutdu.
O qədər təkamül etdi sənətim,
Elə bir mövqeyə yetdi sənətim,
Eşidib adımı aləm töküldü,
Nəğməmlə ağladı, nəğməmlə güldü.
İstədiyim zaman yatan ayıldı,
İstədiyim zaman yuxuya daldı.
Mən hələ demirəm gözəlliyimi,
Tərifim tutmuşdu bütün aləmi.
Bütün el-obaya yetişdi xəbər,
Cavana, qocaya yetişdi xəbər:
"Xacənin evində şux bir nəğməkar
Hamını eşqinə eləyib düçar".
Sərf edib malını, pulunu bol-bol,
Hər kəs istədi ki, ona olsun qul.
Simu-zər çay kimi, sel kimi axdı,
Qəsrimizə daş-qaş yağışı yağdı.
Satın almaq üçün xacədən məni,
Hər tacir gen açdı pul kisəsini,
Günlər ötüşdükcə, gördü xacə də
Artır müştərinin sayı get-gedə,
Gördü müştəridir bütün Çin mənə,
Qaldırdı qiyməti o gündən-günə.
Qüdrətli bir rəssam vardır ki, Çində,
Adı əzbər olub ellər içində.
Tapılmaz beləsi, gəzsən aləmi,
O, gizlincə çəkib mənim şəklimi,
Uzaq bir ölkəyə salıb yolunu,
Bir şahlar şahına göstərib onu.
Nə qədər ki, şah var bu yer üzündə,
Bəndəymiş o şahın önündə, bəndə.
O, mənim şəklimi görüncə birdən
Qeyb etmiş əqlini-huşunu sərdən.
Demiş: "İtirmədən bir saat, bir an,

Elçilər qoy Çinə olsunlar rəvan.
Nəyin bahasına olursa-olsun,
Gedənlər kənizi mənimçün alsın!"
Mənə müştəriydi Çinin xaqanı,
Ancaq bəyənmədi şahənşah onu.
Xacənin istəyi-məzacı ilə,
Çinin neçə illik xəracı ilə
Məni satın alıb yola düşdülər,
Yolları sürətlə ötüb-keçdilər.
Şaha yetirdilər, nəhayət, məni,
Dürr doğma dəryada tapdı yerini.
Bütün elçilərə şah ənam verdi,
Axı, məni şaha onlar yetirdi.
Şah öz otağında yer verdi mənə,
Qərq oldum çiçəyin, gülün ətrinə.
Məndən ayrılanda bir saat, bir an
Qaranlıq görürdü cahanı sultan.
Ömürdən istəyi camalım idi,
Həmişə umduğu vüsalım idi.
Keçirdi günümüz ovda-şikarda,
İşrət məclisində, ya laləzarda.
Səyirdib atını düzdə, çəməndə,
Salırdı ahunu, guru kəməndə.
Şahənşah atını nə vaxt çapardı,
Şikar etmək üçün bir gur tapardı.
Edərdi o guru qanına qəltan,
Yer lalə açardı gurun qanından.
Çəkilərdi gurun ətindən kabab,
Gələrdi ortaya lalərəng şərab.
İstər barigahda, istər çəməndə,
İstər dincələndə, istər gəzəndə,
Qəlbinin aramı yox idi mənsiz,
Səhəri, axşamı yox idi mənsiz.
Mənsiz yetişməzdi kama, mərama,
Mənsiz uzatmazdı əlini cama.
Qüvvədən düşürdü qolları mənsiz,
Bir addım getmirdi yolları mənsiz.

Elə ki, nəğməmi dinləyirdi o,
Ürəkdən ah çəkib inləyirdi o,
Getsə bağça-bağa, yanında məndim,
Gəlincə otağa, yanında məndim.
Gözdən qoymayırdı camalımı o,
Arzulardı hər an vüsalımı o.
Bir sözlə, ağzının ləzzəti məndim,
Ömrünün mənası, məqsədi məndim.
İş gəlib o yerə çatdı bir zaman,
Kəsdi ümidini əhali şahdan.
Şah eli-obanı tamam unutdu,
Gecəli-gündüzlü tək məni tutdu.
Görüb bu istəyi, duyub bu hissi,
Oldum mən də onun bir divanəsi.
Vəslini istəyib dururdum hər an,
Darıxırdım əgər ayrılsam ondan.
Mən də eşq oduna yanırdım, o da,
Bu od yandırırdı asimanı da.
Şahın böyük eşqi, böyük qayğısı,
Tamam azdırmışdı məni, doğrusu.
Olsam da taleyi dönük bir kəniz,
Çox vaxt danışığım olurdu yersiz.
Şahı hüzurumda bir qul görəndə,
Azaldı nəvaziş duyğusu məndə.
Danışdım ağzıma gələn sözləri,
Cəfəng söhbətləri, çərən sözləri.
Bir gün şah ovlaqda şikar edərkən
Yenə də yanında hazır idim mən.
Şərab təsirindən sərxoşdu sultan,
Məni məst etmişdi lovğalıq yaman.
Şah birdən qarşıda bir ahu gördü,
Dərhal öz yayını ona çevirdi.
Dedi: – "Ona tərəf qoy at sürüm mən,
Harasından desən, ordan vurum mən".
Dedim: "Elə nişan al ki, sən onu,
Bir oxla birləşdir iki qolunu.
Sonra da sən ona yaxınlaşmadan,

Üzsün xirtdəyini atdığın peykan.”
O mahir kamandar eşidib bunu,
Birləşdirdi ovun iki qolunu.
Bitişdirən kimi iki qolunu,
“Ya allah!” söyləyib üzdü boynunu.
Şah o gün göstərdi elə bir hünər,
Mislini heç zaman görməyib bəşər.
Mənim borcum idi ona can demək,
Sərrast nişanını tərif eləmək.
Halbuki əqlimi itirərək mən,
Yenə əl çəkmədim çərənləməkdən.
Ədalətlə hökm versəydi sultan,
Gərək asılaydım dar ağacından;
Doğratsaydı belə, bu cəza yenə,
Cəfəng sözüm üçün az idi mənə.
Ancaq edamımı buyurmadı şah,
Qəzəb qılıncını siyirmədi şah.
Əlimi-qolumu sarıtdırıb o,
Bir düzə atdırdı bəndli-buxovlu.
Dedi: – “Qoy bu düzdə yaşasın yalqız,
Ac, susuz qalaraq, ölsün adamsız!”
Sonra da şəhərə tərəf tutdu üz.
Ötdü iki gecə, iki də gündüz,
Mənə “qızım” deyən mehriban xacə,
Demə, xatırlayır məni bir gecə.
“Gedim, görüm” deyə düzəlir yola,
Axır gəlib çatır bizim mahala.
Qürurum başıma açanda xata,
Demə, iki mənzil kəsibmiş atam.
Şahın qəzəbinə gəldiyim günlər
Xacə Çin mülkündən edirmiş səfər.
Atıldığım yerdən bir az o yana,
Sürürkən atını o saymazyana,
Nədənsə ürgərək at birdən çaşır,
Əvvəlki yolundan aralı düşür.
Yoldan azmış görür atını xacə,
Biyabana sürür atını xacə.

Sən demə, o zaman, o gecə vaxtı
Onu mənə tərəf çəkirmiş baxtı.
Elə ki, at mənə lap yaxın gəlir,
Xacənin gözünü yuxu lap dəlir.
Bir az yatmaq üçün düşür, o atdan,
Göz açanda görür işıqdır cahan.
Görür ki, özündən yüz addım kənar,
Adama oxşayan bir qaraltı var.
Salınıb kişitək buxova-bəndə,
Elə bil ki, düşüb cismi kəməndə.
"İnsandırmı görən? O sarğı nədir?
Ağlı başındadır, ya divanədir?"
Bilməkçün bu işin əsrarını o,
O tərəfə salır güzarını o.
Çatanda görür bir sərvi-çəməndi,
Öz saçı olubdur onun kəməndi.
Bağlanıb zülfünün kəməndi ilə,
Uzanıb səhrada bu bəndi ilə.
Əlini uzadır-bilsin bu sirri:
Sarınan ölüdür, yoxsa ki, diri?
Tələsik sarğını açdığı zaman
Görür qalmayıbdır sifətində qan.
Görür müşkin saçı oxşayır mənə,
Alnı, gözü-qaşı oxşayır mənə.
Görür mənimkidir o solğun camal,
Üzündəki çökək, üzündəki xal.
Xacə anlamayır məstdir, ayıqdır,
Bilmir yuxudadır, yoxsa oyaqdır.
Heyrətdən tutulub dili, olur lal,
Başında dolanır cürbəcür xəyal.
Heyrət içindəydi xacə bayaqdan,
Görür ki, bir karvan gəlir uzaqdan.
Demə o, karvanla ora gələnlər
Mənim dostlarımmış, bir də nökərlər.
Onlar görüb məni əl-qolu bağlı,
Çoxunun başından çıxıbdır ağlı.
Cıraraq üzünü dad eləyən kim,

Göz yaşı axıdıb növhə deyən kim...
Xacə gözlərini zilləyib mənə,
Heyrətdən olubmuş dəli-divanə.
Ağıyla, növhəylə çəkib qəmimi,
Saxlayıb yasımı və matəmimi.
Düşünür: "Kim məni bu hala salıb?
Ömrümün günəşi niyə qaralıb?"
Cavab tapmayaraq heç bir suala,
Yuyundurub məni göz yaşlarıyla,
Atlazdan, ipəkdən biçdirir kəfən,
Kafur da səpdirir kəfənə üstdən.
Boynuma biçilən o kəfən boyu,
Həm ənbər səpirlər, həm də gül suyu.
Cismim ölü kimi düşübmüş tabdan,
Dirçəlir ənbərlə həmin gülabdan.
Qızlar dərhal düşüb ayaqlarıma,
Tez gülab sürtürlər yanaqlarıma.
Mən elə bu zaman açıb gözümü,
Söylədim onlara olan sözümü:
"Bəla qaynağıdır bu səhra, bu düz,
Gəlin bu yerlərdən uzaqlaşaq tez!"
Xacə sözlərimi anlaya bildi,
Əmrilə qafilə yola düzəldi.
Dindi zınqrovlar o boş sahədə,
Mənə yer verdilər bir kəçavədə.
Ağzıma gah şərbət damızdırdılar,
Gah ənbər iylədib, gülab vurdular.
Yol getdik iki gün-gecə və gündüz,
Canım dircəlməyə başladı sözsüz.
Karvan bir çəmənə gəlib yetişdi,
Xacə bir bulağın yanında düşdü.
Əmr etdi otluqda çadır quruldu,
Elə bəzədilər-şahanə oldu.
Mənimçün ucaldı yaraşıqlı taxt,
Uzandım üstündə mən rahat-rahat.
Yanıma gələrək xacə oturdu,
Başıma gələni birbəbir sordu.

Nə ki, yada düşdü-danışdım ona,
Nə ki, baş vermişdi-danışdım ona.
Dediyim sözlərdən qurudu qaldı,
Bir anlıq başını aşağı saldı.
Elə ki, danışdım ona halımı,
Mən də ona verdim öz sualımı.
O da öz halını elədi bəyan,
Bir söz əskiltmədən ya artırmadan.
Ürək-dirək verib xacə hey mənə,
Min şükür elədi haq kərəminə.
O günü dincəlib rahatlanınca,
Ertəsi üz tutub soruşdu qoca:
“Dedin, məlum oldu mənə əhvalın,
De görüm, bəs indi nədir xəyalın?”
Dedim: “Kənizinə qəzəblənib şah,
Xəbərsiz deyildir bu işdən allah.
Şikayətim yoxdur çəkdiklərimdən,
Daha pis cəzaya layiq idim mən.
Qəzəbli könlünü şah sakit etdi,
O məni öldürdü, tanrı diriltdi.
Mərd-ölü yanına qılıncla girməz,
Bir kərə ölmüşü bir də diriltməz.
Geydirdiniz mənə siz bir ağ kəfən,
İstəyim budur ki, bu kəfənlə mən
Gedəm şah qəsrinə, öpəm əlindən,
Etiraf eləyim günahımı mən,
Deyəm: “O günah ki, edib bu kəniz,
Layiqdir ölümə, şəksiz-şübhəsiz.
Əql ilə hərəkət elədi sultan,
Mənim ölümümə vermədi fərman.
Mənə yeni həyat bəxş edib xuda,
Vermək istəyirəm şaha onu da!
Ölüm hökmü versə, çox xoşdur mənə,
Əgər bağışlasa, quluyam yenə.
Günahkar olsam da, odur pənahım,
Həm nicat yerimdir, həm səcdəgahım.
Etiraf eləsəm olan günahı,

Gümanım budur ki, o şahlar şahı
Suçlu kənizini əfv edəsidir,
Qəlbinin kinini ləğv edəsidir."
Deyib sözlərimi mən bitirincə
Fəryad qopararaq söylədi xacə:
Dedi: – "Bu nə sözdür, danışdın, aman!
Bəlkə də, çıxıbdır ağlın başından!
Nədir bu düşüncə, nədir bu kəlam,
Yoxsa, həyatından doyubsan tamam?
Şah ki, bir söz üçün axıdır al qan,
Yenəmi olasan sən ona qurban?
Şah ki var, şölədir, od parçasıdır,
Kim yaxın gedərsə, yandırasıdır.
Şah ilə yaxınlıq əbəsdir, əbəs,
Gec-tez öləsidir yaxın gedən kəs.
Şah ki qəzəbləndi, uzaq ol, uzaq,
Bil ki, şah qəzəbi ocaqdır, ocaq!
Məsləhət budur ki, ondan uzaq dur,
Şahdan uzaq olan dərddən uzaqdır.
Padhaşın əgər soyusa hirsi,
İnan ki, sorağı tutacaq ərzi,
Bizə də çatacaq onun sorağı
Ki, nahaq incidib sən gülyanağı...
Hamı biləcək ki, adil hökmran
Olubdur verdiyi o hökmə peşman.
Gəlib çatsa bizə belə bir soraq,
Sənə çətin olmaz qəsrə qayıtmaq.
Hələ tərsliyində edirsə israr,
Məsləhət budur: qaç, canını qurtar."
Xacə sözlərini qurtardı haman,
Yaxşı məsləhətdi, deyildi yaman,
Xacənin qərarı qəbul edildi,
Hamı köç etməyi məsləhət bildi.
Madam çox uzaqdır bu yerə Xarəzm,
Dedik qafiləmiz ora etsin əzm.
Şahdan ayrı düşdüm bu minvalla mən,
Hicranı məsləhət bildim ölümdən.

Təsəlli verməyin deyildir yeri,
Hicran da ölümdür-deyiləm diri.
Fərqim yoxdu mənim bu cənazədən,
Odur ki, layiqdir geydiyim kəfən.
Madam ki, həsrətəm yarın vəslinə,
Geydiyim bu kəfən yaraşır mənə.
Cismim pozulmasın deyə, bir qədər
Dostlar kəfənimə kafur səpiblər.
Üstümə o qədər kafur tökülmüş,
Kəfənim elə bil olubdur gümüş.
Axır ki, Xarəzmə çatdı dəstəmiz,
Yurd salası olduq bu şəhərdə biz.
Sən mənə yaxın da, uzaq da olsan,
Yaxşı xəbərdarsan indi halımdan.
Yerli şah hüsnümün oldu vurğunu,
Mən yalan danışıb, rədd etdim onu.
Elə zənn etmə ki, şıltaqlığımdan
Mən onu rədd edib, söylədim yalan.
Bu rədd cavabının səbəbi birdir –
O da sevgilimə sədaqətimdir."
Bu qəmli dastanı eşidərək mən,
Əbədi ayrıldım o gülüzlüdən.
O vaxtdan bir yerdə tutmayıb qərar,
Gəzib dolanıram diyarbədiyar.
Oldum müsafiri mən neçə qəsrin,
Heç kəsə açmadım bu sirri, lakin.
Sən mənə göstərib ehtiram, hörmət,
Buyurdun ki: "Danış xoş bir hekayət!"
Düşündüm: yeridir bu hadisənin,
Həm də kafuridir sarayın sənin.
Bu rəng o dilbəri saldı tez yada,
Kafuri geyimi xoşlayır o da.
Kafuri parçadan kəfən geyir o,
Kəfəni kafurla ətirləyir o.
Kafuri kəfəndə məhv olur o ay,
Halbuki layiqdir ona bu saray!"
Səyyah danışdıqca hekayətini,

Şah dərhal tanıdı öz afətini.
Huşu dönə-dönə getdi və gəldi,
Yüz dəfə səssizcə öldü-dirildi.
Gah nurlandı gözü, gah da qaraldı,
Bu söhbətlər onu min hala saldı.
Özünü saxlayıb bağırmadı şah,
Qorxdu əhvalatı anlaya səyyah,
Qorxdu söhbətini yarımçıq kəsə,
Girə aralığa başqa hadisə.
Səyyah qurtarınca hekayəsini,
Şah göyə qaldırdı öz naləsini.
Töküb göz yaşını, səyyahı qucdu,
Ruhunun bülbülü bir anda uçdu.
Şad olub səyyahın bu xoş sözündən,
Sevinib hökmdar getdi özündən.

## DİLARAMIN BƏHRAM SARAYINA QAYITMASI

Elə ki, o gecə Bəhram nagahan
Yarın xəbər tutdu sağ qalmağından,
Boğazına bıçaq çəkilən ovtək,
Özünə gəlmədi gecə sübhədək.
Yandı eşq oduna quru ot kimi,
Səbirsizlik oldu yaxın həmdəmi.
İztirab içində ah-nalə qıldı,
Gah qopdu yerindən, gah da yıxıldı.
Qərar tapsa idi, deyərdi: "Mehman,
Bir də təkrar elə söhbəti başdan!"
İşi-əhvalatı tez bilmək oldu,
Gah ölmək, gah da ki, dirilmək oldu.
Gah onu canından edirdi hicran,
Gah vüsal ümidi bəxş edirdi can.
Bir sözlə, o axşam sabaha qədər
Bəhram nələr çəkdi hicrandan, nələr!
Bəhram şah o qədər dirildi-öldü
Ki, səhər axırda üzünə güldü.

Sübhün gəlini ki, erkən oyandı,
Günəş nəfəsindən od alıb yandı.
Şah bir an tapmadı yerində aram,
Düşdü ürəyinə vəsli-Dilaram.
İstədi o yana eyləsin səfər,
Qovsun köhlənini Xarəzmə qədər.
Dövlət adamları mane oldular,
Dedilər: "Bir qədər səbr et, hökmdar!
Səfər sənin üçün çətindir, çətin,
Hicrandan pozulub çünki səhhətin.
Düzdür, canüzəndir ayrılıq-fəraq,
Amma çox uzaqdır bu yol, çox uzaq.
Bu yolda azalmaz, artar möhnətin,
Daha ağır hala düşər səhhətin."
Elə ki, xəbəri aldı həkimlər,
Yer öpüb səcdələr qıldı həkimlər.
Dedilər: "Şahımız, budur məsləhət,
Görürük güclüdür səndə məhəbbət.
Ancaq yadına sal bir an dağları,
Sarsılan deyildir dağın vüqarı.
Tərpənən deyildir dağlar yerindən,
Dağlar məhşər günü qopar yerindən.
Neçə gün səbrini ələ al, ey şah,
Dağ təmkinli olub burda qal, ey şah!"
Onların sözünü Bəhram eşitdi,
Getməyə elçilər müəyyən etdi.
Hər biri sürətdə fələkdən iti,
Mələkdi hər kəsin amma xisləti.
İki məktub verdi şah bir elçiyə:
Biri Dilarama, bir Xacəyə.
Xacəyə-dil-ağız, hörmət məktubu,
Dilarama-sevgi, minnət məktubu.
Xacəyə yazdı ki: "Eşitmişik biz,
Xarəzm ölkəsidir indi yeriniz.
Xeyli fərəhləndik biz bu xəbərdən,
Çözüldü bəndimiz azı yüz yerdən.
Yazdığım bu məktub sənə çatınca,

Bura gəlmənizi edirəm rica.
Yuxuya bizimtək qataraq haram,
Gəlin, gecə-gündüz tapmadan aram!”
Ürəkdən sevdiyi nazənin gülə
Qanlı göz yaşıyla yazdı şah belə:
“Sənsiz könlüm mənim qan ağlayır, qan!
Olur qanlı yaşım gözümdən rəvan.
Gəl, gəl! Qurban olsun sənə bu canım!
Gəlməsən, boynunda qalacaq qanım.
Hicran kədərilə alma canımı,
Firqət xəncərilə tökmə qanımı.
Hicran qılıncını qəlbimə vurma,
Məndən uzaq durub, uzaq oturma.
Gəl, ya günəş kimi, ya qəmər kimi,
Bəmbəyaz libaslı pərilər kimi.
Olsam da yanında əliqanlı mən,
Ayrılıq oxunu gəl çək sinəmdən.
Bir bax, kəfənimi geydim əynimə,
Məğlub qılıncımı saldım çiynimə.
Özüm gəlməsəm də hüzuruna mən,
İşıqlanmasa da gözüm üzündən,
Elə zənn etmə ki, kamiranam mən,
Yox, zəif düşmüşəm, natəvanam mən.
Ayrılığın məni zəif salıbdır,
Məndə can qalmayıb, cəsəd qalıbdır.
Ötmür boğazımdan bircə udum su,
Sanıram su deyil, öz qanımdı bu.
Səndən ayrılanı tavansızam, gəl,
Səbrsiz-qərarsız və cansızam, gəl!
Ölmüşəm-cismimdə həyatım ol sən,
Düşmüşəm-qolum ol, qanadım ol sən!
Gəl, bir az yubansan, bir az geciksən,
Bil ki, həsrətinlə məhv olaram mən!”
Xarəzm şahına əmr etdi ki: “Sən
Xalqdan topladığın bol vergilərdən
Xacəyə yol xərci verib, sal yola,
Söylə, yubanmadan qayıtsın dala!”

Məktubları alıb qasidlər o an
Yel kimi Xarəzmə oldular rəvan.
Xacənin bağına tərəf getdilər,
Şahın məktubunu təqdim etdilər.
Xacə alıb onu tez səcdə qıldı,
Ay da şah yazdığı məktubu aldı.
Şah xətti gözünə sataşan zaman,
Xacənin sevinci aşdı başından.
Dilaram alınca şah naməsini,
Günəş özü öpdü onun üzünü.
Xarəzm şahı ki, naməni gördü,
Xacəni çağırıb əmri yetirdi.
Sonra xəzinədar gəldi yanına,
Yola pul verməyi buyurdu ona.
Səfər tədarükü qurtaran zaman,
Yola deyə-gülə yollandı karvan.
Gecəli-gündüzlü yol getdi onlar,
Dedilər: "Gözləyir bizi hökmdar."
Karvan bir mənzillik yerə yetişdi,
Şah hiylə işlətmək fikrinə düşdü.
Elə ki, axşamdan keçdi bir qədər,
Yuxuya qərq oldu qəsrdəkilər.
Minib köhlən atı yel kimi getdi,
Canan çadırına sübh erkən yetdi.
Yolçular çəkmişdi yolda əziyyət,
Burda dincəlməyi etmişdilər qət.
Alaqaranlıqdı hələ, doğrusu,
Örtmüşdü gözləri sübhün yuxusu.
Hələ çadırlarda şamlar yanırdı,
Nərgizin gözləri xumarlanırdı.
Bir çinar bitmişdi çeşmə başında,
Adam yerləşərdi gen koğuşunda.
İldırım düşərək həmin çinara,
Açmışdı köksündə belə bir yara.
Atını bağlayıb şah möhkəm daşa,
Özü də sığındı həmin koğuşa.
Koğuşdan çadıra baxıb hökmdar,

Gördü ki, ordadır o gözəl nigar.
Coşdu fərəh hissi o şəhriyarda,
Bəxtindən yuxudan oyandı yar da.
Yataqdan sıçrayıb qalxdı o afət,
Əvvəlcə allaha etdi ibadət.
Təşəkkür eləyib pərvərdigara,
Cəngini götürüb köklədi sonra.
Söykənib çinara o gözəl pəri
Oxudu məhəbbət təranələri.
Hicran naləsiydi bu təranələr,
Üsyan naləsiydi bu təranələr.
Çinardan ayrılıb sonra o dildar,
Çeşmə kənarında oldu bərqərar.
Şah yazan naməni zümzümə etdi,
Ondan təzə-təzə nəğmə düzəltdi.
Oxuyub hər sözü nalə çəkirdi,
Gözündən yaş tökmür, al qan tökürdü,
Şahın da qanlı yaş axdı gözündən,
Davam gətirməyib getdi özündən.
Qatıb göz yaşını qüssəyə, dərdə,
O, belə deyirdi bu nəğmələrdə:
“Ah, bu yol nə çətin, nə uzaq oldu,
Həsrətim sinəmdə yanar dağ oldu!
Bəsdir, boğazıma yığılıb canım,
Daha dərd çəkməyə yoxdur imkanım.
Ömürdən əlimi üzmüşəm tamam,
Möhnət dənizində tutmuşam aram.
Söylə, ey rəhmsiz, divanə fələk,
Mənə qismətdirmi o şahı görmək?
Nə olar, sozümu çatdır sən ona,
Sürtüm üz-gözümü ayaqlarına!
Vəslini istərəm-odur dərmanım,
Vəslindən başqa şey istəmir canım!”
Bu qəm nəğməsini şah ki, eşitdi,
Cırıb yaxasını, yüz para etdi.
Nəfəsindən qopan ah alovları
Yandırdı çinarı, yaxdı çinarı.

Oda səcdə edən atəşpərəsttək,
Döşəndi torpağa huşu gedərək.
Yaman dərdə saldı pərini bu hal,
Heyrətlər içində o da qaldı lal.
İnci danələri səpdi gözündən,
Ayağından öpüb, getdi özündən.
Yerə üzüqoylu düşdü asiman,
Günəş öpdü onun ayaqlarından.
Qara torpaq üstə düşdü yaradan,
Günəş də onunla endi səmadan.
Allahın kölgəsi düzə yayıldı,
Müqəddəs kölgəyə gün səcdə qıldı.
Nə ondan səs çıxır, nə bundan səda,
O da xəbərsizdi özündən, bu da.
Axır hicran bitib, yetişdi vüsal,
Allah, Allah! Görün nə haldır bu hal!
Onlar bihal idi hicran axşamı,
Vüsal səhərində tapdılar kamı.
Ağ paltarlı səhər çəkəndə nəfəs,
Özündə deyildi onlardan heç kəs.
Elə ki, artırdı səhər kafuru,
Bürüdü aləmi günəşin nuru.
Yuxudan oyandı bütün yolçular,
Bihuşlar başına tez cəm oldular.
Xacə görən kimi iki bihuşu,
Bildi ki, onların dönüb bəxt quşu.
Əmr etdi: “Tez burda gərdək düzəldin,
Sonra da onları tək qoyub, gedin!”
Kafuri rəngdəydi gərdək də hətta,
Girdi ayla günəş ağ bulud altda.
Ayılınca pəri, bir də hökmdar,
Bilmədim nə deyib, nə danışdılar.
Nəinki bir adam, hətta külək də,
Nəfəs çəkəmmədi o ağ gərdəkdə.
Bəhram vəslə çatıb kamın alınca,
Vəziri, vəkili gəldi dalınca.
Fərəhi, nəşəsi artdı get-gedə,

Sevindi bu hala saray əhli də.
Xacəni özünün etdi vəziri,
O gündən tərk etdi xacə alveri.
Sonra hamılıqla oynaya-gülə,
Şəhərə yollandı bütün qafilə.

## BƏHRAMIN ÖLÜMÜ

Bəhram ki, qayıdıb gəldi qəsrinə,
Çəngə qulaq verib, cam aldı yenə.
Zəiflik büsbütün çıxdı canından,
Gülgün şərab içdi-ətri güləfşan.
Həftə yeddi gündü, qəsri də yeddi,
Həftənin hər günü bir qəsrə getdi.
Hansı rəngdə qəsrə gedirdi Bəhram,
Alırdı əlinə o rəngdə bir cam.
Hər gün bir gözəllə mey etsə də nuş,
Olurdu sevdiyi yarla həmağuş.
Onun çox olsa da məhbubələri,
Onunçün əzizdi ancaq bir pəri.
Qəsrlər dəyişdi, rənglər dəyişdi,
Böyləcə ömrünün illəri keçdi.
Neçə il ömürdən-gündən kam aldı,
Sağlıq sədaları ərşə ucaldı.
Çatdı o saat ki, çərxi-kəcrəftar
Dedi: – "Buyur, bu, sən, bu-soyuq məzar!"
"Heyif Bəhram!" deyə gəl etmə heyrət,
Demə: "Fələk ona az verdi fürsət!"
Biri yüz qərinə olsa hökmdar,
Tutsa yüz qərinə taxtında qərar,
Qəsri olsa göyün yeddi günbəzi,
Çəksə keşiyini Bəhramın[1] özü,
Əvvəl-axır gərək əlvida etsin,

---

[1] *Bəhram* – Mars planetinin farsca adı. Qədim və Orta əsrlərdə müharibə hamisi kimi təsəvvür olunurdu.

Tərk edib hər şeyi, hər kəsi getsin,
Gözündə qalmadı Bəhramın kamı,
Əlindən düşmədi gülgün mey camı.
Hər günü bir rəngdə qəsrdə keçdi,
Hər gün bir qəsrdə gülgün mey içdi.
Hansı bir saraya düşdü güzarı,
Dilaram oldu ən yaxın dildarı.
Vəcdə gəldi onun xoş avazından,
Qəzəllər oxuyub çəng çalmasından.
Darıxanda qəsrin otaqlarında,
Dağıtdı qəmini gur şikarında.
Şikar zamanı da o pəriçöhrə
Oxudu şah üçün at sürə-sürə.
O idi şah üçün əziz, mehriban,
Onunçün mey süzüb, əldə cam tutan.
Məclisə yaraşıq onun üzüydü,
Ürəyə təsəlli onun özüydü.
Onsuz yoxdu şahın istirahəti,
Onunla keçirdi həm ibadəti.
Bir gün şah başladı yenə şikarı,
Dövrəyə alındı ov heyvanları.
Ulduzdan çox idi şikar heyvanı,
Yoxdu heç birinin qaçmaq imkanı.
Sayı bilinmirdi nə atlıların,
Nə atlı toruna düşmüş şikarın.
Əvvəl cərgə ilə gedən atlılar,
Sonra dairəvi xətt yaratdılar.
Saysaydın kiçilən dairələri,
Səflərin on beşdi, bil ki, qədəri.
Səflər yaxınlaşdı bu heyvanlara.
Üç ağaclıq bir yer qaldı onlara.
Yaralı gurlarla ov itlərinin
Səsindən batmışdı qulağı yerin.
Vurulan gurların axan al qanı,
Laləzar etmişdi bu düz-dünyanı.
Sel kimi axdıqca qanı gurların,
Çıxırdı ağzından canı gurların.

Dilini çıxarıb qaçan o gurlar
Qatillər əlində qalıblar naçar.
Oxlar, elə bil ki, doludur, dolu,
Gurların hər yandan kəsilib yolu.
Ovçular səf çəkib durub yan-yana,
Hər ovçu yüz guru bələyir qana.
Qana həris imiş orda hər nəfər,
Odur ki, qan rəngli paltar geyiblər.
O yerin qan olub daşı, torpağı,
Qanlını axırda qan tutur axı.
Bəhram ki, o yerdə məşğuldu ovla,
Axırdı ov qanı şırımla, novla,
Sən demə, qan gölü olan bu ovlaq,
Altdan lehmə imiş, üstdənsə torpaq.
Sən demə, bataqlıq olan bu yeri,
Örtübmüş toz-torpaq təbəqələri.
Günəşlə, yağışla bu toz qatları
Bitirib üstündə yaşıl otları.
Toz qatı altdakı gizli bataqlıq
Həmin yaşıllığa vermişdi sıxlıq.
Orda hər çiçəyin, hər otun zoğu
Ağac gövdəsindən yoğundu, yoğun.
Bir şey ki, kökündən ala qüvvəti,
Sağlam və düz olur onun qaməti.
Vurulan ovların axan qanları
Axır dörd tərəfdən mərkəzə sarı.
Qarışıb palçıqla qan bir-birinə,
Çıxdı ovçuların kəmər yerinə.
Yel yerişli atlar batası oldu,
Palçıq yatağında yatası oldu.
Günəş həmin yerə yaydı çən-duman,
Girdi buludlara utandığından.
Yağış sel-su olub basdı hər yanı,
Yenidən başladı Nuhun tufanı.
Gördülər, bir nicat yeri qalmamış.
Yer sudur, göydən də tökülür yağış.
Daşdan, kərpicdən də olsaydı torpaq,

Madam ki, üstündə düz yüz min qoçaq
At çapır, ayağı altda onların,
Olardı kərpiclə daş narın-narın.
Axan qan qarışıb o toz-torpağa,
Döndərərdi onu dərin batdağa.
Yağış elə yağdı-yapış, çıx göyə,
Döndərdi palçığı lığa, lehməyə.
Ovçular boş yerə bağırışdılar,
Ora yüyürdülər, bura qaçdılar,
Heç kəsə bir nicat yetmədi bundan,
Batıb həlak oldu düz yüz min insan.
Dilsiz heyvanları qırıb-çatanlar
Özləri qırğına oldu kiriftar.
Bəhram ki, səflərdən düzdü dairə,
Bu səflər ağırlıq etdilər yerə.
Torpaq tab etmədi, bir anda çökdü,
Yüz min atlını da qoynuna çəkdi.
Batıb həlak oldu o qanlı suda,
Qanına qərq olan ov da, ovçu da.
Onlar ki, bu yerə etdilər güzar,
Oldu onlar üçün şikargah-məzar.
Tələyə bir düşdü şir ilə ceyran,
İkisi bir yerdə köçdü dünyadan.
Bir yerdə oldular bataqlığa qərq,
Qalxdı ortalıqdan aradakı fərq.
Birisi aşkarda, birisi pünhan,
Bildi qurtuluşa qalmayıb imkan.
Əl-ələ, tən-tənə tutuşdu onlar,
Nicat ümidilə qucuşdu onlar.
Lakin sarılınca biri-birinə,
Bataqlıq onları çəkdi dərinə.
Şah gördü qərq oldu şikar ordusu,
Onların nə izi qaldı, nə tozu,
Ovçular qərq olan yarğanda birdən
Bəhram da qərq olub itdi nəzərdən.
Həzrət Süleymana qalmayan o taxt;
Qala bilərdimi Bəhrama? heç vaxt!

O tapdı özünə bataqlıqda gor,
Əbəs deyilməyib ona Bəhram Gur![1]
Dünya əjdahadır–acgöz əjdaha,
Həzm etdikcə bizi, gəlir iştaha,
Gözü doyan deyil beş–on nəfərlə,
Udur insanları o, nəsillərlə.
Çoxuna işgəncə verdi o, amma
Başqa divan tutdu şanlı Bəhrama.
Dünyaya sığmırdı onun ləşkəri,
Məğlub eləyirdi hey düşmənləri.
Meydan oxusa da sultana, şaha,
Onu da kamına çəkdi əjdaha.
Heç kəsin olmadı ondan xəbəri,
Dünyada qalmadı heç bir əsəri.
Dünya əjdahadır, dedim, əjdaha,
Əjdaha deyildir–bəladır, bəla.
İnsan əjdahadan çəksə də zərər,
O yatdığı yerdə var xəzinələr.
Dünyadan bir çöp də aparmır insan,
Bir nəfər qurtarmır canını ondan.
İnsan bu dünyaya gəldiyi andan,
Dünya aman vermir insana, aman!
Canını almaqla qəlbi soyumaz,
Məzara salmaqla qəlbi soyumaz.
Cismini torpağa çevirər onun,
Tozunu göylərə sovurar onun,
İnsanın kamınca olsa da həyat,
Ölum də gözləyir hər gün, hər saat.
Həyatdan köçünü çəkəndə insan,
Çox yox, kifayətdir cəmi bircə an...
Nəvai, dünyaya yoxdur etibar,
Var olmaq eşqindən kənar ol, kənar!

---

[1] *Gur* – farsca həm qəbrə, həm də ceyran nəslindən olan bir heyvana deyilir.

## TARİXİ VƏ ƏFSANƏVİ ADLAR

*Babil* – Qədim Babilistanın (Vaviloniya) paytaxtı idi. Yeni eradan əvvəl böyük abad şəhərlərdən sayılırdı. Əfsanədə sehrlə əlaqədar olduğundan ədəbiyyatda sehr məkanı rəmzi kimi işlənilir.

*Barbüd* – Nizaminin “Xosrov və Şirin” əsərində Xosrovun sazəndə və xanəndəsi. Ədəbiyyatda mahir musiqişünas rəmzi kimi işlənilir.

*Bədəxşan* – ləli ilə məşhur şəhər adıdır.

*Bəhram* – 1) Mərrix, Mars ulduzu; müharibə ilahəsi. 2) Nizaminin “Yeddi gözəl”, Nəvainin “Yeddi ulduz” adlı əsərinin qəhrəmanı Bəhram Gur, Şərq ədəbiyyatında qəhrəmanlıq, qoçaqlıq rəmzi kimi işlənilir.

*Bilqeyis* – Dini əfsanələrdə Süleymanın məşuqəsi.

*Birceys* – Müştəri ulduzu.

*Boqrat* (Hippoqrat) – Eramızdan əvvəl V əsrdə yaşamış məşhur yunan təbibidir. Tibb elminin banisi hesab olunur. Əsərlərindən bəziləri şərq dillərinə tərcümə olunmuşdur.

*Büzürgümmid* – Nizaminin “Xosrov və Şirin” əsərində Xosrovun müəlliminin adıdır. Nizami onu bir alim-filosof, Nəvai isə hiyləgər vəzir kimi göstərir.

*Cami Əbdürrəhman* – XV əsrdə yaşamış məşhur İran şairidir. 1414-cü ildə Xorasanın Cam qəsəbəsində doğulmuşdur. Təhsilini Herat və Səmərqənd şəhərlərində alıb, böyük bir alim-şair kimi şöhrətlənmişdir. O, Əlişir Nəvainin yaxın dostu olmuş və onun tərəfindən maddi-mənəvi yardımlar almışdır. Nəvai onu bütün əsərlərində ustad kimi hörmətlə xatırlayır. Caminin divanı, elmi əsərləri və “Xəmsə” müqabilində yazdığı “Həft-övrəng” əsəri məşhurdur. “Həft-övrəng”ə, “Silsilətüz-zəhəb”, “Töhfətül-əhrar”, “Söbhətül-əbrar”, “Leyli və Məcnun”, “Yusif və Züleyxa”, “Salaman və əbsal” və “Xirzdnameyi-İskəndəri” adlı poemalar daxildir.

*Cədi* – Oğlağ bürcü.

*Cəmşid* – Cəmşidi-Cəm və Cəm adları ilə də məşhurdur. Qədim İran rəvayətlərində şərabı icad edən hökmdar kimi göstərilir. Odur ki, Cami-Cəm sehrli cam olaraq tilsim kimi işlənilir.

*Çubin, Bəhram* – Sasanilərdən Hörmüzün sərdarı. Sonra padşahlığı əlinə alıb Xosoov Pərviz tərəfindən məğlub edilmişdir.

*Əbcəd* – Ərəb əlifbasının düzülüş sistemi.

*Əflatun* (Platon) – Məşhur Yunan filosofudur. Eramızdan əvvəl 427–347-ci illərdə yaşamışdır. Obyektiv idealizm fəlsəfə sisteminin yaradıcısıdır. Şərqdə bilik, hikmət rəmzi olaraq işlənilir.

*Əhrimən* – Zərdüşt dini etiqadında şər allahı Xeyr allahı Hörmüzd ilə daima mübarizə aparan Əhrimən qaranlıq, xəstəlik və sair şər qüvvələrin yaradıcısıdır.

*Ərəstun* (Aristotel) – Eramızdan əvvəl 384–322-ci illərdə yaşamış məşhur yunan filosofudur. Dahi alim, ensiklopedist, təbiətşünas və məntiqin yaradıcısıdır. O, idealizm ilə materializm arasında tərəddüd edir. “Metafizika”, “Etika”, “Siyasət”, “Fizika” və s. əsərləri məşhurdur. Şərqdə Ərəstun adı hikmət rəmzi olaraq işlənilir.

*Əsəd bürcü* – Şir bürcü.

*Əşrəf* – XV əsrdə yaşamış məşhur Azərbaycan şairidir. Marağa şəhərində doğulub, 1460-cı ildə Təbrizdə ölmüşdür. “Ənvailüşşəbab”, “Xeyril-ümür”, “Baqiyatüs-salihat” və “Mücəddidatül-təcəlliyat” adlı dörd divanı var. Nizami mövzularında

“Minhəcül əbrar”, “Şirin və Xosrov”, “Leyli və Məcnun”, “Həft övrəng” və “Zəfərnamə” adlı poemalar yazıb “Xəmsə” yaratmışdır. Əlişir Nəvai “Məcalisün-nəfais” adlı təzkirəsində də Əşrəfdən bəhs edir.

*Fridun, Əfridun* – İran eposu qəhrəmanlarındandır. Dəmirçi Gavənin Zöhhaka qarşı üsyanından sonra taxta çıxmışdır.

*Gənci-Badavər* – Yel gətirmiş xəzinə deməkdir. Nizaminin “Xosrov və Şirin” əsərində Xosrovun dəryadan külək gətirən zəngin bir xəzinəyə sahib olduğu göstərilir.

*“Heyrətül-Əbrar”* – Nəvai “Xəmsə”sində ilk poemanın adıdır. Nizaminin “Məxzənül-Əsrar” əsəri şəklində yazılmışdır.

*Həvva* – Dini əfsanələrdə ilk insan olan Adəmin arvadıdır.

*Hörmüz* – 1) Nizaminin “Xosrov və Şirin” əsərində Xosrov Pərvizin atası. 2) Zərdüşt etiqadına görə xeyir allahı.

*Hut bürcü* – Balıq bürcü.

*Xəlil, İbrahim* – Dini rəvayətdə yəhudilərin peyğəmbəridir. Bütpərəstlik əleyhinə təbliğat apardığı və bütxanədəki bütləri qırdığı üçün Babil hökmdarı Nəmrüd tərəfindən oda atılmışsa da od onu yandırmayıb gülüstana çevirmişdir. Şərq ədəbiyyatında bu rəvayətlə əlaqədar olaraq Xəlil və İbrahim adları müxtəlif rəmz kimi işlənilir.

*Xızr* – Dini əfsanəyə görə peyğəmbərdir. Zülmata gedib İsgəndərin axtardığı dirilik suyundan içdiyindən, həmişə diri qaldığı söylənilir. Şərq ədəbiyyatında əbədilik və nicat rəmzi kimi işlənilir.

*Xosrov Dəhləvi, Əmir Xosrov* – XIII əsrdə yaşamış məşhur hind şairidir. Nizamidən sonra Nizami mövzularında ilk “Xəmsə” yaradan şairdir. “Xosrov və Şirin” mövzusunda “Şirin və Xosrov” əsəri yazdığından Nəvai Nizamidən sonra onu xatırlayır.

*Xosrov Pərviz* – Sasanilər sülaləsinin 22-ci hökmdarıdır. Nizaminin “Xosrov və Şirin” əsərinin qəhrəmanı. Xosrov adı Şərq ədəbiyyatında şah mənasında da işlənilir.

*İrəm bağı* – Behişt mənasındadır. Dini əfsanədə Hut adlı peyğəmbərin dövründə Ad adlı bir padşahın düzəltdiyi gözəl bir bağın adıdır. Guya bu bağ göyə çəkilmişdir. Şərq ədəbiyyatında gözəl bağ mənasında işlənilir.

*İsa* – Xristian dininin müəssisi.

*İskəndər* (Makedoniyalı Aleksandr) – Eramızdan əvvəl 356–323-cü illərdə yaşamışdır. Makedoniya padşahı II Filippin oğludur. Antik dünyanın məşhur istilaçılarından olan İskəndər eramızdan 336 il əvvəl padşahlıq taxtına oturmuşdur. Bir sıra hərbi səfərlər təşkil etmişdir. İran imperiyasını dağıtdıqdan sonra bir sıra ölkələri istila etmişdir. İskəndər haqqında Şərq xalqları folklorunda zəngin rəvayətlər vardır. Nizaminin “İskəndərnamə” adlı böyük əsərlərinin qəhrəmanıdır.

*İsrafil* – Dini rəvayətdə qiyamət günü ölüləri diriltmək üçün sur çalacaq mələyin adıdır. Suri-İsrafil ədəbiyyatda, xəbərdarlıq, ayıltmaq rəmzidir.

*Kəsra* – Sasanilər sülaləsindən Nuşirəvana və ondan sonra gələn nəslinə verilən ləqəb.

*Kəyan, Key* – Qədim İran padşahlarından Kayaniyan sülaləsinin ləqəbidir (Keyqubad, Keyxosrov və s.).

*Kuhkən* – Dağçapan deməkdir. Fərhadın ləqəbidir.

*Qaf dağı* – Qafqaz sıra dağları. Bəzilərinə görə bütün dünyanı əhatə edən əfsanəvi dağ.

*Qarun* – Dini əfsanələrdə mal və dövləti, eyni zamanda xəsisliyi ilə məşhur bir şəxsiyyət. Bu rəvayətlərdə Musanın müasiri və düşməni olduğu, onun bədduasına

görə dövləti ilə bərabər yerə batdığı göstərilir. Şərq ədəbiyyatında zənginlik və xəsislik rəmzidir.

*Leyli* – Nizami Gəncəvinin və onun mövzularında yazan şairlərin “Leyli və Məcnun” əsərləri qəhrəmanı, Şərq ədəbiyyatında gözəl, sadiq və vəfalı məşuqə rəmzi kimi işlənilir.

*Məcnun* – Nizami Gəncəvinin və onun mövzularında yazan şairlərin “Leyli və Məcnun” əsərləri qəhrəmanı. Şərq ədəbiyyatında sadiq, vəfalı və dəlicəsinə sevən aşiq rəmzi kimi də işlənilir.

*Mədain* – İraqda Bağdadın 26 kilometr cənub-şərqində və Dəclə çayının iki sahilində qədim bir şəhər olmuşdur. Vaxtilə Sasanilərin paytaxtı idi. İndi xərabələri qalmışdır.

*Mərrix* – Mars ulduzu.

*Məryəm* – 1) Nizami Gəncəvinin “Xosrov və Şirin” əsərində Xosrov Pərvizin ilk qadını və Şiruyənin anasıdır. 2) İsanın anası.

*Müştəri* – Ulduz adıdır.

*Nahid* – Zöhrə ulduzu.

*Nizami, İlyas Yusif oğlu Gəncəvi* – dahi Azərbaycan şair və mütəfəkkiri. İlk “Xəmsə” müəllifi.

*Nuh* – Dini əfsanələrdə göstərilir ki, peyğəmbər olduğu zaman xalq yoldan azmışdı. Buna görə allah xalqa bəla göndərmiş, Nuh gəmi qayırıb hər heyvandan bir cüt götürmüşdü. Qırx gün – qırx gecə yağan yağışdan yer üzünü su almış, Nuhun ailəsi gəmidə salamat qalmışdır. Gəmi Ağrı dağında dayanmış, insanlar təkrar Nuhun nəslindən törəmişlər. Özü də min ilə yaxın yaşamışdır. Şərq ədəbiyyatında Nuh gəmisi nicat rəmzi, Nuh ömrü uzun ömür mənasında işlənilir.

*Pərviz* – Xosrovun ləqəbidir.

*Ruyin-tən* – “Şahnamə” qəhrəmanlarından İsfəndiyarın ləqəbidir. Guya bədəninə ox və qılınc kar etməz imiş.

*Rüstəm, Rüstəmi-Zal* – Əfsanəvi İran pəhləvanı, Firdovsinin “Şahnamə” əsərində Rüstəmin qəhrəmanlıqlarından danışılır. Şərq ədəbiyyatında Rüstəm adı qəhrəmanlıq rəmzi olaraq işlənilir.

*Səməndər* – Odda yaşayan əfsanəvi bir quş.

*Səyavuş* – Firdovsinin “Şahnamə” əsərində qədim İran şahlarından Keykavusun oğludur. Atasından acıq edib Turana dayısı Əfrasiyabın yanına gedib onun qızı Firəngiz ilə evlənmişdir. Sonra Əfrasiyab tərəfindən öldürülmüşdür.

*Sina* (Turi-Sina) – Sina dağı; guya Musanın Allah ilə danışdığı dağ.

*Sokrat* – Məşhur yunan filosofudur. Eramızdan əvvəl 470–399-cu illərdə yaşamışdır. Dövlətdə qəbul edilmiş dini inkar etməkdə müttəhim edilib bir kasa zəhər içməyə məhkum olunmuş, bununla da ölmüşdür.

*Süha* – Ulduz adıdır.

*Süleyman* – Dini rəvayətlərdə peyğəmbər və bütün dünyaya hökm edən padşah kimi göstərilir. Bu rəvayətlərdə onun bütün heyvanların, quşların və balıqların dilini bildiyi, onlara hökm etdiyi söylənilir. Yel onun ixtiyarında olub, istədiyi yerə hava ilə getməsi, möhrü (üzüyü) ilə divlərə, pərilərə hakim olması haqqında rəvayətlər çoxdur. Eyni zamanda onun Bilqeyis adlı bir qadın hökmdarla münaşiqəsindən çox bəhs olunur. Süleyman adı və Süleyman möhrü Şərq ədəbiyyatında qüdrət rəmzi kimi işlənilir. Nəvai Fərhadın vəhşi heyvanlarla üns tutmasına işarə edib onu Süleymana, Şirini Bilqeyisə bənzədir.

*Sürəyya* – Ulduz adıdır.

*Şapur* – Nizaminin "Xosrov və Şirin" əsərində Xosrova Şirin haqqında danışan onun yaxın nədimi və Fərhadın dostu kimi göstərilən rəssam surətidir. Nəvai bu surəti Fərhadın yaxın dostu və Xosrovun düşməni kimi vermişdir.

*Şəbdiz* – Nizaminin "Xosrov və Şirin" əsərində Şirinin məşhur atı. Ədəbiyyatda cəldlik, sürət rəmzi kimi işlənilir.

*Şəkər* – Nizaminin "Xosrov və Şirin" əsərində Məryəm öldükdən sonra Xosrovun evləndiyi gözəl bir qadın. Ədəbiyyatda gözəl qadın rəmzidir.

*Təhmurəs* – İranın əfsanəvi hökmdarlarından Pişdadiyan sülaləsinin üçüncü hökmdarı.

*Təraz* – Qədim Türkistanda gözəlləri ilə məşhur bir şəhər.

*Tuba* – Dini rəvayətə görə cənnətdə bir ağacdır. Şərq ədəbiyyatında gözəl qamət rəmzi kimi işlənilir.

*Uluğbəy* – XV əsrdə yaşamış məşhur özbək alimidir. Teymurun nəvəsidir. Atası Şahrux dövründə Səmərqənd hökmdarı 1446-cı ildən bütün ölkənin şahı olmuşdur. 1450-ci ildə öz oğlu tərəfindən məğlub edilib, öldürülmüşdür. Uluğbəy dövrünün ən məşhur alimi, münəccimidir. Səmərqənd şəhərində tikdirdiyi rəsədxana və mədrəsə bu gün də durur. Nücuma dair yazdığı "Zeyci-Gürgani", yaxud "Zeyci-Uluğbəy" adlı əsəri məşhurdur.

*Utarid* – Ulduz adıdır. Şərq ədəbiyyatında göylərin katibi və qələm rəmzi kimi işlənilir.

*Yəmən* – Ərəbistan yarımadasının bir vilayətidir. Süha adlı ulduzun burada parlaq görsənməsi üçün Yəmən adı bu ulduzla əlaqədar işlənilir.

*Yusif* – Əfsanəyə görə Yaqub peyğəmbərin oğludur. Atası Yusifi oğlanlarından çox istədiyi üçün qardaşları paxıllıq edib onu quyuya atmış, tacirlər tərəfindən xilas edilən Yusif Misirdə qul adına satılmışdır. Onu satın alan Misir valisinin evində arvadı Züleyxa Yusifə vurulub, ona böhtan atmış, Yusifi zindana saldırmışdır, xilas olduqdan sonra, Züleyxa ilə evlənmişdir. Firdovsi, Cami və sair şairlər bu mövzuda "Yusif və Züleyxa" adlı poemalar yazmışlar. Şərq ədəbiyyatında Yusif adı gözəllik rəmzi kimi işlənilir.

*Zeyci-Gürgani* – Məşhur özbək alimi Uluğbəyin nüçuma dair yazdığı elmi əsərin adıdır. Bu əsər "Zeyci Uluğbəy" də adlanır.

*Zərdüşt* (zoruastr, zaratuştr) – Məşhur Azərbaycan mütəfəkkiri, Atəşpərəstlərin peyğəmbəri, zərdüştiliyin banisi. Zərdüştün Muğanda, yaxud Urmiyada doğulduğu söylənilir. "Avesta" adlı əsərin müəllifidir.

*Zöhhak* – Qədim İran əfsanəsində Pişdadiyan sülaləsinin beşinci hökmdarı sayılır. Guya çiyinlərində iki ilan varmış, gündə iki nəfər rəiyyət uşağını öldürüb beynini bu ilanlara yedirdərmiş. Nəhayət, Gavə adlı bir dəmirçinin başçılığı ilə xalq üsyan qaldırıb onu taxtdan salmış, Cəmşid nəslindən olan Fridunu şah seçmişlər. Şərq ədəbiyyatında Zöhhak adı zülm, ədalətsizlik rəmzi kimi işlənilir.

*Zühəl* – Ulduz adıdır.

*Zülfüqar* – Əlinin qılıncı, ədəbiyyatda kəskinlik rəmzi.

## LÜĞƏT

*Abi-həyat* – dirilik suyu
*Abi-kövsər* – əfsanəyə görə behiştdə bir çay
*Afaq* – üfüqlər
*Afət* – bəla, gözəl mənasında da işlənilir
*Aşiyan* – yuva
*Aşüftə* – məftun, vurğun
*Atəşkədə* – atəşpərəstlərin məbədi
*Ayin* – rəsm, adət
*Baqi* – həmişəlik
*Barigah* – qəsr, saray
*Beyət* – itaət etmək
*Bədgöhər* – nanəcib
*Bəhr* – dəniz; şeirdə vəzn ölçüsü
*Bəlakəş* – bəla çəkən
*Bəndə* – qul
*Bünyad* – bünövrə
*Büryan* – qızarmaq, yanmaq
*Çin* – doğru
*Dam* – tor, tələ
*Deyr* – kəlisa
*Dəhan* – ağız
*Dəmadəm* – həmişə, müttəsil
*Dəstgir* – əl tutan
*Dilavər* – qəhrəman
*Divan* – bir şairin lirik şeirlər məcmuəsi
*Dürc* – sandıqça
*Əbədiyyət* – həmişəlik
*Ədəm* – yoxluq
*Əfsər* – cığa
*Ələm* – dərd, qüssə
*Ənbərfəşan* – ənbərsaçan
*Əşar* – şeirlər
*Əyan* – aşkar
*Əzimət* – getmək
*Fəraq* – ayrılıq
*Fərtut* – əldən düşmüş qoca
*Fidan* – körpə ağac
*Firəng* – Avropa
*Fitva* – şəriət üzrə əmr
*Giriftar* – tutulmuş
*Hatif* – qeybdən səslənən, qeybdən gələn səs
*Həqir* – xar, etibarsız
*Həmrah* – yol yoldaşı
*Həsən* – gözəl
*Hicran* – ayrılıq
*Hidayət* – düz yola çağırmaq
*Hilal* – uç günlük ay, yaxud gözəlin qaşı

*Hüma* – dövlət quşu
*Xaqan* – türk xalqlarıda hökmdar
*Xarə* – çaxmaq daşı
*Xarü xas* – çör-çöp
*Xəffaş* – gecə quşu, yarasa
*Xəndan* – gülən
*Xunriz* – qantökən
*Xuraman* – nazla yerimək
*Xürrəm* – şad
*İcabət* – yerinə yetmək
*İxtiyar* – qoca
*İnayət* – lütf, ehsan
*İnziva* – guşə, təkliyə çəkilmək
*İrəm* – cənnət bağı
*Kafur* – təbabətdə işlənən ağ rəngli maddə, şeirdə ağlıq rəmzi
*Kan* – mədən
*Kərəm* – səxavət
*Küstax* – arsız, təkəbbür
*Qaqüm* – yumşaq dərili bir heyvanın dərisi
*Qeysər* – sezar kəlməsinin ərəbləşmiş şəkli; Rum hökmdarı mənasında işlədilir
*Qəqnus* – Şərq əfsanələrinə görə Hindistanda yaşayan və gözəl oxuyan bir quş
*Qəsəm* – and
*Qubar* – toz; kədər, qüssə
*Ləli-bədzəşan* – qırmızı ləl
*Lisan* – dil
*Mehr* – günəş
*Məhən* – möhnətlər; əziyyətlər
*Məxzən* – xəzinə
*Məlamət* – məzəmmət
*Məşşatə* – üz bəzəyən qadın
*Mövç* – dalğa
*Müdəvvər* – yumru, dairəvi
*Müjgan* – kirpik
*Mülk-ara* – ölkə bəzəyən
*Müzəyyən* – zinətli, bəzəkli
*Müztərib* – iztirablı
*Naxoş* – xoş olmayan
*Nalan* – nalə edən
*Namə* – məktub
*Nayab* – görünməz, tapılmayan
*Nədamət* – peşmanlıq
*Nəhan* – gizli
*Nəşat* – sevinc
*Nigahban* – baxıçı, gözətçi
*Peyapey* – arası kəsilmədən
*Peykan* – ox
*Pəjmürdə* – dağınıq, kədərli
*Pərvaz etmək* – uçmaq
*Rehlət* – köçmək

*Rəfiq* – yoldaş
*Rəşk* – qısqanmaq
*Rəviş* – gediş
*Rövşən* – işıqlı
*Rza vermək* – razı olmaq
*Saban* – itə baxan
*Sabit* – bir yerdə duran; qədim nücuma görə, hərəkət etməyən ulduz
*Sayə* – kölgə
*Sədparə* – yüz parça
*Səndəl* – şabalıd rəngdə iyli bir ağac
*Səpəndan* – üzərlik yandırılan qab
*Sərkəş* – baş aparan
*Sərzəniş* – qaxınç
*Səyyarə* – səyyar ulduz
*Simin bədən* – gümüş bədənli; gözəl
*Sitarə* – ulduz
*Siyah* – qara
*Şeyda* – vurğun
*Şəbçırağ* – gecələr çırağ kimi yanan bir maddə
*Şəbistan* – gecəlik; yataq otağı
*Şərarət* – şər işlər görmək
*Şum* – uğursuz
*Tab* – qıvrım; işıq; dayanmaq
*Təhdid* – hədələmək
*Təhəmmül* – dözmək
*Təhr* – nəqşə, plan
*Təqrir etmk* – söyləmək
*Təravət* – təzəlik, gözəllik
*Təriq* – yol
*Tişə* – külüng
*Tuş* – yuxu
*Ud* – Hindistanda bitən bir ağacdır ki, yandıqca xoş iy verir; çalğı aləti
*Ümman* – böyük dəniz, dərya
*Ünqa* – Simurğ quşu
*Üstürlab* – ulduzların hərəkətlərini öyrənmək üçün Şərq münəccimlərinin işlətdikləri alət
*Üzar* – yanaq
*Vahid* – tək
*Vaqif* – xəbərdar
*Vəhm* – təsəvvür; düşüncə qorxu
*Vəsf* – tərif
*Zəban* – dil
*Zəbanə* – alov
*Zəbanə gəlmək* – dilə gəlmək
*Zəbun* – zəif, qüvvəsiz, aciz
*Zəxm* – yara.

## KİTABIN İÇİNDƏKİLƏR

